## PROSESƏ TƏYİNATIMA GƏTİRƏN YOL VƏ CİNAYƏT İŞİ İLƏ TANIŞLIĞIM

Əziz oxucum!

Azərbaycan üçün taleyüklü məsələ saydığım Sumqayıt hadisələri, prokuror qismində çıxış etdiyim proses, həmin prosesdə gördüklərim və bütün bu hadisələrlə əlaqədar, hələ 1989-cu ildə gəldiyim nəticə və onun davamı barədə danışmazdan əvvəl, özüm haqda qısaca məlumat vermək istərdim. Çünki oxucular bilməlidirlər ki, mən bu prosesə təsadüfən düşməmişəm və hadisə haqda qənaətlərim, mövqeyim də təsadüfi deyil.

Beləliklə, 1983-cü ildə mən Kuban Dövlət Universitetinin hüquq fakültəsini fərqlənmə diplomu ilə bitirdikdən sonra təyinatla Stavropol diyarı Neftekumsk rayon məhkəməsinə stajçı göndərildim. Stajçı vəzifəsində çalışarkən, məhkəmənin sədri, əvvəllər Altay diyar məhkəməsinin sədri işləmiş, çox savadlı şəxs kimi tanınan Krasnopyorov az müddət sonra məni özünə köməkçi götürdü. O vaxtkı qanunvericilik hakimdən savayı, məhkəmədə iki xalq iclasçısının da hakim qismində iştirakına imkan verirdi. Krasnopyorov rayon rəhbərliyi ilə danışdıqdan sonra, məni rayonda xalq iclasçısı seçdilər və hakim vəzifəsini icra etməyi həvalə etdilər. Bir müddət orada çalışdıqdan sonra 1984-cü ilin aprel ayından Stavropol diyarının Andropovsk rayon xalq məhkəməsində hakim vəzifəsinə keçirildim. Andropovsk rayon məhkəməsinin sədri Aleksandr İvanoviç Kuzminov idi. Həmin dövr bizim Kuzminovla sırf işgüzar münasibətimiz vardı. Bir qədər sonra çalışqan işçi olduğumu görən Kuzminov məhkəmə təcrübəsinin ümumiləşdirilməsi kimi işlərini mənə həvalə etməyə başladı. Bir sözlə, Kuzminovun mənə çox müsbət münasibəti yarandı. Bir gün o, təcili olaraq yaxınlıqda yerləşən Pyatiqorsk şəhərinə getməli olduğunu, günortaya isə Puşkarskaya soyadlı bir qadının işə bərpa ilə bağlı iddiasına dair məhkəmə prosesinin olacağını dedi. Bu səbəbdən məndən həmin prosesə onun yerinə çıxmağımı və iddianı rədd etməyimi xahiş etdi. İlk dəfə idi ki, Kuzminov məndən hər hansı bir qərarı qəbul etməyimi xahiş edirdi. Ona dərhal "yox" demədim, işə baxıb qərar qəbul edəcəyimi bildirdim. Bu zaman o, tərəddüdümü hiss edib dedi: "Sən işə bax, əgər işə bərpa olunmasına dair qərar qəbul etmək istəsən o zaman işi saxla, mən səhəri gün gəlib özüm baxaram." Daha sonra əlavə etdi ki, bu çox vacib işdir, çünki işi ona rayonun birinci katibi Boris Biryukov tapşırıb.

Xatırladım ki, Biryukov həmin dövrdə 40 ildən artıq katib işləmiş, olduqca əzazil bir insan kimi tanınırdı. Günorta saat 3-də prosesi başladım. İşin mahiyyəti ondan ibarət idi ki, həmin Puşkarskaya rayon istehlak birliyində ("Raypo"da) işləyirdi. İxtisasca iqtisadçı idi. Rayon istehlak

birliyinin sədri milliyyətcə yunan, Biryukovun çox yaxın dostu olan Qrin adlı şəxs idi. Qrin "Raypo"da belə bir mexanizm qurubmuş: uzaq məsafədən gətirilən müəyyən miqdarda malın bir hissəsini ya tam, ya da qismən istifadəyə yararsız kimi qeydiyyata aldırırdı. Çünki bilirdilər ki, məsələn, Sibirdən gəlib həmin malın həqiqətən yararsız olub - olmamasını heç kim yoxlamayacaq. Yararsız kimi qeydiyyata aldırdıqları malı isə daha sonra qeyri-qanuni şəkildə satırdılar. Məhz bu qanunsuz əməliyyatı həyata keçirməyi iddiaçı Puşkarskayaya tapşırırlar, Puşkarskaya isə bundan imtina edir. Bu səbəbdən həmin qadını işdən qovurlar. Puşkarskaya da öz növbəsində işə bərpa olunmaq üçün məhkəməyə müraciət edir. Prosesdə mən həmin qadının rus soyadını daşıdığını, ancaq rus milliyyətindən olmadığını gördüm. Milliyyətcə qaraçay olan həmin qadın məhkəməyə izahatında bildirdi ki, rusla ailə qurduğuna görə, valideynləri ondan imtina edib. Daha sonra onun üç övladı dünyaya gəlib və həyat yoldaşı onu övladları ilə atıb gedib. Yəni, bu iş həmin qadına övladlarını dolandırmaq üçün çox vacib idi, onun işdən qovulması da tamamilə qeyri-qanuni idi. Mən çətin vəziyyətdə qalmışdım: çünki şəxsiyyətinə hörmət bəslədiyim və mənə çox müsbət münasibəti olan Kuzminovun dediyini edə bilməzdim; prosesi ertəsi günə təxirə salsaydım, Kuzminovun həmin qadının iddiasını rədd edəcəyini də dəqiq bilirdim. Bu zaman mən həmin qadının iddiasını təmin edib onun işə bərpa olunması haqqında qərar çıxardım.

Axşam, təxminən, saat 21 radələrində Kuzminov evimə gəldi və çox pərt şəkildə dedi: "Axı mən səndən xahiş etmişdim, prosesi təxirə salmanı söyləmişdim". Sonra bir daha təkrarladı ki, bu, birbaşa birinci katibin göstərişidir və bu qərara görə Biryukovla onun çox ciddi problemləri olacaq. Mən Kuzminova qarşı düzgün davranmadığımı etiraf etdim və günahımı boynuma aldım, lakin bununla yanaşı, ona hansı səbəbdən bu cür qərar qəbul etdiyimi də anlatdım. Daha sonra isə Biryukovun qarşısında pis vəziyyətdə qalmaması üçün ondan hadisələri olduğu kimi birinci katibə danışmasını istədim.

Bir neçə gün keçdikdən sonra, Kuzminov mənə Puşkarskaya ilə bağlı məsələyə Rayon Partiya Komitəsinin büro iclasında baxılacağını bildirdi. Onda mənim 26 yaşım var idi və rayona yeni təyin olunduğum üçün hələ rəhbərlikdən çoxlarını tanımırdım. İclası Biryukov aparırdı. Toplantıda büronun mənə tanış olan üzvləri ilə yanaşı, tanış olmayanları, Diyar məhkəməsinin sədrinin müavini Fyodorova və digərləri də iştirak edirdi. Birinci katibin yanında isə tanımadığım yaşlı bir nəfər otururdu. Biryukov iclası başlayan kimi, Andropov rayon məhkəməsində bəzi qanunsuz hallara yol verildiyini söylədi. Daha sonra əlavə etdi ki, bu qanunsuzluqların əsas səbəbkarı rayona yeni təyin olunmuş, heç bir təcrübəsi olmayan, rayon

hüquq-mühafizə orqanlarının rəhbərlərinin dediyinə görə, "özündən həddən artıq razı Aslan İsmayılov"dur. Çıxışından sonra sözü polis rəisi, polkovnik Çernova verdi. Qeyd edim ki, Çernov əvvəllər Georgiyevsk şəhər polis idarəsinin rəisi işləmişdi, lakin işdə yol verdiyi nöqsanlara görə, kiçik rayona göndərilimişdir. Çernov da eyni qaydada, mənim "özündən razı", "heç kimi saymayan", "heç bir təcrübəsi olmayan birisi" olmağım barədə çıxış etdi. Çernovdan sonra söz rayon prokuroru Paninə verildi. Həmin vaxt Paninin də mənə qarşı şəxsi qərəzi vardı. Çünki onun məhkəməyə verilən, istintaqı tamamlanmamış bir neçə işini geri qaytarmışdım. Panin də bütün çıxışçıların söylədiklərini təkrarlayaraq, məni qanunsuzluqda ittiham etdi. Prokurorun çıxışına müdaxilə edərək, niyə məni qanunsuzluqda ittiham etdiyini soruşdum. Çünki mənim baxdığım həmin iş haqqında qəbul etdiyim qərar qüvvədə idi, ondan kassasiya şikayəti verilsə də, Diyar Məhkəməsində hələ baxılmamışdı. Yəni, qərarımın ləğv edilmədiyi bir vaxtda, onun məni qanunsuzluqda ittiham etməyə haqqı çatmırdı. Bunları dedikdə, iclasda iştirak edən Diyar Prokurorunun müavini Şerbakov dərhal yerindən qalxaraq, mənə kobud şəkildə "Ты кто такой в бутылку лезишь?" – dedi. Məni təhqir etdiyinə görə, etirazımı bildirdikdə isə, birinci katibin yanında oturan həmin yaşlı adam çıxıb bayırda gözləməyimi xahiş etdi. Çıxdım. Onların müzakirəsi, təxminən, bir saata yaxın sürdü. Daha sonra Kuzminov yanıma gəlib içəriyə çağırıldığımı söylədi. İçəridə tanımadığım yaşlı adam özünü təqdim edərək dedi ki, o, Stavropol Diyar Partiya Komitəsinin İkinci katibi Yeryomindir. Daha sonra, gözləmədiyim şəkildə Yeryomin mənə hər zaman prinsipiallığımı bu cür qorumağımı məsləhət bildi və hər hansı problemim olacağı təqdirdə ona müraciət etməyimi tövsiyə etdi.

1987-ci ildə SSRİ-də hakimlər seçkisi oldu. O zamankı qaydalara əsasən, hakim seçilmək üçün Rayon Partiya Komitəsinin birinci katibi təqdimat verməli idi. Təbii ki, Biryukov mənə təqdimat vermədi. Artıq özümə iş axtarmağa başlamışdım. Məhz bu zaman Kuzminov zəng edərək, bizi təcili olaraq Stavropola çağırdıqlarını söylədi. Biz Stavropol Diyar Ədliyyə Şöbəsinin rəisi Viktor Limanovun yanına gəldik. Limanovla Stavropol Diyar Partiya Komitəsinə getdik. Orada bizi Yeryomin qəbul etdi. İçəri daxil olan kimi, mənə qarşı haqsızlıq olunduğu halda, nə üçün ona müraciət etmədiyimi soruşdu. Mənə qarşı hələ heç bir haqsızlıq olunmadığını bildirdim, çünki seçkilərə hələ iki ay qalmışdı. Bu zaman o, mənim Zelençuk rayon məhkəməsinin sədri təyin olunmam barədə məsələ qaldırdığını söylədi. Açığı, ilk öncə bu təklifdən çəkindim. Çünki həmin məhkəmə Stavropolun ən böyük məhkəmələrindən biri sayılırdı: orada dörd hakim çalışırdı. Üstəlik, həmin məhkəmə bütün diyarda çox pis ad çıxarmışdı və mən bu cür böyük və çətin kollektivi idarə etməyin ağır olacağını düşünürdüm.

Zelençukda işlədiyim müddət mənim üçün həm maraqlı, həm də çətin bir dövr idi. Çünki həmin rayonda KP-nin birinci katibi Aleksey İvanoviç Fyodorov Qorbaçovun dostu sayılırdı. Andropovsk rayon KP-nin birinci katibi qədər kobud olsa da, ondan fərqli olaraq çox natəmiz insan idi. Qorbaçov-Fyodorov dostluğu isə Zelençukda, Arxız adlanan yerdə Qorbaçovun bağının yerləşməsi ilə bağlı idi. Bundan əlavə, Arxızda təkcə Qorbaçov deyil, bütün Siyasi Büro üzvləri istirahət edirdilər.

Zelençuk rayonunun polis rəisi o dövr SSRİ KP MK-nin Baş katibi vəzifəsini daşıyan Qorbaçovun himayə etdiyi və yerlisi, həmin dövr SSRİ Baş Nazirinin birinci müavini, həm də dövlət Aqrar Sənaye Kompleksinin sədri olan Muraxovskinin bacısı qızının həyat yoldaşı Sergey Aqeyev adlı, hüquqdan çox uzaq, amma arxasında kimlərin durduğunu çox gözəl bilən birisi idi. Prokuror isə əslən Yevlaxdan olan, Azərbaycan dilini təmiz bilən Viktor Petroviç Bratkov idi. Həmin rayonun bütün rəhbər vəzifələrini tutan şəxslər məndən yaşca çox böyük idilər. Sözün həqiqi mənasında, onların hamısının mənim yaşım qədər stajı vardı və bundan istifadə edərək, onlar həmişə mənə yuxarıdan aşağı baxmağa çalışırdılar. Mənimsə buna münasibətim sərt olurdu. Məhz rəhbərliklə münasibətimin pis olması səbəbindən işimə həddən artıq ciddi yanaşırdım, bilirdim ki, onlar hər an istənilən pisliyi edə bilərlər. Xüsusilə, Bratkovla münasibətlərim heç alınmamışdı, çünki o, bir çox işləri rüşvət alaraq yekunlaşdırıb məhkəməyə göndərirdi və istəyirdi ki, mən işi onun yekunlaşdırdığı kimi tamamlayım. Mənsə, istintaq tam aparılmadığına görə, işi əlavə istintaqa qaytarırdım. Bu səbəbdən bizim münasibətlərimiz tamamilə korlanmışdı. Bratkov haqqında təsəvvür olsun deyə, bircə faktı xatırladıram: rayon prokurorluğunun məhkəməyə göndərdiyi işlərlə bağlı apardığım ümumiləşdirmədə müəyyən olunmuşdu ki, Bratkovun apardığı işlərin qırx faizdən çoxu təkrar istintaqa qaytarılıb. Bu isə hər prokuror üçün ən arzuolunmaz haldır.

****

Bir müddət idi ki, Zelençukda işləyirdim. Bir gün mənə elan etdilər ki, məsələmə rayon Partiya Komitəsinin Bürosunda baxılacaq. Səbəb ilə maraqlandıqda, bildirdilər ki, müzakirə mənim təyin etdiyim cəzaların yüngüllüyü ilə bağlı olacaq. Mən Büro materialları ilə tanış olanda gördüm ki, həm Bratkov, həm də Aqeyev məktubla Birinci katib Fyodorova müraciət ediblər. Müraciətin məzmunu qısaca ondan ibarət idi ki, "biz cinayətkarları tuturuq, İsmayılov isə onları açıb buraxır." O dövrdə işləyən və yaşayanların çoxu bilir ki, SSRİ MK-nın və Nazirlər Kabinetinin dövlət əmlakını mənimsəyənlərə qarşı mübarizə ilə bağlı qərarı vardı. Məhkəməyə gələn işlərin əksəriyyəti də məhz elə dövlət əmlakını mənimsəyənlərə qarşı

mübarizə ilə bağlı olurdu.

Yaşadığım rayon dağlıq bölgə olduğundan orada qoyunçuluq inkişaf etmişdi. Orada işləyənlər əsasən çobanlar idi. Və onların arasından biri həmişə baş çoban olurdu. Qış aylarında heyvanlar soyuqdan və yaxud yem çatışmazlığından öldükdə, bu çobanların çoxunu işini düzgün icra etməyib hədsiz tələfata səbəb olduğuna görə, vəzifəli şəxs kimi həbs edirdilər. Həmin dövrdəki cinayət qanunvericiliyinə əsasən, səhlənkarlıq cinayətinə görə üç ilədək azadlıqdan məhrumetmə və yaxud iki ilə qədər islah işi cəzası nəzərdə tutulurdu. İslah işinin mahiyyəti isə, işlədiyi yerdə maaşından ayda 20% tutulmaqla dövlətin hesabına ödənilməsindən ibarət idi. Mən hesab edirdim ki, çobanı vəzifəli şəxs kimi həbs edib azadlıqdan məhrum etmək nə haqqa, nə hüquqa, nə də məntiqə sığır. Həmin çobanları vəzifəsində saxlayıb hər ay maaşının 20%-ni dövlət hesabına ödəməklə, onlara islah işləri cəzasını tətbiq edirdim. Büroda mənə qarşı irəli sürülən əsas ittiham da bundan ibarət idi. Məsələm Büronun iclasında müzakirə olunmağa başlayanda, Bratkov məruzə ilə çıxış etdi və rəqəmlərlə bildirdi ki, İsmayılov bizim həbs etdiyimiz filan qədər cinayətkara yüngül cəza təyin edərək həbsdən açıb buraxıb. Daha sonra isə vurğuladı ki, mənim həbsdən azad etdiyim şəxslər əsasən müsəlmanlardır. Orada işləyən çobanlar həqiqətən də qaraçay milliyətindən olan müsəlmanlar idi. Çünki bu, o qədər əzablı və spesifik iş idi ki, ruslara yad peşə olduğundan ruslar bu sahədə çalışmırdılar, dağlıq rayon olduğundan kəskin soyuqlar olurdu, çobanlar isə sürünü qorumaq üçün gecələr də yatmırdılar. Əgər bu ağır şəraitdə ruslar işləsəydi, o zaman sürünün hamısı elə soyuqdan məhv olardı.

Bratkovun ifadəsinə Aqeyev də dəstək verdi. Birinci katib də yerdən atdığı "Sən burada məhkəmə sədri işləyirsən ki, "maqometyaninlərin" cinayətini ört-basdır edəsən?"-replikası ilə, bir növ, onlara tərəf çıxdı. Bu, mənim üçün həqiqi mənada çox ağır ittiham idi. Çünki işlədiyim dövrdə, həqiqətən də müsəlman-xristian və yaxud rus-qaraçay kimi bir seçimim olmayıb. Və birinci katibə etirazımı bildirərək dedim: "Bratkovun da Aqeyevin də aqressivliyinin səbəbini başa düşürəm, lakin bizim çoxmillətli və çox dinli bir dövlətdə yaşadığımızı nəzərə alaraq, Bratkov və Aqeyev kimilərinin söylədikləri ağılsız ifadəyə sizin də dəstək verməyinizi anlamıram". Mənim Fyodorova bu cür sərt etirazım onun heç xoşuna gəlmədi, lakin dinlərarası və millətlərarası məsələ ortada olduğuna görə, o, içindəki qəzəbi boğdu. Daha sonra mənə sürülən ittihamlarla bağlı bəzi izahatlar verdim: "Bu çobanların hər birinin 7-8 uşağı var. Əgər mən bu çobanı tutub həbsə göndərsəm, həmin uşaqlar atasız qalacaqlar. Birinci növbədə, həmin uşaqları dövlət böyüdəcək, ikincisi, bu uşaqlar atasız böyüdüyünə görə, gələcəkdə onların cinayətkar ünsürə çevrilmək ehtimalı artacaq, üçüncüsü

isə, həmin çobanı da həbsdə dövlət təmin etməli olacaq. Mən isə bunlara yol vermirəm, həmin çobanı yenə ağır şəraitdə işləməyə məcbur edirəm, həm ailəsini saxlamağına şərait yaradıram, həm də hər ay maaşının 20%-ni dövlətin hesabına ödəməyini təmin edirəm". Bundan sonra rayonun ikinci katibi, Oveçkina soyadlı bir qadın söz alıb mənim partiyanın və dövlətin maraqlarından çıxış etdiyimi, belə olan təqdirdə, prokurorun mövqeyinin yanlış olduğunu bildirərək, mövqeyimi qəti şəkildə müdafiə etdi və nəticədə mənə nəzərdə tutulan heç bir cəza tətbiq edilmədi.

****

Yuxarıda da qeyd etdim ki, Zelençukda işlədiyim dövr çətin olduğu qədər də maraqlı idi. Siyasi Büro üzvlərinin bağlarının orada yerləşməsi ilə əlaqədar həmin rayonda çoxsaylı tanışlıqlarım oldu. Tanışlarımın, görüşdüyüm, birlikdə ova getdiyim insanların arasında bəzən çox yüksək vəzifə sahibləri, SSRİ rəhbərliyinə bilavasitə yaxın olan şəxslər də olurdu. Lakin müəyyən qisim insanlar da vardı ki, onlarla daha tez-tez görüşürdüm və münasibətlərimiz sıravi tanışlıqdan daha yüksəyə qalxmışdı. Həmin şəxslərdən mənə ən yaxın olanı həqiqi alim, tarix elmləri doktoru, professor Smirnov Boris Valentinoviç idi. Bu şəxs əvvəllər Stavropolda elm və təhsil şöbəsinin müdiri, sonra Kaliningrad vilayət partiya komitəsində katib, daha sonra isə yenidən Stavropolda vilayət komitəsində katib vəzifələrində işləmişdi. Və məhz Smirnov Qorbaçovun Stavropol şəhər komsomol komitəsinin katibi olmasında müstəsna rol oynamışdı, daha sonra isə Stavropol vilayət komsomol katibi vəzifəsinə irəli çəkmişdi. Həddindən artıq maraqlı insan idi, Qorbaçovu və onun yaxın ətrafını çox yaxşı tanıyırdı. Digər tanışlarım Stavropol Politexnik İnstitutunun rektoru, akademik Boris Sinelnikov və Tibb İnstitutunun rektoru, professor Boris Minayev idi. Hətta Smirnov zarafatla deyərdi ki, "sən, deyəsən, Borislərin hamısını özünə dost edirsən".

Bir haşiyə çıxım: məhz bu cür əlaqələrdən istifadə edərək, çoxlarına məlum olmasa da, mən 1994-cü ilin yanvar ayında Qarabağ müharibəsində ermənilər tərəfdən Azərbaycana qarşı vuruşan Rusiya kazaklarının geri çağırılmasında vasitəçi oldum. Bu epizod barəsində yazdıqlarımı Azərbaycanda rus icmasının sədri Zabelin yaxşı bilir. O zaman artıq mən Prezident Aparatında işləyirdim. Kazakların Qarabağ müharibəsində iştirakını eşitdikdə onların sıx yaşadığı və mənim də əvvəllər yaşayıb-işlədiyim Krasnodar və Stavropoldakı tanışlarıma zəng edərək, kazaklar tərəfindən bu cür münasibətin Azərbaycandakı rus icmasına çox pis təsir edəcəyini izah etdim. Fikrimi isə onunla əsaslandırdım ki, Azərbaycanda çoxlu sayda rus yaşayır, burada onların məktəbləri, kilsələri, mədəniyyət ocaqları var, onlara qarşı burada münasibət müsbətdir. Kazakların müharibədə iştirakı

isə bu münasibətləri sarsıda bilər. Eyni zamanda, Azərbaycanda ruslara olan münasibət və onlar üçün yaradılmış şəraiti Ermənistanda olan şəraitlə müqayisə edərək, ermənilərin monoetnik dövlət yaratdıqlarını, Ermənistanda, demək olar ki, rus qalmadığını, orada rus kilsələrinin olmadığını izah etdim. Bu zaman onlar təcili olaraq Rusiyaya gəlməmi söylədilər və məni Rusiyada yaşayan kazakların aparıcı atamanı ilə görüşdürəcəklərini bildirdilər. Mən Prezident Aparatının o zamankı dövlət müşavirləri Hidayət Orucov və Nurəddin Sadıqovla görüşüb məsələni onlara izah etdim və onlardan sadəcə olaraq, bizim Rusiyaya getməyimiz üçün maliyyə dəstəyi göstərmələrini xahiş etdim. Onlar yalnız təyyarə biletini almağa köməklik etdilər. Daha sonra mən şəxsi hesabıma məzuniyyət götürərək, Bakıdakı rus kilsəsinin keşişi Sergey ata və rus icmasının sədr müavini Lyubov Morozova ilə birlikdə, birbaşa təhsil aldığım Krasnodar şəhərinə getdim. Orada şəxsən tanıdığım, oxuduğum vaxt hüquq fakültəsinin dekanı işləyən, mənimlə çox yaxşı münasibətdə olan Vasili Qromovun qardaşı, Ümumkuban kazak qoşunlarının atamanı Vladimir Qromovla, daha sonra onun vasitəsilə Rostovda Ümumrusiya və xaricdə yaşayan kazakların atamanı Reutinlə, Don kazaklarının atamanı Kozıtsinlə görüşdüm. Bundan sonra Stavropola gələrək, Stavropol kazak qoşunlarının atamanı Tokaryevlə görüşdüm. Görüşlərin hamısında həm mən, həm də mənimlə gedən rus icmasının iki nəfər nümayəndəsi atamanlara real vəziyyəti izah edirdik. Həmçinin, görüşlər keçirilən zaman yerli qəzetlərdə davamlı olaraq ermənilərin törətdikləri cinayətlər barədə məqalələr dərc olunurdu. Məhz keçirdiyim görüşlərin nəticəsi olaraq, rus kazaklarının atamanları müraciət qəbul edərək, Ermənistandakı kazakları müharibədən geri çəkdilər.

****

1988-ci ilin fevral ayında Sumqayıtda məlum hadisələr baş vermişdi. Azərbaycanlılar bütün dünyaya vəhşi bir millət kimi təqdim olunmuşdu. Bütün mətbu orqanlarda yayımlanan məlumatlar mənə ancaq utanc hissi verirdi. Tanıdığım hər kəs mənə bir təəccüb, peşmançılıq dolu gözlərlə baxırdı. Hətta bir gün o dövr Diyar Ədliyyə Şöbəsinin müdiri işləyən Viktor Limanov heyrətlə soruşdu: “Aslan, Sumqayıtda nə baş verib elə?! Mən heç təsəvvür belə etməzdim ki, bir millət bu cür vəhşilik edə bilər”. Mənim üzümdəki təəccübü gördükdə isə davam etdi: “Xəbərin yoxdur, Sumqayıtda azərbaycanlılar ermənilərin başını kəsib top oynayıblar, hamilə qadınların qarınlarını yarıb uşaqlarını çıxardıblar”... Mən etiraz edə bilmədim... Çünki həqiqətdə nə baş verdiyini bilmirdim. Mənim nə Sumqayıtda, nə də Bakıda yaşayan heç bir məlumatlı qohumum və ya tanışım yox idi ki, ondan baş verənləri öyrənə bilim. Qapalı rejimlərdə hökmranlıq edən informasiya qıtlığından isə danışmağa lüzum görmürəm. Mətbuata ancaq lazım olan

qədər informasiya verilirdi. Lazım olan informasiya isə "azərbaycanlıların ermənilərə qarşı misli görünməyən vəhşiliklər törətməsi" idi... Baş verənləri Limanova izah etməyə söz tapmadım... Bu cür təəssüf və təəccüb dolu münasibəti tək Limanovdan deyil, o zamanlar mənimlə işləmiş, məni tanıyan hər kəsdən görmüşdüm. Etiraf edim ki, bu, mənə həqiqi mənada xəcalət verirdi...

Sumqayıt hadisələrindən sonra o dövr yaşadığım bölgəyə ermənilərin axını başladı. İşlədiyim rayonda da bəzi erməni ailələri məskunlaşdılar. Hətta çörək sexi açıb, onu işlətməyə başlamışdılar. Bir gün mənə zəng gəldi. Tamamilə yad bir səs hədə-qorxu gəlirdi. Zelençuku tərk etmək üçün vaxt qoyduqlarını, əks halda, bütün ailəmin sonuna çıxacaqlarını, asıb-kəsəcəklərini və mənə Sumqayıtın nə demək olduğunu göstərəcəklərini söyləyirdi. Qeyd edim ki, biz Zelençukda yeganə azərbaycanlı ailəsi idik. İlk dəfə buna ciddi reaksiya vermədim. Daha sonra eyni məzmunlu növbəti zəng oldu. Bu dəfəki hədələr məni narahat etməyə başladı. Həyat yoldaşıma, nə olursa olsun, evdən bayıra çıxmamasını tapşırdım. Özüm isə işlədiyim rayonun DTK-nın (Dövlət Təhlükəsizlik Komitəsi) rayon şöbəsinin rəisi, Əfqanıstan müharibəsinin iştirakçısı, obyektiv insan bildiyim Aleksandr Litvinenkonun yanına getdim və telefon zəngləri, hədələr barədə danışdım. O, işlə məşğul olacağını bildirdi. Bir müddət sonra Litvinenkodan nəticə ilə bağlı maraqlandım və ailə üzvlərimin evdən bayıra çıxa bilmədiklərini söylədim. O isə məni sakitləşdirərək, evimin qarşısında daim DTK əməkdaşlarının olduğunu, ailəmi mühafizə etdiklərini söyləyib, narahatlığa heç bir lüzum olmadığını dedi. Litvinenko bildirdi ki, həmin zəngin benzindoldurma məntəqəsindən vurulduğunu müəyyənləşdirib, lakin kim tərəfindən edildiyini dəqiqləşdirə bilməyib. Ona görə də Litvinenko Sumqayıtdan gələn bütün erməni ailə başçılarını DTK-ya toplayaraq onlardan izahat almağa başlamışdı. Onlar bu barədə xəbərsiz olduqlarını iddia edir, "günahkarın" kim olduğunu tapıb özlərinin cəzalandıracaqlarına da söz verirdilər. Litvinenko həmin erməni ailə başçılarını, təxminən, 1 gün DTK-da saxladıqdan sonra buraxdı və edilən telefon zənglərinin də səsi birdəfəlik kəsildi.

****

Mən onsuz da xeyli vaxt idi ki, Azərbaycana köçmək barədə düşünürdüm. SSRİ –də baş verən son hadisələr isə fikrimi bir qədər də sürətləndirdi və qətiləşdirdi. Və mən 1988-ci ilin sentyabr ayında növbəti məzuniyyət ərəfəsində Bakıda olarkən, o zamankı Respublika Prokuroru İlyas İsmayılovun qəbuluna getdim. İlyas İsmayılov məni qəbul edib dinlədikdən sonra, dərhal Respublika Prokurorluğunun Mərkəzi aparatına işə qəbul olunmağım barədə razılığını verdi. Məndən sadəcə, tutduğum vəzifədən rəsmən çıxıb, Bakıya gəlməyimi xahiş etdi. Geri qayıtdıqdan

sonra yaxşı münasibətlərdə olduğum Diyar Ədliyyə Şöbəsinin rəisi Limanova işdən azad olunmaq istədiyimi dedikdə, narazılıqla qarşıladı. Üstəlik mənim Qaraçay-Çərkəz Muxtar Vilayətinin Ali Məhkəməsinin sədri təyin olunmam barədə təqdimatın hazır olduğunu da dedi. Lakin heç bu da məni fikrimdən daşındıra bilmədi, baxmayaraq ki, Bakıda sıravi bir vəzifə təklif olunurdu. Ən böyük narazılıq isə Birinci katib Fyodorov tərəfindən oldu. O, qətiyyətlə etiraz etdi və prokurorluqda işləmək istəyim olduğunu düşünüb, rayonun prokuroru vəzifəsini də təklif etdi. Razılaşmadıqda, məni partiyadan çıxaracağı və ümumiyyətlə, işsiz qalacağım ilə hədələdi. Mən ona işdən çıxmaq fikrindən daşındığımı bildirdim. Bundan sonra Azərbaycan SSR-in Prokurorunun müavini M.Cəfərquliyev tərəfindən mənə bir neçə teleqram vuruldu. Həmin teleqramlarda Bakıya nə vaxt qayıdacağım barədə məlumat verməm istənilirdi. M.Cəfərquliyevin 1989-cu ilin mart ayında gələn sonuncu teleqramından sonra mən İlyas İsmayılova zəng vurdum və ona vəziyyəti izah etdim. Bu zaman o partiya qeydiyyatından çıxmadan da Bakıya qayıda biləcəyimi söylədi. Mən İlyas İsmayılovun dediyi kimi etdim və Bakıya gəldim. Aprelin 3-ü Respublika Prokurorluğunda məhkəmələrə nəzarət şöbəsinin prokuroru vəzifəsinə təyin olunmam barədə əmrim imzalandı. Bir müddət sonra ailəmlə birlikdə Bakıya köçdüm və Rusiyada işlədiyim məhkəmə sədri vəzifəsi, Azərbaycanda Respublika Prokurorluğunun məhkəmələrdə cinayət işlərinə baxılmasına nəzarət şöbəsinin prokuroru vəzifəsi ilə əvəzləndi.

Yuxarıda da qeyd etdiyim kimi, Bakıda demək olar ki, heç kimi tanımırdım. Bakıya köçdüyüm və Respublikada işə başladığım gündən çox az vaxt keçmişdi. Bir gün Respublika Prokuroru İlyas İsmayılov məni yanına çağırdı və Sumqayıt hadisələri üzrə bir cinayət işində dövlət ittihamçısı qismində çıxış etməyi təklif etdi. Həmçinin qeyd etdi ki, işə Cavanşir İsmayılov adlı prokuror təyin edilib, lakin onun bu sahədə təcrübəsi yoxdur. İşin kifayət qədər mürəkkəb olduğunu, mənimsə əvvəllər hakim işlədiyimə görə, kifayət qədər təcrübəyə yiyələndiyimi deyən İ.İsmayılov, dövlət ittihamını məhz mənim müdafiə etməyimi istədiyini bildirdi. Bu cür cinayətin törədilməsinə azərbaycanlıları nəyin vadar etməsini öyrənmək mənim üçün həddindən artıq maraqlı olduğundan, təklifi dərhal qəbul etdim...

Beləliklə də, "Qriqoryan işi" adı ilə məşhur olan, Qriqoryan və 6 azərbaycanlının cinayət işində dövlət ittihamçısı təyin olundum və həmin andan etibarən, işlə tanışlığa başladım. Qeyd edim ki, mən dövlət ittihamçısı təyin olunanda iş artıq məhkəməyə verilmişdi. Hətta həmin iş üzrə hazırlıq iclası da keçirilmişdi. Yəni, mənim işlə tanış olmağa heç vaxtım da qalmamışdı. Mən məcburiyyət qarşısında qalıb, cinayət işini evə gətirərək bütün gecəni onunla tanış olurdum.



**Dövlət ittihamını müdafiə edən prokuror Aslan İsmayılov**

İşin təfərrüatlarına keçməzdən əvvəl, ilk növbədə, 1988-ci ilin fevral ayında Sumqayıtda, cinayət işinin materiallarına əsasən, nələrin baş verdiyini sizlərin nəzərinizə çatdırmaq istərdim:

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

2.

28 февраля 1988 года прокуратурой города Сумгаита Азербайджанской ССР возбуждено уголовное дело по факту массовых беспорядков в городе, имевших место 27 и 28 февраля 1988 года.

т.I л.д.58

I марта 1988 года настоящее дело принято к производству и расследуется Прокуратурой Союза ССР.

т.I л.д.I-3

В ходе следствия установлено, что 27-29 февраля 1988 года в городе Сумгаите Азербайджанской ССР хулиганствующими лицами учинены массовые беспорядки, в ходе которых погибло 32 человека, более четырехсот человек получили телесные повреждения различной степени тяжести, подвергнуто нападению и погромлено около двухсот квартир, повреждено более пятидесяти объектов культурно-бытового назначения и свыше сорока единиц автомототранспорта, часть которого сожжена. Государству причинен материальный ущерб на сумму около 7 млн.рублей. В связи с этими событиями в город были введены войска, установлен комендантский час.

т.I л.д.59-60

В совершении преступлений принимали участие сотни граждан. Погромы квартир, поджоги, избиения, изнасилования и убийства совершались группами бесчинствующих хулиганов. Часть из них следствием установлена, арестована и привлекается к уголовной ответственности. Некоторые осуждены. Эти лица изобличены в совершении преступлений в течение 27, 28 и 29 февраля 1988 года в разное время в различных микрорайонах и кварталах города Сумгаита. Расследование их преступной деятельности продолжается и займет длительное время.

В связи с большим объемом следственных материалов, большого количества лиц, участвовавших в массовых беспорядках, уголовное дело разделено на ряд самостоятельных производств. В частности, 30 декабря 1988 года в отдельное производство выделено уголовное дело в отношении Сафарова Низами Сумбат оглы, Мамедова Галиба Гадиршах оглы, Гусейнова Вагифа Вахабали оглы, Наджафова Над ра Ахмедхан оглы, Ганджалыева Эльчина Али оглы, Исаева Афсара Ислам оглы, Григоряна Эдуарда Робертовича, принимавших участие в этих событиях.

т.I л.д. I-3

**Tərcümə:** *1988-ci il fevralın 28-də Azərbaycan SSR-in Sumqayıt şəhər prokurorluğu tərəfindən 1988-ci il fevralın 27-də və 28-də şəhərdə baş vermiş kütləvi iğtişaşlar faktı üzrə cinayət işi qaldırılmışdır.*

*c.1 i.v. 58*

***1988-ci il martın 1-də bu iş SSR İttifaqı Prokurorluğu tərəfindən icraata qəbul edilmişdir və istintaq aparılır.***

*c.1 i.v. 1-3*

*İstintaqın gedişində müəyyən edilmişdir ki, 1988-ci il fevralın 27-29-da Sumqayıt şəhərində xuliqanlıq edən şəxslər tərəfindən kütləvi iğtişaşlar törədilmiş, bu hadisələrin gedişində 32 nəfər həlak olmuş, dörd yüzdən çox insan müxtəlif dərəcəli bədən xəsarətləri almış, iki yüzə yaxın mənzil, əllidən artıq mədəni-məişət təyinatlı obyekt və qırxdan artıq avtomotonəqliyyat vasitəsi hücuma və talana məruz qalmış, avtonəqliyyat vasitələrinin bir qismi yandırılmışdır. Dövlətə, təqribən, 7 milyon rubl məbləğində maddi ziyan vurulmuşdur. Bu hadisələrlə əlaqədar şəhərə qoşun yeridilmiş, komendant saatı tətbiq edilmişdir.*

*c.1 i.v. 59-60*

*Cinayətlərin törədilməsində yüzlərlə vətəndaş iştirak etmişdir. Azğınlaşmış xuliqan qrupları mənzilləri talan etmiş, onlara od vurmuş, insanları döymüş, zorlamış və qətlə yetirmişdir. Bu şəxslərin bir qismi istintaq tərəfindən müəyyən edilərək həbs olunmuşdur və cinayət məsuliyyətinə cəlb edilirlər. Bəziləri məhkum edilmişlər. Bu şəxslər 1988-ci il fevralın 27, 28 və 29-da müxtəlif vaxtlarda Sumqayıt şəhərinin müxtəlif mikrorayonlarında və məhəllələrində cinayətlər törətməkdə təqsirləndirilirlər. Onların cinayətkar fəaliyyətinin təhqiqatı davam edir və hələ çox vaxt tələb edəcəkdir.*

*İstintaq materiallarının həcminin böyük, kütləvi iğtişaşlarda iştirak etmiş şəxslərin sayının çox olması ilə əlaqədar, cinayət işi bir neçə müstəqil icraata bölünmüşdür. O cümlədən həmin cinayətlərdə iştirak etmiş Səfərov Nizam Sumbat oğlu, Məmmədov Qalib Qədirşah oğlu, Hüseynov Vaqif Vahabəli oğlu, Nəcəfov Nadir Əhmədxan oğlu, Gəncəliyev Elçin Əli oğlu, İsayev Əfsər İslam oğlu, Qriqoryan Eduard Robertoviçin barəsində cinayət işi 1988-ci il dekabrın 30-da ayrıca icraata verilmişdir.*

*c.1 i.v. 1-3*

**Şərh:** Beləliklə, artıq işlə ilkin tanışlığım başlamışdı. Etiraf edim ki, bu iş üzrə dövlət ittihamçısı təyin olunanda, bu hadisələrin kimlər tərəfindənsə əvvəlcədən təşkil olunması ağlıma belə gəlmirdi. Mən, sadəcə olaraq, azərbaycanlıları buna vadar edən səbəbləri öyrənmək istəyirdim. Və işlə tanışlığa başladıqda, iştirakçılar arasında milliyyətcə erməni olan Qriqoryanın adı içimə bir şübhə saldı ki, hansı səbəbdən erməni öz millətinə qarşı belə qəddarlıq edib? Artıq işlə tanışlığımın, təxminən, onuncu günündə Sumqayıt hadisələrinin Mərkəz tərəfindən təşkil olunması mənim üçün heç bir şübhə doğurmurdu. İş materialları, şahid ifadələri və ümumiyyətlə, istintaqın gedişi bunu gün kimi aydın etmişdi. Artıq yeganə istəyim hadisələrin təşkil olunduğunun məhkəmədə sübuta yetirilməsində və bu çirkabın millətimin üstündən yuyulmasında əlimdən gələni etmək idi. Bunu bacaracağıma tamamilə əmin idim. Çünki işə təyin olunduğum ilk gündən

həmin iş üzrə hakim qismində çıxış edən Ali Məhkəmənin üzvü Mənsur İbayev məni yanına çağıraraq səmimi şəkildə demişdi ki, onun başqa işləri həddindən artıq çox olduğundan, bu işi ətraflı öyrənməyə vaxtı çatmır. Üstəlik, məndən xahiş etmişdi ki, yeni təyin olunduğuma və keçmişdə hakim işlədiyimə görə işi tam öyrənim, prosesi də tamamilə mən yönləndirim. Məhz bu səbəbdən gecə-gündüz bu iş üzərində çalışırdım. Həmin işi öyrənənədək, sutkada cəmi 3-4 saat yatmaq üçün vaxtım qalırdı. Mən bu hadisələrdə, azərbaycanlıların təqdim edildiyi kimi olmamasını gördükcə sevincimə, iş materiallarından hadisələrin əslində Mərkəz və ermənilərin özləri tərəfindən təşkil olunduğunu aşkarladıqca ümidimə, Mənsur İbayevin danışığında səmimiyyət duyduqca inamıma o qədər alüdə olmuşdum ki, prosesin azərbaycanlıları bu cür damğalayacaq şəkildə yekunlaşacağını ehtimal belə etmirdim. Lakin heç də hər şey mənim təsəvvür etdiyim kimi olmadı...

## QRİQORYAN KİM İDİ?

Daha əvvəllər də qeyd etdim ki, işdə təqsirləndirilənlər arasında erməni soyadı diqqətimi dərhal cəlb etdi: “Kim idi bu erməni? Nəyə görə o, millətinə qarşı cinayətdə iştirak edirdi? Niyə ermənilər tərəfindən bu qədər haqsızlığa uğradıqlarını iddia edən kütlə məhz ermənini öz sıralarına almışdı?”- bütün bu suallara cavab axtarışları məni doğru istiqamətə apardı. Birmənalı şəkildə mənim üçün aydın oldu ki, baş vermiş təxribatlarda Qriqoryan əsas fiqur - kütləni təşkilatlandıran, idarə edən, yönləndirənlərdən birisidir. Lakin bütün bunlara keçməzdən əvvəl, Qriqoryanın kim olduğu, şəxsiyyəti, ekstremal situasiyalarda belə soyuqqanlıqla özünə alibi düzəltməsi, qəddarlığı, hiyləgərliyi, başqalarına təsir etmə qabiliyyəti, bir sözlə, onun Sumqayıt hadisələrinə qədərki həyatı barədə təsəvvür yaratmaq istəyirəm. Bunun üçün mən, sadəcə olaraq, əlimdə olan ittiham aktından istifadə edəcəm. Yalnız ittiham aktından istifadə etməyimin məqsədi isə oxucuda Qriqoryanın kimliyi barədə heç bir şübhə buraxmamaqdır.

**Bütün bunlardan əvvəl isə, əməliyyatçıların, müstəntiqlərin, istintaq qrupunun rəhbərinin-hamısının qeyri-azərbaycanlı olmalarını xüsusilə vurğulamaq istəyirəm ki, Qriqoryan haqqında hansısa qərəzin olması fikri ağla gəlməsin. İndi isə E. Qriqoryanın SSRİ istintaq qrupu tərəfindən hansı cinayətləri törətməkdə ittiham edildiyini nəzərinizə çatdırıram:**

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

311.

ГРИГОРЯН ЭДУАРД РОБЕРТОВИЧ,
16 декабря 1959 года рождения, уроженец г.Сумгаита Азербайджанской ССР, армянин, беспартийный, образование среднее, женат, имеет на иждивении двоих несовершеннолетних детей, прописан по адресу: г.Сумгаит, 2-й микрорайон, ул.Мира, дом 19/13, кв.20, фактически проживает по адресу: г.Сумгаит, 1-й микрорайон, дом 122, кв.71, работает слесарем стана 140 на Азербайджанском трубопрокатном заводе, судим: 1. 17 декабря 1976 года Сумгаитским горнарсудом по ст.207 ч.3 УК Азерб.ССР к 3 годам лишения свободы условно; 2. 30 января 1981 года Сумгаитским горнарсудом по ст.105 УК Азерб.ССР к 1 году исправительных работ с удержанием 20% заработка; 3. 5 апреля 1982 года Сумгаитским горнарсудом по ст.ст.108 ч.2, 143 ч.2, 215-3 ч.2, 215 УК Азерб.ССР к 5 годам 2 месяцам 13 дням лишения свободы, -

О Б В И Н Я Е Т С Я в том, что он, ранее неоднократно судимый за различные преступления, 28 февраля 1988 года в гор.Сумгаите принял непосредственное участие в массовых беспорядках, сопровождавшихся погромами, разрушениями, поджогами и другими подобными действиями, в микрорайонах и кварталах города, в ходе которых совершил ряд преступлений против личности и личной собственности граждан армянской национальности, а также действия, направленные на разжигание национальной вражды и розни.

Преступления Григоряном Э.Р. совершены при следующих обстоятельствах.

**Tərcümə**: *"QRİQORYAN EDUARD ROBERTOVİÇ,*

*16 dekabr 1959-cu ildə Azərbaycan SSR-in Sumqayıt şəhərində anadan olmuşdur, milliyyətcə erməni, bitərəf, orta təhsilli, ailəlidir, himayəsində yetkinlik yaşına çatmamış iki uşağı var, Sumqayıt şəhəri, 2-ci*

*mikrorayon, Sülh küçəsi, ev 19/13, mənzil 20 ünvanında pasport qeydiyyatındadır, faktiki olaraq Sumqayıt şəhəri, 1-ci mikrorayon, ev 122, mənzil 71 ünvanında yaşayır, Azərbaycan Boru Prokatı zavodunda Stan-140 qurğusunda çilingər işləyir, dəfələrlə məhkum olunmuşdur: 1) 17 dekabr 1976-cı ildə Sumqayıt şəhər Xalq Məhkəməsi tərəfindən Azərbaycan SSR CM-nin 207-ci maddəsinin 3-cü hissəsi ilə 3 il azadlıqdan şərti məhrumetmə cəzasına; 2) 30 yanvar 1981-ci ildə Azərbaycan SSR CM-nin 105-ci maddəsi ilə əmək haqqının 20 faizi tutulmaqla 1 il islah işlərinə; 3) 5 aprel 1982-ci ildə Azərbaycan SSR CM-nin 108-ci maddəsinin 2-ci hissəsi, 143-cü maddənin 2-ci hissəsi, 215-3-cü maddənin 2-ci hissəsi və 215-ci maddəsi ilə 5 il 2 ay 13 gün müddətinə azadlıqdan məhrumetmə cəzasına məhkum edilmişdir.*

*Əvvəllər müxtəlif cinayətlərə görə dəfələrlə məhkum olunmuş E.R.Qriqoryan 1988-ci il fevralın 28-də Sumqayıt şəhərinin mikrorayonlarında və məhəllələrində talanlar, dağıntılar, qəsdən yandırmalar və başqa oxşar əməllərlə müşayiət olunan kütləvi iğtişaşlarda bilavasitə iştirak etməkdə, bu iğtişaşların gedişində erməni millətindən olan vətəndaşların şəxsiyyəti və şəxsi mülkiyyəti əleyhinə bir sıra cinayətlər, eləcə də milli düşmənçiliyin və ayrı-seçkiliyin qızışdırılmasına yönəlmiş əməllər törətməkdə ittiham edilir.*

*E.R.Qriqoryan həmin cinayətləri aşağıdakı şəraitdə törətmişdir.”*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

312.

Зная о происходящих в г.Сумгаите массовых беспорядках, Григорян Э.Р. 28 февраля 1988 года около 16 часов с целью совершения преступлений в отношении граждан армянской национальности, присоединился к собравшейся в районе автовокзала города, на пересечении улиц Мира и Дружбы, группе хулиганствующих лиц, вооруженной металлическими трубами, прутьями, палками и другими предметами.

Примерно в 16 часов Григорян Э.Р. совместно с Исаевым А.И., Мамедовым Г.Г., Сафаровым Н.С., Ганджалыевым Э.А. и другими хулиганствующими лицами вышел на улицу Мира для остановки автотранспорта с целью выявления граждан армянской национальности и расправы над ними. Остановив автомобиль "Москвич-2140", госномер И 5258 АГ, принадлежащий на праве личной собственности Есеяну Л.Ш., следовавший из гор.Баку под управлением Есеян Альбины Александровны, Григорян Э.Р. и другие участники беспорядков, установив принадлежность пассажиров к армянской национальности, пытались вначале перевернуть автомашину вместе с пассажирами, а затем вытащили из салона находившихся в автомашине Есеяна Левона Шириновича, инвалида I группы по зрению, Есеян Альбину Александровну и их несовершеннолетнюю дочь Есеян Нарине Левоновну и стали избивать их. После того, как подоспевшие работники милиции вырвали семью Есеян из рук хулиганствующих лиц, Григорян Э.Р. и другие участники беспорядков перевернули автомашину, а затем подожгли ее. В результате поджога была уничтожена автомашина стоимостью 6 205 рублей, а также находившиеся в ней магнитофон, радиоприемник, одежда и другие вещи потерпевших на сумму I 277 руб.50 коп. Общая сумма причиненного потерпевшим ущерба от преступных действий Григоряна Э.Р. и других составила 7 482 руб.50 коп.

Продолжая действия, направленные на совершение преступлений против лиц армянской национальности, Григорян Э.Р. и другие примкнули к направлявшейся в 3-й микрорайон города группе хулиганствующих лиц, вооруженной металлическими трубами, прутьями, палками и другими предметами.

Около 18 часов Григорян Э.Р. совместно с Мамедовым Г.Г., Сафаровым Н.С., Наджафовым Н.А., Исаевым А.И., Ганджалыевым Э.А. и другими лицами с помощью металлических прутьев, труб, топоров и других

**Tərcümə:** *"1988-ci il fevralın 28-də E.R.Qriqoryan Sumqayıt şəhərində kütləvi iğtişaşlar baş verdiyini bilərək, erməni millətindən olan vətəndaşlar barəsində cinayətlər törətmək məqsədilə saat 16 radələrində şəhər avtovağzalı rayonunda, Sülh və Dostluq küçələrinin kəsişdiyi yerdə toplaşmış, metal boru parçaları, metal çubuqlar, dəyənək və başqa əşyalarla silahlanmış halda xuliqanlıq edən bir qrup şəxsə qoşulmuşdur.*

*Təxminən, saat 16-da E.R.Qriqoryan erməni millətindən olan vətəndaşları aşkar etmək və onlara divan tutmaq məqsədilə Ə.İ.İsayev, Q.Q.Məmmədov, N.S.Səfərov, E.A.Gəncəliyev və xuliqanlıq edən başqa şəxslərlə birlikdə avtomobil nəqliyyatını dayandırmaq üçün Sülh küçəsinə çıxmışdır. E.R.Qriqoryan və iğtişaşların digər iştirakçıları şəxsi mülkiyyət hüququilə L.Ş.Yeseyana məxsus olan, Bakıdan gələn, Yeseyan Albina Aleksandrovnanın idarə etdiyi, dövlət nömrə nişanı İ 5258 AQ olan "Moskviç-2140" markalı avtomobili saxlatdırıb sərnişinlərin erməni millətinə mənsub olmasını müəyyən edərək əvvəlcə avtomaşını sərnişinlərlə birgə aşırmağa çalışmış, sonra isə avtomaşında olan I qrup gözdən əlil Yeseyan Levon Şirinoviçi, Yeseyan Albina Aleksandrovnanı və onların yetkinlik yaşına çatmamış qızı Yeseyan Narine Levonovnanı zorla salondan çıxarmış və onları döyməyə başlamışlar. Özünü yetirən milis işçiləri Yeseyanın ailəsini xuliqanlıq edən şəxslərin əlindən aldıqdan sonra E.R.Qriqoryan və iğtişaşların digər iştirakçıları maşını çevirmiş, sonra isə onu yandırmışlar. Yandırma nəticəsində dəyəri 6.205 rubl olan avtomaşın, eləcə də onun içərisində olan maqnitofon, radioqəbuledici, paltar və zərər çəkənlərə məxsus, ümumi dəyəri 1.277 rubl 50 qəpik olan başqa əşyalar məhv edilmişdir. E.R. Qriqoryan və başqalarının cinayətkar əməlləri nəticəsində zərər çəkənlərə vurulmuş ziyanın ümumi məbləği 7.482 rubl 50 qəpik olmuşdur.*

*E.R.Qriqoryan və başqaları erməni millətindən olan şəxslərə qarşı cinayətlər törədilməsinə yönəlmiş əməllərini davam etdirərək şəhərin 3-cü mikrorayonuna yönələn, metal boru parçaları, metal çubuqlar, dəyənək və başqa əşyalarla silahlanmış halda xuliqanlıq edən bir qrup şəxsə qoşulmuşlar.*

*Saat 18 radələrində E.R.Qriqoryan Q.Q.Məmmədov, N.S.Səfərov, N.A.Nəcəfov, Ə.İ.İsayev, E.A.Gəncəliyev və digər şəxslərlə birlikdə 3-cü mikrorayonda 17/33 "B" nömrəli evdə erməni millətindən olan Mejlumyanın ailəsinin yaşadığı 15 nömrəli mənzilin qapısını metal boru parçalarından, metal çubuqlardan, baltalardan və digər əşyalardan istifadə etməklə...*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



313.

предметов взломали дверь квартиры № I5 дома № I7/33"Б" в 3-м микрорайоне, где проживала семья армянской национальности Межлумян, ворвались в квартиру и учинили погром, разбили стекла в окнах, повредили и частично уничтожили мебель, посуду, одежду и другие предметы домашнего обихода. Часть имущества была выброшена во двор и сожжена.

Сопровождая свои действия насилием над жильцами квартиры, Григорян Э.Р. и другие участники погрома нанесли побои Межлумян Розе Антоновне, Межлумяну Григорию Арменаковичу, Межлумян Людмиле Григорьевне, Межлумян Карине Григорьевне. С Межлумян К.Г. была сорвана одежда. После изнасилования ее вывели во двор и вновь избили.

В результате погрома квартиры с участием Григоряна Э.Р. семье Межлумян причинен материальный ущерб на сумму 24 887 рублей. Частичным разрушением квартиры государству нанесен материальный ущерб на сумму I92 рубля.

Примерно в I9 часов, Григорян Э.Р. вместе с Наджафовым Н.А., Мамедовым Г.Г., Ганджалыевым Э.А., Сафаровым Н.С., Гусейновым В.В., Исаевым А.И. и другими лицами ворвались в уже погромленную другими участниками беспорядков квартиру № 45 дома № 5/3 3-го микрорайона, где проживала семья армянской национальности Григорян. Обнаружив в спальной комнате под кроватью спрятавшуюся от расправы Григорян Эмму Шириновну, Григорян Э.Р., Сафаров Н.С., Исаев А.И. и другие извлекли ее из-под кровати. После этого Григорян Э.Р. и другие лица сорвали с нее одежду, нанесли ей побои руками и ногами, а затем после изнасилования обнаженную вывели из квартиры во двор дома, где принуждали танцевать, прижигали тело горящими сигаретами, вновь нанесли побои.

Около 22 часов, присоединившись к группе хулиганствующих лиц, собравшейся в I микрорайоне города, Григорян Э.Р. вместе с Наджафовым Н.А., Гусейновым В.В. и другими с целью учинения погрома взломали с помощью металлических труб, прутьев, топоров дверь квартиры № 8 в доме № I3/3I указанного микрорайона, где проживала семья армянской национальности Оганесян. Однако проживавший в квартире зять Оганесяна В.А. - Агасарян Эдвард Арташевич, вооружившись топором, стал защищаться и не допустил участников погрома в квартиру. В результате повреждения Григоряном Э.Р. и другими входной двери квартиры государству причинен материальный ущерб на сумму I90 рублей.

**Tərcümə:** *sındıraraq mənzilə soxulmuş və oranı talamış, pəncərə şüşələrini qırmış, mebeli, qab-qacağı, paltarı və digər ev əşyalarını*

*zədələmiş və qismən məhv etmişlər. Əmlakın bir hissəsi həyətə atılmış və yandırılmışdır.*

*E.R.Qriqoryan və talançılıq əməllərinin digər iştirakçıları bu hərəkətlərlə yanaşı, mənzil sakinlərinə qarşı zor tətbiq edərək Mejlumyan Roza Antonovna, Mejlumyan Qriqori Armenakoviç, Mejlumyan Lyudmila Qriqoryevna və Mejlumyan Karina Qriqoryevnanı döymüşlər. Onlar K.Q.Mejlumyanın paltarını zorla soyundurmuş, onu zorlamış, sonra isə həyətə çıxarıb orada yenidən döymüşlər.*

*E.R.Qriqoryanın iştirakı ilə mənzilin talanması nəticəsində Mejlumyanın ailəsinə 24.887 rubl məbləğində maddi ziyan vurulmuşdur. Mənzilin qismən dağıdılması ilə əlaqədar, dövlətə 192 rubl məbləğində maddi ziyan vurulmuşdur.*

*Təxminən saat 19-da E. R. Qriqoryan N. A. Nəcəfov, Q. Q. Məmmədov, E.A.Gəncəliyev, N. S. Səfərov, V. V. Hüseynov, Ə. İ. İsayev və başqa şəxslərlə birlikdə 3-cü mikrorayondakı 5/3 nömrəli evdə erməni millətindən olan Qriqoryanlar ailəsinin yaşadığı, iğtişaşların digər iştirakçıları tərəfindən artıq talan edilmiş 45 nömrəli mənzilə soxulmuşlar. E.R.Qriqoryan, N. S. Səfərov, Ə. İ. İsayev və başqaları mənzilin yataq otağında çarpayının altında, divan tutulacağından qorxaraq gizlənmiş Qriqoryan Emma Şirinovnanı aşkar etmiş və onu çarpayının altından çıxarmışlar. Bundan sonra E. R. Qriqoryan və digər şəxslər E.Ş.Qriqoryanı zorla soyundurmuş, ona əl və ayaq zərbələri endirmiş, bundan sonra onu zorlamış və çılpaq halda mənzildən evin həyətinə çıxarıb, orada onu rəqs etməyə məcbur etmiş, yanan siqaretlərlə bədənini yandırmış, yenidən döymüşlər.*

*Saat 22 radələrində E. R. Qriqoryan N. A. Nəcəfov, V. V. Hüseynov və başqaları ilə birlikdə həmin mikrorayonun 13/31 nömrəli evində erməni millətindən olan Ohanesyanlar ailəsinin yaşadığı 8 nömrəli mənzilin qapısını metal boru parçaları, metal çubuqlar və baltalar vasitəsilə sındıraraq mənzilə soxulmuşlar. Lakin V.A.Ohanesyanın həmin mənzildə yaşayan kürəkəni Ağasaryan Edvard Artaşeviç balta ilə silahlanaraq özünü müdafiə etməyə başlamış və talançılıq hərəkətlərinin iştirakçılarını mənzilə buraxmamışdır. E.R.Qriqoryan və başqaları tərəfindən mənzilin giriş qapısının zədələnməsi nəticəsində dövlətə 190 rubl məbləğində maddi ziyan vurulmuşdur".*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

314.

Продолжая свои преступные действия, Григорян Э.Р. вместе с Наджафовым Н.А., Гусейновым В.В., Мамедовым Г.Г., Сафаровым Н.С. и другими лицами примерно в 22 часа пришли к соседнему дому № 33/14 этого же микрорайона города, где с помощью обрезков металлических труб, прутьев, топоров взломали дверь квартиры № 58, в которой проживала семья армянской национальности Петросян. Ворвавшись в квартиру, Григорян Э.Р., Сафаров Н.С., и другие лица учинили погром: разбили стекла в окнах, повредили и частично уничтожили мебель, посуду, одежду и другие предметы домашнего обихода, часть которых выбросили во двор и сожгли, а также нанесли побои находившимся в квартире Петросяну М.Ш. и его жене Шахбазян Ж.Б.

В результате погрома квартиры с участием Григоряна Э.Р. потерпевшим причинен материальный ущерб на сумму 13 465 рублей. Частичным разрушением квартиры государству нанесен материальный ущерб на сумму 249 рублей.

Перечисленными действиями Григорян Э.Р. совершил преступление, предусмотренное ст.72 УК Азербайджанской ССР, то есть принял непосредственное участие в массовых беспорядках, сопровождавшихся погромами, разрушениями, поджогами и другими подобными действиями.

Кроме того, 28 февраля 1988 года в ходе погрома квартиры семьи Межлумян /3-й микрорайон, дом 17/33"Б", кв.15/ группой лиц были изнасилованы Межлумян Людмила Григорьевна и Межлумян Карина Григорьевна.

Ворвавшись в эту квартиру около 18 часов и учинив погром, Григорян Э.Р. в числе других лиц, применяя физическое насилие и угрозы, используя беспомощное состояние Межлумян Л.Г., наступившее в результате нанесенных ей побоев и неоднократно совершаемых с нею половых актов, против ее воли, совершил с Межлумян Л.Г. насильственный половой акт.

После изнасилования Межлумян Л.Г. спустя непродолжительное время Григорян Э.Р. в числе других лиц, в этой квартире, применяя физическое насилие и угрозы, используя беспомощное состояние Межлумян К.Г. наступившее от многократно совершаемых с ней половых актов, против ее воли также совершил с Межлумян К.Г. насильственный половой акт.

**Tərcümə:** *"E. R. Qriqoryan cinayətkar əməllərini davam etdirərək, N.A.Nəcəfov, V.V. Hüseynov, Q. Q. Məmmədov, N. S. Səfərov və başqa şəxslərlə birlikdə, təxminən, saat 22-də şəhərin həmin mikrorayonda qonşuluqdakı 33/14 nömrəli evə gəlmiş, orada erməni millətindən olan Petrosyanlar ailəsinin yaşadığı 58 nömrəli mənzilin qapısını metal boru*

*parçaları, metal çubuqlar və baltalar vasitəsilə sındırmışlar. E.R.Qriqoryan, N.S.Səfərov və başqa şəxslər mənzilə soxularaq onu talamışlar: pəncərə şüşələrini qırmış, mebeli, qab-qacağı, paltarı və digər ev əşyalarını zədələmiş və qismən məhv etmiş, onların bir hissəsini həyətə atıb yandırmış, eləcə də mənzildə olan M.Ş.Petrosyanı və onun arvadı J.B.Şahbazyanı döymüşlər.*

*E.R.Qriqoryanın iştirakı ilə mənzilin talanması nəticəsində zərər çəkənlərə 13.465 rubl məbləğində maddi ziyan vurulmuşdur. Mənzilin qismən dağıdılması ilə əlaqədar dövlətə 249 rubl məbləğində maddi ziyan vurulmuşdur.*

*E.R.Qriqoryan yuxarıda sadalanan əməlləri ilə Azərbaycan SSR CM-nin 72-ci maddəsində nəzərdə tutulan cinayəti törətmiş, yəni talanlar, dağıtmalar, odlamalar və başqa bu kimi hərəkətlərlə müşayiət olunan kütləvi iğtişaşlarda bilavasitə iştirak etmişdir.*

*Bundan əlavə, 1988-ci il fevralın 28-də Mejlumyanlar ailəsinin mənzilinin (3-cü mikrorayon, ev 17/33 "B", mənzil 15) talanması zamanı Mejlumyan Lyudmila Qriqoryevna və Mejlumyan Karina Qriqoryevna bir qrup şəxs tərəfindən zorlanmışdır.*

***Saat 18 radələrində başqa şəxslərlə birlikdə bu mənzilə soxulmuş və talançılıq etmiş E.R.Qriqoryan L.Q.Mejlumyanın döyülməsi və iradəsinə zidd olaraq dəfələrlə cinsi əlaqəyə məcbur edilməsi nəticəsində köməksiz vəziyyətə düşməsindən istifadə edərək, fiziki zorakılıq və hədə-qorxu tətbiq etməklə L.Q.Mejlumyanla zorla cinsi əlaqədə olmuşdur.***

***E.R.Qriqoryan L.Q.Mejlumyanı zorlayandan az sonra başqa şəxslərlə birlikdə həmin mənzildə K.Q.Mejlumyanın iradəsinə zidd olaraq dəfələrlə cinsi əlaqəyə məcbur edilməsi nəticəsində köməksiz vəziyyətə düşməsindən istifadə edərək, fiziki zorakılıq və hədə-qorxu tətbiq etməklə K.Q.Mejlumyanla da zorla cinsi əlaqədə olmuşdur."***

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

315.

Насильственные половые акты с Межлумян Л.Г. также совершили Мамедов Г.Г., Сафаров Н.С., Исаев А.И., Наджафов Н.А. и другие лица.

В этот же вечер, 28 февраля 1988 года в своей квартире группой лиц была изнасилована Григорян Эмма Шириновна /3-й микрорайон, дом 5/2, кв.45/.

Ворвавшись в эту квартиру примерно в 19 часов, Григорян Э.Р., Наджафов Н.А., Исаев А.И., Сафаров Н.С., Гусейнов В.В., Ганджалыев Э.А. и другие обнаружили спрятавшуюся под кроватью Григорян Э.Ш. Вытащив ее из-под кровати, Григорян Э.Р., Сафаров Н.С., Исаев А.И. и другие с целью изнасилования разорвали на ней одежду, после чего Григорян Э.Р., применяя к потерпевшей физическое насилие и угрозы, совершил с ней против ее воли насильственный половой акт.

Насильственные половые акты с Григорян Э.Ш. совершили также Исаев А.И., Сафаров Н.С., Наджафов Н.А. и другие. Во время совершения насильственных половых актов Исаев А.И., Сафаров Н.С., Григорян Э.Р., Наджафов Н.А. и другие, оказывая друг другу содействие в изнасиловании, удерживали ноги и руки потерпевшей, наносили ей побои, подавляя тем самым ее сопротивление.

Этими действиями Григорян Э.Р. совершил преступление, предусмотренное ст.109 ч.3 УК Азербайджанской ССР - изнасилование, то есть половое сношение с применением физического насилия, угроз, с использованием беспомощного состояния потерпевшей, совершенное группой лиц и лицом, ранее совершившим такое преступление.

Кроме того, 28 февраля 1988 года, примерно в 19 часов, после нанесения Григоряном Э.Р. и другими участниками массовых беспорядков побоев потерпевшей Григорян Э.Ш. /3-й микрорайон, дом 5/2, кв.45/, а также совершения с ней насильственных половых актов, Григорян Э.Р. вместе с Наджафовым Н.А., Исаевым А.И., Сафаровым Н.С. и другими лицами, из хулиганских побуждений, а также с целью сокрытия преступлений, договорились совершить убийство Григорян Эммы Шириновны с причинением последней особых мучений и страданий.

Осуществляя преступные намерения, Григорян Э.Р., Наджафов Н.А.,

**Tərcümə:** *"Q.Q.Məmmədov, N.S.Səfərov, Ə.İ.İsayev, N.A.Nəcəfov və başqa şəxslər də L.Q.Mejlumyana qarşı zorakılıqla cinsi əlaqə aktları törətmişlər.*

*Elə həmin axşam, 1988-ci il fevralın 28-də Qriqoryan Emma*

*Şirinovna mənzilində (3-cü mikrorayon, ev 5/2, mənzil 45) bir qrup şəxs tərəfindən zorlanmışdır.*

*Təqribən saat 19-da bu mənzilə soxulmuş E.R.Qriqoryan, N.A.Nəcəfov, Ə.İ.İsayev, N.S.Səfərov, V.V.Hüseynov, E.A.Gəncəliyev və başqaları çarpayının altında gizlənmiş E.Ş.Qriqoryanı aşkar edərək onu çarpayının altından çıxarmışlar. E.R.Qriqoryan, N.S.Səfərov, Ə.İ.İsayev və başqaları E.Ş.Qriqoryanı zorlamaq məqsədilə onun əynindəki paltarı cırmış, bundan sonra E.R.Qriqoryan zərər çəkənə fiziki zorakılıq və hədə-qorxu tətbiq etməklə onun iradəsinə zidd olaraq onunla zorakı yolla cinsi əlaqədə olmuşdur.*

*Ə.İ.İsayev, N.S.Səfərov, N.A.Nəcəfov və başqaları da E.Ş.Qriqoryana qarşı zorakılıqla cinsi əlaqə aktları törətmişlər. Ə.İ.İsayev, N.S.Səfərov, E.R.Qriqoryan, N.A.Nəcəfov və başqaları zorakı yolla cinsi əlaqədə olarkən zərərçəkəni zorlamaqda bir-birinə kömək etmək üçün onun ayaqlarını və əllərini tutub saxlamış, onu döymüş və bu yolla onun müqavimətini qırmışlar.*

*E.R.Qriqoryan bu hərəkətləri ilə Azərbaycan SSR CM-nin109-cu maddəsinin 3-cü hissəsində nəzərdə tutulan zorlama cinayətini, yəni bir qrup şəxs tərəfindən və əvvəllər bu cür cinayət törətmiş şəxs tərəfindən fiziki zor tətbiq etmə, zor tətbiq etməklə hədələmə, zərərçəkənin köməksiz vəziyyətindən istifadə etməklə cinsi əlaqədə olma cinayətini törətmişdir.*

*Bundan əlavə, 1988-ci il fevralın 28-də saat 19 radələrində E.R.Qriqoryan və kütləvi iğtişaşların digər iştirakçıları zərər çəkən E.Ş.Qriqoryanı (3-cü mikrorayon, ev 5/2, mənzil 45) döydükdən və onunla zorakı yolla cinsi əlaqədə olduqdan sonra E.R.Qriqoryan N.A.Nəcəfov, Ə.İ.İsayev, N.S.Səfərov və başqa şəxslərlə birlikdə xuliqanlıq niyyəti ilə, eləcə də törədilmiş cinayətləri gizlətmək məqsədilə Emma Şirinovna Qriqoryana xüsusi əzab və əziyyət verməklə onu qətlə yetirmək barədə razılığa gəlmişlər.*

*E.R.Qriqoryan, N.A.Nəcəfov,"*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

316.

Гусейнов В.В., Исаев А.И., Сафаров Н.С. и другие, нанося Григорян Э.Ш. удары по различным частям тела, вывели потерпевшую во двор дома 5/2, где, продолжая издевательства, принуждали ее танцевать, прижигали различные участки тела, в том числе и половые органы, горящими сигаретами, наносили удары ногами, руками и различными предметами по особенно чувствительным к боли частям тела / в пах, живот, грудь, поясницу, голову/, сознавая, что причиняют этим потерпевшей мучения и страдания.

Затем Григорян Э.Р., Сафаров Н.С., Наджафов Н.А., Исаев А.И., Гусейнов В.В. и другие повалили потерпевшую на землю и, удерживая в положении на спине, развели ей ноги. По предложению Григоряна Э.Р., Сафарова Н.С., Исаева А.И. Наджафов Н.А. принес обрезок металлической трубы и передал его Гусейнову В.В., который, сознавая, что своими действиями причиняет особые мучения и страдания потерпевшей, с целью умышленного убийства, из хулиганских побуждений, ввел конец трубы во влагалище Григорян Э.Ш. Григорян Э.Р., Сафаров Н.С., Исаев А.И. и другие тем временем, сознавая опасность действий Гусейнова В.В. для жизни потерпевшей, а также то, что Гусейнов В.В. своими действиями причиняет ей особые мучения и страдания, продолжали удерживать Григорян Э.Ш. за ноги и за руки. От крика потерпевшей, вызванного острой болью, Григорян Э.Р. и другие отпустили ее. Поднявшись с земли, потерпевшая Григорян Э.Ш. пыталась убежать, однако около соседнего дома № 6/2"А" была настигнута Григоряном Э.Р., Сафаровым Н.С., и другими. Сафаров Н.С., с целью умышленного убийства, сзади, в прыжке, нанес Григорян Э.Ш. сильный удер ногой по спине, от которого вследствие перегибания позвоночного столба в нижнегрудном отделе произошел перелом X грудного позвонка потерпевшей с повреждением спинного мозга, сопровождавшийся обширным кровоизлиянием в околопочечную жировую клетчатку. После нанесенного Сафаровым Н.С. удара и падения на землю потерпевшей, Григорян Э.Р., Сафаров Н.С., Наджафов Н.А., Гусейнов В.В., Исаев А.И. вновь начали избивать ее, нанося удары ногами и различными предметами по голове и другим участкам тела, причиняя тем самым ей особые мучения и страдания. Ненесенными Григоряном Э.Р. и другими лицами ударами потерпевшей причинены множественные переломы ребер справа, ушибленные раны головы, ссадины, кровоподтеки.

**Tərcümə:** *"E.R.Qriqoryan, N.A.Nəcəfov, V.V.Hüseynov, Ə.İ.İsayev, N.S.Səfərov və başqaları cinayətkar niyyətlərini həyata keçirmək üçün E.Ş.Qriqoryanın bədəninin müxtəlif hissələrinə zərbələr endirərək zərərçəkəni 5/2 nömrəli evin həyatinə çıxarmış, orada da ona əzab verməkdə davam edərək onu rəqs etməyə məcbur etmiş, bu hərəkətlərin*

*zərərçəkənə əzab və əziyyət verdiyini bilə-bilə, yanan siqaretlərlə onun bədəninin müxtəlif hissələrini, o cümlədən cinsiyyət orqanlarını yandırmış, bədəninin ağrıya xüsusilə həssas olan hissələrinə (qasıq, qarın, döş, bel, baş nahiyələrinə) ayaqları, əlləri və müxtəlif əşyalarla zərbələr endirmişlər.*

*Sonra E.R.Qriqoryan, N.S.Səfərov, N.A.Nəcəfov, Ə.İ.İsayev, V.V.Hüseynov və başqaları zərərçəkəni yerə yıxmış və onu arxası üstə saxlayaraq ayaqlarını aralamışlar. N.A.Nəcəfov E.R.Qriqoryanın, N.S.Səfərovun və Ə.İ.İsayevin təklifi ilə bir metal boru parçası gətirib onu V.V.Hüseynova vermiş, sonuncu isə hərəkətləri ilə zərər çəkənə xüsusi əzab və əziyyət verdiyini bilə-bilə, onu qəsdən öldürmək məqsədilə, xuliqanlıq niyyəti ilə borunun ucunu E.Ş.Qriqoryanın uşaqlıq yoluna yeritmişdir. Bu vaxt E.R.Qriqoryan, N.S.Səfərov, Ə.İ.İsayev və başqaları V.V.Hüseynovun hərəkətlərinin zərərçəkənin həyatı üçün təhlükəli olmasını, eləcə də V.V.Hüseynovun hərəkətləri ilə zərərçəkənə xüsusi əzab və əziyyət verdiyini bilə-bilə E.Ş.Qriqoryanın ayaqlarını və əllərini tutub saxlamaqda davam etmişlər. Zərərçəkən kəskin ağrıya dözməyib qışqıranda E.R.Qriqoryan və başqaları onu buraxmışlar. Zərərçəkən E.Ş.Qriqoryan yerdən qalxaraq qaçmağa cəhd göstərmiş, lakin qonşuluqdakı 6/2 "A" nömrəli evin yaxınlığında E.R.Qriqoryan, N.S.Səfərov və başqaları onun qabağını kəsmişlər. N.S.Səfərov E.Ş.Qriqoryanı qəsdən öldürmək məqsədilə arxadan tullanaraq onun kürəyinə ayağı ilə güclü zərbə vurmuş, zərbə nəticəsində zərərçəkənin onurğa sütunu əyilmiş, sinəsinin aşağı hissəsində X döş fəqərəsi sınmış, onurğa beyni zədələnmiş, böyrəyin ətrafında piy toxumasında geniş qansızma yaranmışdır. N.S.Səfərov zərərçəkənə zərbə endirəndən və sonuncu yerə yıxılandan sonra E.R.Qriqoryan, N.S.Səfərov, N.A.Nəcəfov, V.V.Hüseynov, Ə.İ.İsayev onu yenidən döyməyə başlamış, ayaqları və müxtəlif əşyalarla başına və bədəninin başqa hissələrinə zərbələr endirmiş, bununla da ona xüsusi əzab və əziyyət vermişlər. E.R.Qriqoryan və başqa şəxslər tərəfindən zərərçəkənə vurulmuş zərbələr nəticəsində onun sağ qabırğalarının çoxu sınmış, başında əzilmiş yaralar, bədənində cızılmalar və qançırlar əmələ gəlmişdir."*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

317.

Затем Григорян Э.Р., Сафаров Н.С., Исаев А.И., Наджафов Н.А. и другие, вновь удерживая на земле потерпевшую, раздвинули ей ноги, а Гусейнов В.В., сознавая, что причиняет ей особые страдания и мучения, вторично ввел во влагалище Григорян Э.Ш. обрезок металлической трубы, причинив своими действиями потерпевшей разрыв влагалища, проникающий в брюшную полость с повреждением брыжейки тонкого кишечника.

От совокупности причиненных Григоряном Э.Р., Сафаровым Н.С., Гусейновым В.В. и другими повреждений, приведших к травматическому шоку, Григорян Э.Ш. 29 февраля 1988 года скончалась.

Этими действиями Григорян Э.Р. совершил преступление, предусмотренное ст.94 п.п.2, 6, 7 УК Азербайджанской ССР - умышленное убийство из хулиганских побуждений, с особой жестокостью, сопряженное с изнасилованием и с целью сокрытия совершенных преступлений.

Совершив умышленное убийство Григорян Э.Ш., в этот же день, 28 февраля 1988 года, примерно в 22 часа, Григорян Э.Р., Мамедов Г.Г. Гусейнов В.В., Наджафов Н.А. и другие учинили погром квартиры № 58 в доме № 33/14 в I микрорайоне города, в которой проживала семья армянской национальности Петросян. Григорян Э.Р., вооруженный топором, вместе с другими участниками погрома ворвался в эту квартиру. Увидев в квартире Петросяна Манвела Шамировича, Григорян Э.Р. с целью умышленного убийства, из хулиганских побуждений топором нанес ему удар по голове. Однако умысел на убийство Петросяна М.Ш. Григорян Э.Р. не довел до конца по причинам, не зависящим от его воли и желания, поскольку потерпевший Петросян М.Ш. в момент нанесения удара, защищаясь от нападения, молотком ударил Григоряна Э.Р. по руке, в которой был топор. В связи с этим удар пришелся не лезвием, а обухом топора по голове потерпевшего, причинив Петросяну М.Ш. в теменной области черепно-мозговую травму с сотрясением головного мозга, по степени тяжести отнесенную к легким телесным повреждениям с кратковременным расстройством здоровья. От полученного удара Петросян М.Ш. потерял сознание, упал на пол, не подавал признаков жизни. Решив, что Петросян М.Ш. убит, Григорян Э.Р. прекратил в отношении него дальнейшие действия.

**Tərcümə:** *"Sonra E.R.Qriqoryan, N.S.Səfərov, Ə.İ.İsayev, N.A.Nəcəfov və başqaları zərərçəkəni yerdə tutub saxlayaraq yenidən onun ayaqlarını aralamış, V.V.Hüseynov isə zərər çəkənə xüsusi əzab və əziyyət verdiyini başa düşdüyü halda metal boru parçasını ikinci dəfə E.Ş.Qriqor-*

*yanın uşaqlıq yoluna yeritmiş, onun bu hərəkətləri nəticəsində zərərçəkənin uşaqlıq yolu qarın boşluğuna qədər cırılmış, düz bağırsağın çözü zədələnmişdir.*

*E.R.Qriqoryan, N.S.Səfərov, V.V.Hüseynov və başqalarının zərər çəkənə vurduğu zədələrin məcmusu onda travmatik şok yaranması ilə nəticələnmiş və 1988-ci il fevralın 29-da E.Ş.Qriqoryan ölmüşdür.*

*E.R.Qriqoryan özünün bu hərəkətləri ilə Azərbaycan SSR CM-nin 94-cü maddəsinin 2-ci, 6-cı və 7-ci bəndlərində nəzərdə tutulmuş cinayəti - xuliqanlıq niyyətilə xüsusi amansızlıqla qəsdən adamöldürmə, zorlama və törədilmiş başqa cinayətləri gizlətmə məqsədilə adamöldürmə cinayətini törətmişdir.*

*E.R.Qriqoryan, Q.Q.Məmmədov, V.V.Hüseynov, N.A.Nəcəfov və başqaları E.Ş.Qriqoryanı qəsdən qətlə yetirdikdən sonra elə həmin gün 1988-ci il fevralın 28-də saat 22 radələrində şəhərin 1-ci mikrorayonunda 33/14 nömrəli evdə erməni millətindən olan Petrosyanlar ailəsinin yaşadığı 58 nömrəli mənzili talamışlar. Balta ilə silahlanmış E.R.Qriqoryan talamanın digər iştirakçıları ilə birlikdə həmin mənzilə soxulmuşdur. E.R.Qriqoryan həmin mənzildə gördüyü Petrosyan Manvel Şamiroviçi qəsdən öldürmək məqsədilə xuliqanlıq niyyəti ilə onun başına balta ilə zərbə endirmişdir. Lakin E.R.Qriqoryan iradəsindən və istəyindən asılı olmayan səbəblərə görə M.Ş.Petrosyanı qətlə yetirmək niyyətini başa çatdırmamışdır, çünki zərərçəkən M.Ş.Petrosyan ona zərbə endirilən anda hücumdan müdafiə olunaraq E.R.Qriqoryanın balta tutduğu əlinə çəkiclə zərbə endirmişdir. Bununla əlaqədar, zərər çəkənin başına E.R.Qriqoryanın əlindəki baltanın tiyəsi deyil, onun küpü dəymiş, nəticədə M.Ş.Petrosyanın əmgək nahiyəsində kəllə-beyin travması, baş beyinin silkələnməsi baş vermişdir. Bu zədələr ağırlıq dərəcəsinə görə sağlamlığın qısamüddətli pozulması ilə yüngül bədən xəsarətlərinə aid edilmişdir. M.Ş.Petrosyan aldığı zərbədən huşunu itirərək döşəməyə yıxılmış, onun sağ qalması əlamətləri olmamışdır. E.R.Qriqoryan M.Ş.Petrosyanın öldüyünü güman edərək ona qarşı hərəkətlərini dayandırmışdır."*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



318.

Этими действиями Григорян Э.Р. совершил преступление, предусмотренное ст.ст.15, 94 п.п.2, 8 УК Азербайджанской ССР, - покушение на умышленное убийство из хулиганских побуждений, совершенное лицом, ранее совершавшим умышленное убийство.

Принимая 28 февраля 1988 года в городе Сумгаите активное участие в массовых беспорядках, Григорян Э.Р. неоднократно призывал группу хулиганствующих лиц учинять погромы квартир граждан армянской национальности. Кроме того, находясь среди многочисленной группы хулиганствующих лиц, своими действиями, выраженными в демонстрационной форме, направленными на погром квартир и имущества граждан только армянской национальности Межлумян, Григорян, Есеян, Петросян, умышленное убийство граждан армянской национальности Григорян Э.Ш., Петросяна М.Ш., тем самым по существу проводил агитацию с целью возбуждения национальной вражды и розни между гражданами армянской и азербайджанской национальностей, подрывал доверие и уважение к лицам армянской национальности, вызывал чувство неприязни к ним.

Этими действиями Григорян Э.Р. совершил преступление, предусмотренное ст.67 УК Азербайджанской ССР, - то есть агитация с целью возбуждения национальной вражды и розни.

На основании ст.33 УПК Азербайджанской ССР настоящее уголовное дело подлежит направлению в Верховный суд Азербайджанской ССР для рассмотрения по существу.

Обвинительное заключение составлено "29" марта 1989 года в гор.Сумгаите Азербайджанской ССР.

Следователь по особо важным делам
при Генеральном прокуроре СССР
старший советник юстиции В.С.Галкин

**Tərcümə:** *"Bu hərəkətləri ilə E.R.Qriqoryan Azərbaycan SSR CM-nin 15-ci maddəsində və 94-cü maddənin 2-ci və 8-ci bəndlərində nəzərdə*

*tutulan cinayəti - əvvəllər qəsdən adam öldürmüş olan şəxs tərəfindən xuliqanlıq niyyəti ilə qəsdən adamöldürməyə cəhd cinayətini törətmişdir.*

*E.R.Qriqoryan 1988-ci il fevralın 28-də Sumqayıt şəhərində kütləvi iğtişaşlarda fəal iştirak edərək xuliqanlıq edən şəxslər qrupunu dəfələrlə erməni millətindən olan vətəndaşların mənzillərini talan etməyə çağırmışdır. Bundan əlavə, xuliqanlıq edən çoxsaylı şəxslər qrupu arasında yalnız erməni millətindən olan vətəndaşlar Mejlumyan, Qriqoryan, Yeseyan, Petrosyanın ailələrinin mənzillərini və əmlakını talan etməyə, erməni millətindən olan vətəndaşlar E.Ş.Qriqoryanı, M.Ş.Petrosyanı qəsdən öldürməyə yönəlmiş nümayişkaranə formada ifadə olunmuş hərəkətləri ilə əslində erməni və Azərbaycan millətindən olan vətəndaşlar arasında milli düşmənçilik və ayrı-seçkilik yaratmaq məqsədilə təşviqat aparmış, erməni millətindən olan şəxslərə hörmət və etimadı azaltmış, onlara qarşı nifrət hissi oyatmışdır.*

*E.R.Qriqoryan bu hərəkətləri ilə Azərbaycan SSR CM-nin 67-ci maddəsində nəzərdə tutulmuş cinayəti – milli düşmənçilik və ayrı-seçkilik yaratmaq məqsədilə təşviqat cinayətini törətmişdir.*

*Azərbaycan SSR CPM-nin 33-cü maddəsi əsasında bu cinayət işi mahiyyəti üzrə baxılmaq üçün Azərbaycan SSR Ali Məhkəməsinə göndərilməlidir.*

*İttihamnamə "29" mart 1989-cu ildə Azərbaycan SSR Sumqayıt şəhərində tərtib edilmişdir.*

*SSRİ Baş Prokuroru yanında*
*xüsusilə mühüm işlər üzrə müstəntiq,*
*baş ədliyyə müşaviri (imza) V.S.Qalkin"*




*E.Qriqoryanın internetdən əldə etdiyimiz şəkli.*

Göründüyü kimi, Sumqayıt hadisələri üzrə istintaqa rəhbərlik etmiş və sonda ittiham aktını imzalamış şəxs SSRİ Baş Prokuroru yanında xüsusilə mühüm işlər müstəntiqi Vladimir Sergeyeviç Qalkindir. ***Məhz bu səbəbdən heç kim azərbaycanlıları istintaqın ermənilərə qarşı qərəzli olmasında ittiham edə bilməz. Çünki bu işin istintaqı SSRİ Baş Prokurorluğu tərəfindən aparılmış və istintaqı aparanlar qeyri-azərbaycanlılar, qrupa rəhbərlik edən də milliyyətcə rus Qalkin olmuşdur*** . **B**ir məqamı da qeyd edim ki, ***məhz SSRİ Prokurorluğunun Sumqayıt hadisələri üzrə istintaq qrupuna başçılıq etmiş Vladimir Qalkin sonradan əks-kəşfiyyat generalı olmuşdur. Maraqlıdır, deyilmi?! Yəni, Prokurorluğun himayəsi ilə onun kimi təmsil etdiyi tamamilə aydındır. Bu barədə sonra daha ətraflı məlumat verəcəm.***

Hörmətli Oxucu! Bundan sonra 332 səhifədən ibarət olan ittiham aktını bütövlükdə kitaba köçürməmək üçün onun araşdırma mövzusuna aid

hissələrini əks etdirməklə kifayətlənəcəm. Sizlərdə maraq doğurarsa, onu həm tam oxumaq üçün, həm də lüzumsuz şübhələrə yer qalmasın deyə ittiham aktını bütövlükdə xüsusi yaradılmış www.sumgayit1988.com saytından əldə edə bilərsiniz. Sumqayıt hadisələrində baş verən ən ağır faciələr məhz bu ittiham aktında öz əksini tapıb. Baş verən faciənin miqyasını azaltmaq fikrim yoxdur, ancaq bir faktı nəzərinizə çatdırım ki, erməni millətçiləri bütün dünyaya Sumqayıtda min nəfərdən artıq insanın qətlə yetirildiyi xəbərini yayıblar. SSRİ prokurorluğu isə Sumqayıtda 32 nəfərin qətlə yetirildiyini müəyyən edir. Nəzərinizə çatdırım ki, 32 nəfərin də 26-sı erməni milliyyətindən 6-sı isə azərbaycanlı olub. Kitabla tanış olduqca, bu faciəni kimlərin törətdiyinin, Azərbaycan xalqının kənarda qurulmuş murdar cinayətlərin qurbanına çevrildiyinin şahidi olacaqsınız. “Böyük Ermənistan” xəstəliyinə yoluxmuş, saxtakarlıqların mahir ustası olan erməni millətçilərinin bu kitabdan öz məqsədləri üçün istifadə edəcəyini istisna etmirəm. Çünki göstərdiklərim onların bu günə qədər Sumqayıt hadisələri ilə bağlı dünyaya yaydıqları “azərbaycanlılar Sumqayıtda baş kəsirdilər, hamilə qadınların qarınlarını açırdılar, erməniləri doğrayıb kabab bişirirdilər” kimi yalanlarını ifşa edəcək və Sumqayıtda törədilmiş ən ağır cinayətlərin məhz onlar tərəfindən törədildiyini sübuta yetirəcəkdir. Mən haqqa, ədalətə, ən əsası, Allahın varlığına sonsuz inanan birisiyəm və əminəm ki, bütün hadisələri çılpaqlığı ilə ortaya qoyduğumdan Sumqayıtda nələrin baş verdiyi barədə özünüz düzgün nəticə çıxaracaqsınız.

İndisə əvvələ qayıdıb, Qriqoryanın kimliyi haqqında təsəvvürlərinizi daha da dolğunlaşdırmaq istərdim...

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



8.

Использовав предоставившуюся возможность, Григорян Э.Р. из служебного кабинета сотрудника Сумгаитского ГОВД позвонил к себе домой и обговорил с женой Каграманян Ритой Мукановной детали выдвинутого алиби.

т.29 л.д.3-4, 64

**Tərcümə:** “*E.R.Qriqoryan yaranmış fürsətdən istifadə edərək Sumqayıt Şəhər DİŞ əməkdaşının xidməti kabinetindən öz evinə telefonla zəng vurmuş və irəli sürdüyü alibinin təfərrüatını arvadı Kaqramanyan Rita Mukanovna ilə razılaşdırmışdır”.*

*c.29 i.v. 3-4, 64*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



I0.

Впоследствии, 24 августа I988 года Асриян /Агаева/ С.Б. признала, что в начале марта I988 года она с мужем находилась в гор.Орджоникидзе, куда часто звонила Каграманян Рита по поводу алиби мужа. В гор.Сумгаит она вернулась в конце марта, не сообщив о своем возвращении Каграманян Р.М., но последняя все же узнала об ее приезде и 30 марта I988 года привела ее к следователю для дачи показаний.

т.29 л.д.I65-I76

**Tərcümə***: “Sonralar, 1988-ci il avqustun 24-də Asriyan (Ağayeva) S.B. etiraf etmişdir ki, martın əvvəlində o, əri ilə birlikdə Orconikidze şəhərində olmuş, Kaqramanyan Rita ərinin alibisi ilə əlaqədar oraya tez-tez zəng etmişdir. Martın əvvəlində o, özünün qayıtmasını R.M.Kaqramanyana bildirmədən Sumqayıta qayıtmış, lakin sonuncu onun gəlməsindən xəbər tutmuş və martın 30-da onu ifadə vermək üçün müstəntiqin yanına gətirmişdir”.*

*c.29 i.v. 166-176*

**Şərh:** İş materiallarından görünür ki, Qriqoryan hər vəchlə özünə alibi yaratmağa çalışır, həbsdə ola-ola, Azərbaycandan kənardakı şahidlərə belə, təsir etməyi bacarır. Qriqoryanın kimliyindən danışarkən, onun digər təqsirləndirilən şəxslər üzərində hansı təsir gücünə sahibləndiyini isə şəxsi təcrübəmdə şahidi olduğum bəzi hallarla nəzərinizə çatdırmaq istəyirəm. Belə ki, məhkəmə iclaslarında bəzən təqsirləndirilən şəxslər çarpaz suallara cavab verərkən, həqiqəti söyləyəndə, Qriqoryan bir baxışı ilə onları dərhal susdurur və dediklərindən imtina etməyə məcbur edirdi. Ümumiyyətlə, təqsirləndirilən şəxslər ifadə verərkən, bir gözləri daim Qriqoryanda olur, mimikasını izləyirdilər və onun mimikasındakı, hərəkətlərindəki hər hansı dəyişiklik onların ifadələrini dəyişməsinə kifayət edirdi.



18/55461-88 №-li cinayət işinin ittiham aktından:



83.

О действиях обвиняемого Григоряна Э.Р. в их квартире потерпевшая Межлумян К.Г. 5 сентября 1988 года пояснила:

"...Именно Григорян Э.Р. избивал маму, нанося ей удары по голове ножкой от сломанного стула, я это хорошо видела и для себя отметила в тот момент, что по внешнему виду Григорян, по всей видимости, лезгин..."

т.2 л.д.168

**Tərcümə:** *1988-ci il sentyabrın 5-də zərərçəkmiş K.Q.Mejlumyan təqsirləndirilən E.R.Qriqoryanın onların mənzilində etdiyi hərəkətlər barədə izahat verərək demişdir:*

*“...Məhz E.R.Qriqoryan mənim anamı döyür, sındırılmış stulun ayağı*

*ilə onun başına zərbələr vururdu. Mən isə bunu yaxşı görürdüm və o vaxt mənə belə gəlirdi ki, Qriqoryanın xarici görkəminə görə, o, yəqin ki, ləzgidir...”.*

c.2 i.v. 168

**Şərh:** Kitabda təqdim etdiyim şəkildən də aydın görünür ki, Qriqoryan zahirən qətiyyən erməni görkəminə malik birisi deyildi. Onu daha çox rusa, ləzgiyə oxşatmaq olardı. Buna görə də yaxın ətrafında olan qısa dairədən başqa hamı onu ləzgi kimi tanıyırdı. Məhz bu səbəbdən, həm də Azərbaycan dilində təmiz danışdığından, onun baş verən cinayətlərdəki aktivliyi heç kimdə şübhə doğurmurdu.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



I3I.

Причину сокрытия ранее участия в преступлениях Григоряна Э.Р. он объяснил, как уже отмечалось, в своих показаниях от I6, I9 мая, 2, 7 и 2I июня I988 года следующим:

"... 29 февраля I988 года примерно в 7 часов... меня из дома забрали в отдел милиции Сумгаита...Там, в коридоре, я и другие задержанные находились довольно долго ... Мы все стояли в коридоре..., имели возможность переговариваться друг с другом... Когда мы стояли в коридоре, то Григорян Эдик сказал мне, чтобы я на допросах не рассказывал о том, где был и что видел 28 февраля, иначе у него есть много знакомых в колониях по всему Союзу и если я буду говорить, то он меня из-под земли достанет и убьет... Надир угрожал мне, что если я расскажу на следствии про него, то он напишет письмо и мою семью убьют...

Я хорошо знал, что Григорян Эдик и Наджафов Надир головорезы и могут действительно меня убить или мою семью... Все братья Григорян законченные преступники и их все боялись. Наджафов Надир в этом похож на него... Поэтому я, боясь за своих родных, давал не совсем правдивые показания..."

т.26 л.д.I3I-I36, I58-I62, I92-20I, 226-235, 227-276

**Tərcümə:** *O, Qriqoryanın cinayətlərdə iştirak etməsini əvvəllər gizlətməsinin səbəbini, artıq qeyd edildiyi kimi, özünün 16, 19 may, 2, 7 və 21 iyun 1988-ci il tarixli ifadələrində belə izah etmişdir:*

*"1988-ci il fevralın 29-da təxminən saat 7-də məni evdən Sumqayıt Milis şöbəsinə apardılar... Orada mən və saxlanılmış digər şəxslər uzun müddət dəhlizdə qaldıq... Biz hamımız dəhlizdə dayanmışdıq... Bir-birimizlə söhbət etməyə imkan vardı... Biz dəhlizdə dayanan vaxt Qriqoryan Edik mənə dedi ki, istintaq zamanı fevralın 28-də mənim harada olmağımı və nələr görməyimi söyləməyim, əks halda İttifaqın bütün koloniyalarında onun tanışları çoxdur və əgər mən danışsam, o məni yerin altından da olsa, tapıb öldürəcəkdir... Nadir (Nəcəfov) məni hədələyirdi ki, əgər mən istintaqda onun barəsində danışsam, o, məktub yazacaq və mənim ailəmi qıracaqlar...*

*Mən yaxşı bilirdim ki, Qriqoryan Edik və Nəcəfov Nadir başkəsənlərdir və onlar həqiqətən məni və mənim ailəmi öldürə bilərlər. Qriqoryan qardaşlarının hamısı canidir və hamı onlardan qorxurdu. Nəcəfov Nadir də bu məsələdə onun tayıdır. Buna görə də mən qohumlarım üçün qorxduğumdan o qədər də düzgün olmayan ifadələr vermişəm..."*
*c.26 i.v. 131-136, 158-162, 192-201, 226-235, 227-276*



**Şərh:** Mən növbəti dəfə Qriqoryan haqqında cinayət işinin materiallarında rast gəlinən ifadələrə şəxsi təcrübəmə söykənərək aydınlıq gətirmək

istərdim. Belə ki, məhkəmə iclaslarının ilk günlərindən, daha əvvəl də söylədiyim kimi, Qriqoryanın digər müttəhimlər üzərində çox güclü nüfuza malik olduğunu görürdüm. Özü də bu nüfuz hörmət və ya istək əsasında deyil, ifadə olunmaz bir qorxu üzərində qurulmuşdu ki, bunu siz yuxarıdakı ifadələrdən də anlamış oldunuz. Və bu nüfuz Qriqoryana təqsirləndirilən şəxslərlə istədiyi kimi rəftar etməsinə imkan verirdi. Videokasetlərə baxış zamanı onun necə davranmağı, müstəntiqləri belə ələ salmağı, ifadə verərkən çox soyuqqanlı olmağı onun sadə adam olmadığından xəbər verirdi. Dəfələrlə şahidi olurdum ki, Qriqoryanın bir baxışı təqsirləndirilən şəxsin ifadəsini dəyişməsinə, hətta ayağa durmasına da səbəb olurdu. Adətən, Qriqoryan dəmir barmaqlıqlar arxasında oturduğu yerin yanını boş saxlayırdı. Proses zamanı gözünün ucu ilə təqsirləndirilən şəxslərdən hər hansı birinə baxırdısa, həmin təqsirləndirilən şəxs dərhal yerindən qalxıb gəlib Qriqoryanın yanındakı yerdə otururdu və ondan, sanki, əmr gözləyirdi. Təqsirləndirilən şəxslərin hamısının Qriqoryandan qorxduqlarını dəfələrlə bildirdikdə isə məhkəmə buna məhəl qoymur, təqsirləndirilən şəxslər və qohumları tərəfindən isə mən hücumlara məruz qalırdım. Bir gün fasilədə məhkəmə zalında çox acınacaqlı bir halın şahidi oldum. İsti yay günlərindən biri idi. Təqsirləndirilən şəxslər üçün bir şüşə mineral su gətirdilər və ən sondakına verdilər. O, şüşəni götürüb özündən sonrakına ötürdü, o da özündən sonrakına ötürdü və beləliklə, heç biri şüşəni açmadan Qriqoryana verdilər. Yalnız Qriqoryan şüşənin ağzını açıb içdikdən sonra digərləri də onun “artığını” içməyə başladılar. Bu hal məni tamamilə dəhşətə gətirdi, hətta əsəblərimin o cür gərgin anında təqsirləndirilən şəxslərdən Qriqoryan-dan niyə qorxduqlarını bir daha soruşdum. Onlarsa “biz heç kimdən qorx-muruq!” – deyə “cəsarətlə” cavab verdilər. Bu zaman mən onlara su şüşəsini birinci Qriqoryana verib, sonra ondan qalan artığı içmələrindən qorxub - qorxmamalarının göründüyünü bildirdim. Cavab verə bilməmələrindən mən onlarda bir xəcalət hissinin yaşandığının da şahidi oldum. Ancaq yenə də Qriqoryana qarşı olan qorxu bu xəcalət hissinə qalib gəlirdi.

Təqsirləndirilən şəxslərin Qriqoryandan necə qorxmalarını həmin prosesdə Qalib Məmmədovun vəkili qismində iştirak edən və işin mahiyyətini yaxşı bilən, Əsədağa Abdullayev də 06, 08, 09 aprel 2010-cu il tarixlərdə “Bizim yol” qəzetinin müxbiri Natiq Cavadlıya verdiyi silsilə müsahibələrində təsdiqləyir. Həmin müsahibələrdən bəzi məqamları diqqətinizə çatdırıram:

**Ə.A. Cavab: “**...*Təsəvvür edin ki, Qriqoryan özünü prosesdə çox ədabaz və şef kimi aparırdı. Adi bir misalı xatırladacağam, təqsirləndirilən digər müttəhimlərin valideynləri uşaqlarına yemək gətirirdilər, amma onlar yeməklərini birinci Qriqoryana yedizdirirdilər. “Badamlı”nı stəkana süzüb*

*birinci Qriqoryana verirdilər ki, "Edik, gəl, sən iç". Bax, onlar belə şərəfsiz, biqeyrət uşaqlar idi.*

***N.C. Sual**: Deməli, bizimkilər Qriqoryandan qorxurmuşlar?*

***Cavab:** Belə çıxır da, bəli, qorxurdular... ,,*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

I33.

Обвиняемый Сафаров Н.С. подтвердил в этой части показания Исаева А.И. и показал:

"...Григорян Эдик, Наджафов Надир, Исаев Афсар и я проживали в одном доме, расположенном в I микрорайоне, и друг друга знали хорошо... Детство наше прошло в одном дворе. Григорян Эдик по характеру спокойный, но вспыльчивый. Хитрый,и даже очень. Ребята нашего двора, в том числе и я, относились к нему с уважениям из-за его физической силы и боялись. И он это знал. Сам он занимался каратэ... Эдик был ранее судим. Наджафов Надир проживает на одном этаже с моими родителями. Он был судим... Сидел в той же колонии, где и Григорян Эдик. Во дворе он вел себя вызывающе... После Григоряна Эдика он чувствовал себя вторым человеком во дворе, был его, так сказать, заместителем. Наджафов Надир - большой пакостник, мог настроить одних против других... Гусейнова Вагифа я узнал после его женитьбы на сестре Наджафова, кажется, в I987 году. Он нечестен, малопорядочен. Если Наджафов был,так сказать, заместителем Григоряна Эдика, то Гусейнов Вагиф - помощником. Проживает Гусейнов Вагиф в Джорате на квартире, но постоянно "крутится" с Наджафовым Надиром... 28 февраля I988 года... после совершения погрома... в квартире Петросян... Григорян Эдик и Наджафов Надир говорили, что если кто-то попадется в руки милиции, то не признаваться, никого не "закладывать"... Затем мы разошлись... Я пошел на остановку автобуса... Работники милиции... доставили меня в горотдел милиции. Там меня допрашивали. Затем I марта I988 года меня повезли в Баку. В одной машине со мной ехал Григорян Эдик, о котором я дал показания в ходе допроса, и его брат Эрик. Эрика тоже почему-то "забрали Я сидел, прижавшись в угол, чтобы меня не заметил Эдик. Мне кажется, что он меня так и не увидел. В машине было много людей..."

т.I6 л.д.77-79, I65-I67

**Tərcümə:** *Təqsirləndirilən N.S. Səfərov Ə.İ. İsayevin ifadələrinin bu hissəsini təsdiq edərək demişdir:*

*"... Qriqoryan Edik, Nəcəfov Nadir, İsayev Əfsər və mən 1-ci mikrorayonda yerləşən eyni binada yaşayırdıq və bir-birimizi yaxşı tanıyırdıq... Bizim uşaqlıq illərimiz bir həyətdə keçmişdir. Qriqoryan Edik xasiyyətcə sakit, lakin çılğındır. Hiyləgərdir, hətta çox hiyləgərdir. Bizim həyətin oğlanları, o cümlədən mən də onun fiziki qüvvəsinə görə ona hörmət edir və ondan qorxurduq. Bunu o özü də bilirdi. Özü karate ilə məşğul olurdu... Edik əvvəllər məhkum olunmuşdur. Nəcəfov Nadir mənim valideynlərimlə eyni mərtəbədə yaşayır. O da məhkum olunmuşdur... Qriqoryan Ediklə eyni kolonda yatmışdır. O, həyətdə özünü lovğa-lovğa aparırdı... Həyətdə özünü Qriqoryan Edikdən sonra ikinci adam hesab edirdi, necə deyərlər, onun müavini idi. Nəcəfov Nadir çox murdar adamdır, adamları bir-birinə qarşı düşmən etməyi bacarırdı... Hüseynov Vaqifi mən onun Nəcəfovun bacısı ilə evlənməsindən sonra tanımışam, gərək ki, 1987-ci ildə. O, şərəfsiz, vicdansız adamdır. Nəcəfov Qriqoryan Edikin, necə deyərlər, müavini idisə Hüseynov Vaqif onun köməkçisi idi. Hüseynov Vaqif Coratda kirayə mənzildə yaşayır, lakin həmişə Nəcəfov Nadirlə "fırlanır"... 1988-ci il fevralın 28-də... Poqosyanın mənzilində... talan törədiləndən sonra... Qriqoryan Edik və Nəcəfov Nadir deyirdilər ki, əgər kimsə milisin əlinə düşsə, heç nəyi boynuna almasın, heç kəsi "satmasın"... Sonra biz ayrıldıq... Mən avtobus dayanacağına getdim... Milis işçiləri... məni şəhər milis şöbəsinə gətirdilər. Orada məni dindirdilər. Sonra, 1988-ci il martın 1-də məni Bakıya apardılar. İstintaqın gedişində barəsində ifadə verdiyim Qriqoryan Edik və onun qardaşı Erik mənimlə eyni maşında gedirdi. Nədənsə Eriki də tutmuşdular. Mən küncə qısılıb oturmuşdum ki, Edik məni görməsin. Mənə belə gəlir ki, o məni görmədi. Maşında adam çox idi...".*

*c.16 i.v. 77-79, 165-167*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

I38.

В то же время в ходе всего следствия обвиняемый Григорян Э.Р. пытался оказать давление на потерпевших и своих соучастников, изобличающих его в содеянном, как по данному эпизоду, так и по другим.

Так, на очной ставке с потерпевшей Межлумян Л.Г. I5 марта I988 года, проведенной с применением видеозаписи, обвиняемый Григорян Э.Р. пытался повлиять на изобличающие его в преступлении показания потерпевшей.

т.3 л.д.6-8

На очной ставке с Межлумян Р.А. 23 сентября I988 года обвиняемый Григорян Э.Р., обращаясь к потерпевшей, вначале пытался пригрозить, а затем сыграть на национальных чувствах опять же с целью склонить потерпевшую изменить изобличающие его в преступлении показания.

т.29 л.д.225-228

22 июня I988 года на очной ставке с обвиняемым Исаевым А.И, проведенной с применением видеозаписи, обвиняемый Григорян Э.Р. крикнул на изобличавшего его Исаева А.И.:

"...Зачем я тебя кормил? Шакал никогда не станет человеком. Лучше змею пригреть на своей груди, чем тебя, перса..."

На что обвиняемый Исаев А.И. ответил:

"...Ты сам мне говорил, что события 28 февраля - это для тебя - дар божий. Как будто бы к тебе пришла сама удача..."

т.26 л.д.298

**Tərcümə:** *Eyni zamanda bütün istintaqın gedişində təqsirləndirilən E.R.Qriqoryan həm bu epizod üzrə, həm də başqa epizodlar üzrə zərərçəkənlərə və onu törətdiyi əməllərdə ifşa edən cinayətin digər iştirakçılarına təzyiq göstərməyə çalışırdı.*

*Belə ki, təqsirləndirilən E.R.Qriqoryan 1988-ci il martın 15-də videoyazı tətbiq edilməklə zərərçəkmiş L.Q.Mejlumyanla üzləşdirmə zamanı zərərçəkmişin onun cinayətlərini ifşa edən ifadələrinə təsir göstərməyə*

*çalışmışdır.*

*c.3 i.v. 6-8*

*23 sentyabr 1988-ci ildə R.A.Mejlumyanla üzləşdirmə zamanı E.R.Qriqoryan əvvəlcə zərərçəkmişə müraciətlə onu qorxutmağa, sonra isə zərərçəkmişi onun cinayətlərini ifşa edən ifadələrini yenə dəyişməyə məcbur etmək məqsədilə onun milli hissləri ilə oynamağa çalışmışdır.*

*c.29 i.v. 225-228*

*22 iyun 1988-ci ildə təqsirləndirilən E.R.Qriqoryan təqsirləndirilən Ə.İ.İsayevlə videoyazıdan istifadə edilməklə üzləşmə zamanı onu ifşa edən Ə.İ.İsayevin üstünə qışqıraraq demişdir: "...Mən səni nə üçün yedirtmişəm? Çaqqal heç vaxt adam olmayacaq. Sənin kimi farsa yaxşılıq etməkdənsə, qoynunda ilan saxlamaq yaxşıdır...".*

*Təqsirləndirilən Ə.İ.İsayev ona belə cavab vermişdir: "Sən özün mənə deyirdin ki, 28 fevral hadisələri sənin üçün Allah nemətidir. Elə bil bəxt özü sənin yanına gəlib".*

*c.26 i.v. 296*

**Şərh:** Bu ifadədə Qriqoryan, bəlkə də, birinci dəfə soyuqqanlılığını unudur və azərbaycanlılara olan nifrətini biruzə verir. Bu məqamda başqa bir halı da nəzərinizə çatdırmaq istərdim. Qriqoryanın özünə arxayınlığı o qədər artmışdı ki, təqsirləndirilən şəxsləri təkcə təklikdə, üzləşmələrdə deyil, məhkəmə prosesində də açıq-aşkar təhdid edirdi. Buna misal olaraq, Qalib Məmmədovun məhkəmədə səmimi ifadə verərkən yaşananları göstərmək istərdim. Belə ki, Qalib Məmmədov ifadə verərkən, Qriqoryan bir neçə dəfə heç kimdən çəkinmədən ona "sən prosesdən sonra baş verəcəkləri düşünmürsən?" – deyərək, hədə-qorxu da gəlirdi. Bu cür hədə-qorxular tez-tez bütün təqsirləndirilən şəxslərə qarşı olurdu.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



I40.

24 июня I988 года обвиняемый Наджафов Н.А., заявляя о своем преклонении перед Григоряном Э.Р., показал:

"...Я отбывал наказание за кражу, о чем известно следствию. В ИТК № 3 также отбывал наказание за кражу Эдик, будучи осужденным к 5 годам 5 месяцам лишения свободы. Примерно до октября I984 года мы отбывали наказание вместе. В зоне некоторое время мы работали в одной бригаде. Жили в одном бараке, проводили вместе свободное время, часто играли в настольную игру – нарды. Эдик... физически... очень сильный человек, волевой и напористый, умеющий всегда за себя постоять. Эдик – из тех, кто в достижении поставленной цели предпочитает физическую силу. Он во всем имеет свое мнение..."

т.22 л.д.I50-I54

**Tərcümə***: 24 iyun 1988-ci ildə təqsirləndirilən N.A.Nəcəfov ifadəsində E.R.Qriqoryanın qarşısında baş əydiyini bildirərək demişdir:*

*"...Mən oğurluq etdiyimə görə cəza çəkirdim. Bu, istintaqa məlumdur. Oğurluq etdiyinə görə 5 il 5 ay müddətinə azadlıqdan məhrumetmə cəzasına məhkum olunmuş Edik də cəzasını 3 №-li islah əmək müəssisəsində çəkirdi. Təxminən 1984-cü ilin oktyabr ayına qədər biz bir yerdə cəza çəkmişik. Zonada bir müddət eyni briqadada işləmişik. Bir barakda yaşayırdıq, boş vaxtımızı bir yerdə keçirirdik. Tez-tez nərd oynayırdıq. Edik ... fiziki cəhətdən... çox güclü, həmişə özünü müdafiə etməyi bacaran, iradəli və inadkar adamdır. Edik kimi adamlar qarşılarına qoyduqları məqsədə çatmaq üçün fiziki qüvvəni üstün tuturlar. Onun hər məsələ barədə öz fikri var...".*

*c.22 i.v. 150-154*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



269.

7. Обвиняемый Григорян Эдуард Робертович.

Родился 14 декабря 1959 года в гор.Сумгаите в семье рабочего.

т.28 л.д.28

Рос в неблагополучной, многодетной семье. Кроме него, в семье было пятеро детей. Отец его умер в 1969 году из-за болезни. Два его брата судимы.

т.28 л.д.195-220

**Tərcümə:** *7.* *<u>Təqsirləndirilən Qriqoryan Eduard Robertoviç</u>*

*14 dekabr 1959-cu ildə Sumqayıt şəhərində fəhlə ailəsində anadan olmuşdur.*

*c.28 i.v. 28*

*Çoxuşaqlı, uğursuz ailədə böyümüşdür. Ailədə ondan başqa beş uşaq olmuşdur. Atası 1969-cu ilə xəstələnərək ölmüşdür. İki qardaşı məhkum olunmuşdur.*

*c.28 i.v. 195-220*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



269.

Всех своих детей она устроила учиться в среднюю школу № 5 гор.Сумгаита. В процессе учебы сыновья ей жаловались, что учеба дается им с большим трудом, так как, они, обучаясь в школе-интернате, очень отстали от школьной программы. Особенно с большим трудом учился Эдуард, который не усваивал математику, убегал с уроков. Поскольку Эдуарду совсем не давалась математика и с трудом другие предметы, ей посоветовали отдать его в школу для слаборазвитых детей, что она и сделала.

т.28 л.д.188-189

**Tərcümə:** *O, uşaqlarının hamısını Sumqayıt şəhərindəki 5 №-li orta məktəbdə oxumağa qoymuşdur. Oğlanları orta məktəbdə oxuyarkən ona şikayətlənirdilər ki, dərsləri öyrənməkdə çox çətinlik çəkirlər, çünki onlar internat-məktəbdə oxuyarkən məktəb proqramından çox geri qalmışdılar. Xüsusilə Eduard çətinliklə oxuyurdu, riyaziyyatı öyrənə bilmir, dərslərdən qaçırdı. Eduard riyaziyyatın öhdəsindən gələ bilmədiyinə və o biri fənləri çətinliklə öyrəndiyinə görə anasına məsləhət görmüşlər ki, onu əqli cəhətdən zəif inkişaf etmiş uşaqlar üçün məktəbə versinlər, anası da belə etmişdir.*

*c.28 i.v. 188-189*

**Şərh:** Bəli, Qriqoryan haqqında verilən xasiyyətnamədə göstərilir ki, o, 10 yaşından atasız böyüyüb, onun tərbiyəsi ilə anası məşğul olub, orta məktəbdə pis oxuyub. Ancaq bu, heç də onun ağıl göstəricisi deyil. Çünki məhkəmə dindirmələri zamanı verdiyim çarpaz suallarda təqsirləndirilən şəxslərin hamısı bəzən həqiqəti söyləyirdilər. Qriqoryanı isə bu cür suallarla dolaşdırmaq mümkün deyildi. Ona sualları verəndə, sanki, əvvəlcədən fikrimi oxuyur, 3-4 sual sonra nə soruşacağımı bilirdi. Və bütün çarpaz suallara əvvəl düşünür, analiz edir, sonra cavab verirdi. Məhkəmə boyunca bir dəfə də olsun onun verilən suala dərhal cavab verməsinin şahidi olmadım. Verilmiş suala cavab tapmadıqda, o ya təhqirə keçir, yaxud da gülə-gülə "cavab verməmək mənim hüququmdur" - deyirdi. Ola bilsin, o, yüksək savad sahibi deyildi, ancaq onun ağlı o iş üzrə bütün təqsirləndirilən şəxslərin bir yerdə olan ağlından daha üstün idi. Sanki, xüsusi hazırlıq keçmişdi.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

270.

17 декабря 1976 года народным судом гор.Сумгаита Григорян Э.Р. осужден по ст.207 ч.3 УК Азерб.ССР /особо злостное хулиганство/ к 3 годам лишения свободы условно, с испытательным сроком на 3 года, с передачей его коллективу Сумгаитской вспомогательной школы № 19 для исправления и перевоспитания.

т.28 л.д.73, 77-78

В связи с совершенным преступлением Григорян Э.Р. был взят на учет инспекцией по делам несовершеннолетних Сумгаитского ГОВД.

т.28 л.д.136

**Tərcümə:** *1976-cı il dekabrın 17-də E.R.Qriqoryan Sumqayıt Şəhər Xalq Məhkəməsi tərəfindən Azərb.SSR CM-nin 207-ci maddəsinin üçüncü hissəsi ilə (xüsusi qəddarlıqla xuliqanlıq) 3 il sınaq müddəti ilə 3 il şərti azadlıqdan məhrumetmə cəzasına məhkum olunmuş, onu islah olunmaq və yenidən tərbiyə edilmək üçün Sumqayıtdakı 19 №-li yardımçı məktəbin kollektivinə vermişdilər.*

*c.28 i.v. 73, 77-78*

*Törədilmiş cinayətlə əlaqədar E.R.Qriqoryan Sumqayıt şəhər DİŞ-in yetkinlik yaşına çatmayanların işləri üzrə inspeksiya tərəfindən uçota götürülmüşdür.*

*c.28 i.v. 136*

## QRİQORYANIN ROLU

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

I9.

Далее обвиняемый Ганджалыев Э.А. пояснил:

"... Рядом со мной оказалась женщина-водитель, которой Григорян Эдик первым нанес удар в лицо рукой. Одновременно с этим ее стали избивать другие участники нашей группы. Лично я нанес 3-4 удара рукой в область плеч женщине..."

т.23 л.д.323-333

**Tərcümə:** *Təqsirləndirilən E.A.Gəncəliyev daha sonra izahat verərək demişdir:*

*"...Birinci olaraq Qriqoryan Edikin əl ilə üzünə zərbə vurduğu sürücü qadın mənim yanımda idi. Eyni zamanda bizim qrupun digər iştirakçıları da həmin qadını döyməyə başladılar. Şəxsən mən qadının çiyin nahiyəsinə əlimlə 3-4 zərbə vurmuşam...".*

*c.23 i.v. 323-333*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

20.

Обвиняемый Мамедов Галиб Гадиршах оглы при предъявлении ему обвинения 22 февраля I989 года по данному эпизоду вину признал полностью и показал, что 28 февраля I988 года, примерно в I5 часов I5 минут он вышел из дома своего дальнего родственника Сафарова Низами и один пошел в город. Далее он пояснил:

"...После того, как выкрики прекратились, Григорян скомандовал: "Давай пошли за мной!" и вывел всех нас на перекресток дорог – улицы Мира и Дружбы..."

т.I8 л.д.23I-252

**Tərcümə:** *Təqsirləndirilən Məmmədov Qalib Qədirşah oğlu 1989-cu il fevralın 22-də, bu epizodla əlaqədar ona ittiham təqdim edilərkən, təqsirini tamamilə etiraf etmiş və göstərmişdir ki, 1988-ci il fevralın 28-də təxminən saat 15:15 dəqiqədə o, uzaq qohumu Səfərov Nizaminin evindən çıxmış və şəhərə tək getmişdir.*

*Daha sonra o, izahat verərək demişdir:*

*"...Qışqırtılar kəsiləndən sonra Qriqoryan: "Arxamca gəlin!", deyə əmr etdi və bizim hamımızı Sülh və Dostluq küçələrinin kəsişdiyi yol ayrıcına apardı".*

*c.18 i.v. 231-252*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

23.

Обвиняемый Сафаров Низами Сумбат оглы при предъявлении 20 февраля I989 года обвинения вину по данному эпизоду признал частично и пояснил, что 28 февраля I988 года примерно около I6 часов пришел в чайную, расположенную возле автовокзала гор.Сумгаита.

"...Там уже находились Наджафов Надир, Григорян Эдик, Гусейнов Вагиф, Гандкалыев Эльчин, Исаев Афсар и другие ребята, – показал далее Сафаров Н.С. – Я с Мамедовым подсел к ним...Пробыл в чайной я минут I5. Потом Григорян предложил встать... Григорян открыл дверь и потребовал документы у женщины, которая сидела за рулем. Женщина что-то отвечала. Я обошел Мамедова и подошел поближе в сторону водителя. Все двери автомашины были уже открыты... Когда пробрался то документы оказались уже у Григоряна. Документы были в красной обложке... Григорян крикнул, что это армяне и призвал их бить... Григорян стал вытаскивать женщину из машины, она сопротивлялась, кричала "мама"."

Т.I6 л.д.I90-208

**Tərcümə:** *Təqsirləndirilən Səfərov Nizami Sumbat oğlu 1989-cu il fevralın 20-də bu epizod üzrə ona ittiham elan edilərkən təqsirini qismən etiraf etmiş və izahat verərək bildirmişdir ki, 1988-ci il fevralın 28-də təxminən saat 16 radələrində o, Sumqayıt şəhər avtovağzalının yaxınlığında yerləşən çayxanaya gəlmişdir.*

*N.S.Səfərov ifadəsində daha sonra demişdir:*

*"...Nəcəfov Nadir, Qriqoryan Edik, Hüseynov Vaqif, Gəncəliyev Elçin, İsayev Əfsər və o biri uşaqlar artıq orada idilər... Məmmədovla mən onların yanında əyləşdik... Təxminən 15 dəqiqə çayxanada olmuşam... Sonra Qriqoryan ayağa qalxmağı təklif etdi... Qriqoryan maşının qapısını açdı və sükan arxasında əyləşən qadından sənədlərini tələb etdi. Qadın ona nə isə cavab verdi. Mən Məmmədovun yanından keçib sürücü tərəfə yaxınlaşdım. Avtomaşının bütün qapıları artıq açıq idi... Mən oraya çatanda sənədlər artıq Qriqoryanın əlində idi. Sənədlərin cildi qırmızı rəngdə idi... Qriqoryan qışqıraraq onların erməni olduqlarını dedi və onları döyməyə çağırdı... Qriqoryan qadını maşından sürüyüb salmağa başladı. Qadın müqavimət göstərir, "mama!" deyə qışqırırdı.*

*c.16 i.v. 190-208*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



32.

Свидетель Гейдаров Парвадикар Гусейн оглы – милиционер роты ППС Сумгаитского ГОВД по данному вопросу пояснил:

"...Лишь позже я понял, что, видимо, большинство, по крайней мере те, кто находился из толпы рядом со мной, были или пьяные, или под воздействием какого-то дурмана, глаза пустые, непонимающие, на все наши требования никакой реакции."

т.I л.д.213-222

**Tərcümə:** *Sumqayıt şəhər DİŞ post-patrul xidməti rotasının milisioneri şahid Heydərov Pərvərdigar Hüseyn oğlu bu məsələyə dair izahatında demişdir:*

*"...Mən yalnız sonradan başa düşdüm ki, bu adamların əksəriyyəti, ən azı kütlədə mənim yanımda olanlar ya sərxoş idi, ya da hansısa*

*uyuşdurucunun təsiri altında idi. Onların gözlərində bir boşluq vardı, heç nə başa düşmür, bizim bütün tələblərimizə heç bir reaksiya vermirdilər".*
*c.1 i.v. 213-222*

**Qeyd:** Bundan sonra mən bəzi hallarda cinayət işinin materialları əlimdə olmadığından, bu işin, xüsusilə, cinayət işinin materiallarında olan çoxsaylı videokasetlərin saxlanmadığına dair şübhələrim yarandığından, ümumilikdə bu cinayət prosesinin əhəmiyyətini, aktuallığını, tarix üçün vacibliyini nəzərə alaraq, məhkəmə prosesi zamanı iş dəftərimdə apardığım qeydləri nəzərinizə çatdıracam. Çox arzulayardım ki, heç olmasa kitab işıq üzü gördükdən sonra cinayət işinin materialları və videokasetlər tapıla və apardığım qeydlərin dəqiq və qərəzsiz olduğu təsdiqlənə.

**Şərh:** İğtişaş iştirakçılarının, sanki, özlərində olmaması halının səbəbi sonrakı ifadələrdə açılır. Belə ki, siz özünüz də ifadələrdən görəcəksiniz ki, bu hal Qriqoryanın iğtişaş iştirakçılarına həblər paylaması nəticəsində baş vermişdir. Məhkəmə prosesində bu halı təsdiqləyəcək ifadələrin videoyazıları nümayiş etdirildi ki, həmin videoyazıdan bəzi qeydləri mən öz dəftərçəmdə aparmışam. Bu videoyazılardan birində təqsirləndirilən şəxs İsayevlə Hüseynovun üzləşməsi əks olunmuşdu. İsayev ifadələrində aşağıdakıları bildirirdi:

Müəllifin prosesdəki qeydlərindən:


Том 23 л.д. 156-164 видео
„Эдик раздал всем таблетки, после употребления которых почувствовал прилив сил"

**Tərcümə:** *"Cild 23, iş vərəqi 156-164 Video*
*"Edik hamıya həb paylayırdı, hansının ki, qəbulundan sonra güc axınını hiss etdim".*

**Şərh**: Bu həblər onlara məhz bu məqsədlə verilirdi, həmin həbi qəbul etmiş bütün təqsirləndirilən şəxslər ondan sonra özlərini daha güclü, daha cəsarətli hiss etdiklərini qeyd edirdilər. Məhkəmə prosesində bu halı təsdiqləyən çoxlu sayda videokasetlər nümayiş etdirildi, lakin təkidlərimə baxmayaraq, bu hal da məhkəmənin sonuna qədər araşdırılmadı...

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



42.

После проведенных 7 и I5 июля I988 года между Исаевым А.И. и его родственниками очных ставок обвиняемый понял несостоятельность своего алиби, в связи с чем показал:

"...До настоящего времени я давал не до конца правдивые показания...Про изнасилование девушек я раньше стеснялся и боялся говорить...

Григорян Эдик начал насиловать эту девушку.

Затем Григорян Эдик схватил меня за шубу за плечо и подтолкнул меня к девушке, сказав: "Иди теперь ты попробуй!"

т.27 л.д.57-70, 86-98

**Tərcümə**: *1989-cu il iyulun 7-də və 15-də Ə.İ.İsayev və onun qohumları arasında aparılmış üzləşdirmədən sonra təqsirləndirilən şəxs alibisinin əsassız olduğunu başa düşmüş və bununla əlaqədar öz ifadəsində göstərmişdir:*

*“... Mənim indiyə qədər verdiyim ifadələr tam düz olmamışdır... Qızların zorlanması barədə danışmağa mən əvvəlcə utanır və qorxurdum...*

*Bu qızı zorlamağa Qriqoryan Edik başladı.*

*Sonra Qriqoryan Edik mənim şubamın çiynindən tutaraq məni qıza tərəf itələyib dedi: “Gəl, indi sən dadına bax!”.*

*c.27 i.v. 57-70, 86-98*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

46.

Истинная же причина отказа от своих признательных показаний по данному эпизоду усматривается из его же показаний от 16, 19 мая, 2, 7, 21 июня 1988 года, где обвиняемый Исаев А.И. показал:

"...29 февраля 1988 года примерно в 7 часов утра меня из дома забрали в отдел милиции города Сумгаита... Там, в коридоре, я и другие задержанные находились довольно долго... Мы все стояли в коридоре...имели возможность переговариваться друг с другом... Когда мы стояли в коридоре, то Григорян Эдик сказал мне, чтобы я на допросах не рассказывал о том, где был и что я видел 28 февраля, иначе у него есть много знакомых в колониях по всему Союзу и, если я буду говорить, то он меня из-под земли достанет и убъет... Надир /Наджафов/ угрожал мне, что если я расскажу на следствии про него, то он напишет письмо и мою семью убьют... В КПЗ мы попали в разные камеры и я никого не видел, но Надир через стенку спрашивал, не знаю ли я - отпустили Эдика или нет... После обеда 29 февраля меня отвезли в Баиловский изолятор... В одной камере со мной оказался и Наджафов Надир... Он опять угрожал мне и говорил, что если я расскажу, что они убили женщину, которой засунули трубу во влагалище, то он - Надир, напишет из тюрьмы письмо своим друзьям и те убьют мою семью. Надир также угрожал мне через стену во время прогулок в следизоляторе КГБ. Я хорошо знал, что Эдик Григорян и Наджафов Надир головорезы и могут действительно меня убить или мою семью... Все братья Григоряна законченные преступники и их все боялись. Наджафов Надир в этом похож на него... Поэтому я, боясь за своих родных, давал не совсем правдивые показания..."

т.26 л.д.131-136, 158-162, 192-201, 226-235, 227-276

**Tərcümə**: *Təqsirləndirilən Ə.İ.İsayevin bu epizod üzrə etiraf ifadələrindən imtina etməsinin həqiqi səbəbi isə onun 16, 19 may, 2, 7, 21 iyun 1988-ci il tarixli ifadələrindən görünür. Təqsirləndirilən Ə.İ.İsayev həmin ifadələrində demişdir:*

*“1988-ci il fevralın 29-da təxminən saat 7-də məni evdən Sumqayıt Milis şöbəsinə apardılar... Orada mən və saxlanılmış digər şəxslər uzun müddət dəhlizdə qaldıq... Biz hamımız dəhlizdə dayanmışdıq... bir-birimizlə söhbət etməyə imkan vardı... Biz dəhlizdə dayanan vaxt Qriqoryan Edik*

*mənə dedi ki, istintaq zamanı fevralın 28-də mənim harada olmağımı və nələr görməyimi söyləməyim, əks halda İttifaqın bütün koloniyalarında onun tanışları çoxdur və əgər mən danışsam, o məni yerin altından da olsa, tapıb öldürəcəkdir... Nadir (Nəcəfov) məni hədələyirdi ki, əgər mən istintaqda onun barəsində danışsam, o, məktub yazacaq və mənim ailəmi qıracaqlar... İlkin saxlama kamerasında biz müxtəlif kameralara düşdük və mən heç kimi görmədim, lakin Nadir divarın o tərəfindən məndən soruşurdu ki, bilmirsən, Ediki buraxıblar ya yox... Fevralın 29-da nahardan sonra məni Bayıl təcridxanasına apardılar... Nəcəfov Nadir də mənimlə bir kameraya düşdü... O, məni yenə hədələyərək deyirdi ki, əgər mən onların uşaqlıq yoluna boru soxduqları qadını öldürdüklərini söyləsəm, o, yəni Nadir həbsxanadan dostlarına məktub yazacaq və onlar mənim ailəmi qıracaqlar. Nadir DTK-nın istintaq təcridxanasında gəzinti zamanı da divarın o üzündən məni hədələyirdi... Mən yaxşı bilirdim ki, Edik Qriqoryan və Nəcəfov Nadir başkəsənlərdir və onlar həqiqətən məni və mənim ailəmi öldürə bilərlər... Qriqoryan qardaşlarının hamısı canidir və hamı onlardan qorxurdu. Nəcəfov Nadir də bu barədə onun tayıdır... Buna görə də mən qohumlarım üçün qorxduğumdan o qədər də düzgün olmayan ifadələr vermişəm..."*

*c.26 i.v. 131-136, 158-162, 192-201, 226-235, 227-276*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



57.

Обвиняемый Сафаров Низами Сумбат оглы в предъявленном ему 20 февраля 1989 года обвинении виновным себя по данному эпизоду признал частично и пояснил:

"...Григорян Эдик в этой квартире ударил ногой в бок хозяина, изнасиловал Людмилу и, если я не ошибаюсь, Карину, искал ценности, разбрасывая по сторонам ненужное."

т.16 л.д.190-209

**Tərcümə**: *Təqsirləndirilən Səfərov Nizami Sumbat oğlu 1989-cu il fevralın 20-də ona elan edilmiş ittihamda bu epizod üzrə özünü qismən təqsirli bilərək izahat vermişdir:*

*"... Qriqoryan Edik bu mənzildə ev sahibini ayağı ilə vurdu, Lyudmilanı və səhv etmirəmsə Karinanı da zorladı. O, mənzildə lazımsız şeylərin hərəsini bir tərəfə atır, qiymətli şeylər axtarırdı".*

*c.16 i.v. 190-209*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

79.

Свои показания потерпевшая Межлумян Р.А. подтвердила 23 сентября 1988 года на очной ставке с обвиняемым Григоряном Э.Р. и пояснила:

"... Именно этот мужчина в числе других погромщиков ворвался к нам в квартиру в период массовых беспорядков... Этого мужчину я ранее опознала по фотографии... Сидящий напротив меня... Григорян в числе других..., сломав дверь, ворвался к нам в квартиру, ...он меня избивал ножкой стула... Я видела его, как он в комнате, куда меня загнала толпа, насиловал мою дочь Карину..."

т.29 л.д.225-228

**Tərcümə:** *1988-ci il sentyabrın 23-də zərərçəkmiş R.A.Mejlumyan təqsirləndirilən E.R.Qriqoryanla üzləşdirmə zamanı öz ifadələrini təsdiqləyərək demişdir:*

*"... Kütləvi iğtişaşlar zamanı bu kişi başqaları ilə birlikdə bizim mənzilə soxulmuşdu. Mən bu kişini əvvəl də tanımışdım, fotoşəklinə əsasən... Mənimlə üzbəüz əyləşən Qriqoryan ... başqaları ilə birlikdə bizim mənzilin qapısını sındıraraq... içəriyə girmişdi. O məni stulun ayağı ilə döyürdü. Kütlə məni sıxışdırıb otağa salanda gördüm ki, o həmin otaqda mənim qızım Karinanı zorlayır".*

*c.29 i.v. 225-228*

**Şərh:** Bu prosesdə Qriqoryana hökm ancaq bu epizoddakı zorlama cinayətinin əsasında verildi. Hərçənd ki, məhkəmə prosesi zamanı nümayiş etdirilmiş çoxsaylı videokassetlərdə Qriqoryana verilmiş bütün ittihamlar öz təsdiqini tapır, onun dəstə başçısı olması, təqsirləndirilənləri onun idarə etməsi, göstərişləri onun verməsi, erməni ailələrinin siyahısının onda olması ifadələrdən, üzləşmələrdən açıq-aşkar görünürdü. Belə ki, videokassetlərdən bilinirdi ki, istintaq hərəkətləri tam sərbəst aparılır, iştirakçılar bir-birini ifşa edir, hərəkətlərini ört-basdır etmək istəyir, bu zaman bəzən bir-birilərini təhqir edir, bəzən biri digərinə yarınmaq istəyirlər. Qriqoryan bütün epizodlarda hamıya hədə-qorxu gəlir, bəzən isə onu ifşa edən zərərçəkmiş ermənilərə özünün də erməni olduğunu xatırladır. Əgər həmin videokassetlər qalmış olsa və bu gün nümayiş etdirilsə, yazdıqlarım heç kimdə şübhə doğurmaz. Videokassetlərin taleyindən xəbərim olmadığı üçün, onların nümayişi zamanı apardığım bəzi qeydləri sizin nəzərinizə çatdırmaq istərdim.

Müəllifin prosesdəki qeydlərindən:


Т. 2 л.д. 67-75 от 5 марта
78-79 от 9 марта.
По поведению Межлумян поняла, что это группа одна.
(Она называла группу Григоряна."

**Tərcümə:** "*Cild 2, iş vərəqi 67-75 5 martdan*
*78-79 9 martdan*
*Hərəkətlərindən Mejlumyan başa düşür ki, bu bir qrupdur (o, Qriqoryanın qrupu adlanırdı)"*

**Şərh:** Yuxarıda göstərdiyim qeydlər videoyazının nümayişində aparılıb. Sumqayıt hadisələri baş verdikdən sonra zərərçəkmiş ermənilərin bir qismi artıq Yerevanda idilər**. İstintaqı aparan SSRİ Prokurorluğu həmin dövrdə istintaq qrupunun üzvü olan V.Kaliniçenkonun rəhbərliyi ilə zərərçəkənlərlə tanınma aparmaq məqsədilə Sumqayıtda həbs olunmuş şəxslərin hamısının videogörüntüsünü Yerevana aparır.**

Nəzərinizə çatdırım ki, Vladimir İvanoviç Kaliniçenko 1979- cu ildən SSRİ Baş prokuroru yanında mühüm işlər müstəntiqi olmuş və işlədiyi dövrdə SSRİ-də ən problemli cinayət işlərinin istintaqını aparmış, daim professionallığı ilə fərqlənmişdir. Hal-hazırda V.Kaliniçenko Rusiyanın ən məşhur vəkillərindən biridir.


SSRİ Prokurorluğunun mühüm işlər üzrə müstəntiqi V.İ. Kaliniçenko

Beləliklə, Mejlumyan bacıları ilə Ermənistan prokurorluğunda aparılan tanınmada həmin bacılara həbs olunanlar bir-bir nümayiş etdirildikcə, onları tanıyıb-tanımadıqlarını söyləyirdilər. Bəzilərinə "bu vardı", bəzilərinə "bu yox idi", başqa bir qisminə "bu, ola bilsin, var idi, ola bilsin, yox" deyə reaksiya verirdilər. Lakin növbə Qriqoryana çatdıqda həmin bacılar onun olduğunu və əsas fiqurun elə o olduğunu dərhal və çox böyük həyacanla bildirirdilər. ***Burada çox vacib bir məqama diqqət yetirmək lazımdır ki, Mejlumyan bacıları Qriqoryanı Yerevan Prokurorluğunda erməni müstəntiqlərin iştirakı və SSRİ Prokurorluğunun rəhbərliyi ilə keçirilən tanınmada tanıyırlar. Bundan başqa, həmin qrupa rəhbərlik edənin Qriqoryan olması məhz zərərçəkmiş***

***ermənilər tərəfindən, məhz Ermənistanda bildirilir və bu tanınmanı azərbaycanlılar deyil, məhz rus və erməni milliyyətindən olan istintaq qrupunun üzvləri aparırlar. Elə bu tanınmada Qriqoryan yalvarır ki, o da ermənidir, onun adını çəkməsinlər. İş üzrə mövcud olan videokasetlərin tapılıb bütün dünyaya çatdırılması üçün elektron versiyada internetə yerləşdirilməsi tarix üçün əvəzsiz olardı. Yəni bu gün heç kim azərbaycanlıları erməniləri şərləməkdə və yaxud istintaqın qərəzli aparılmasında ittiham edə bilməz!!!*** Dediklərimi bir daha təsdiq edən ittihamnamənin aşağıdakı hissəsini də diqqətinizə çatdırmaq istəyirəm:

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

8I.

О действиях обвиняемого Григоряна Э.Р. в их квартире потерпевшая Межлумян Л.Г. пояснила 29 августа 1988 года и 9 марта 1988 года следующее:

"... Когда меня насиловали, я не раз теряла сознание... Когда очнулась, то увидела, что лежу опять на кровати, матраца не было, подушка лежала на полу, под моими ногами, ноги были свешены с кровати на пол, а на мне лежал опознанный мною Григорян Эдуард Робертович, которого я опознала уверенно. Лежа на мне, он совершал со мной половой акт обычным способом, это я хорошо чувствовала... при этом меня кто-то держал за левую ногу и отводил в сторону. Я хорошо видела лицо Григоряна, он что-то говорил мне на русском языке, по его лицу я подумала, что он лезгин. Половой акт Григорян со мной совершал в течение 5-10 минут, при этом я чувствовала лишь боль. Также я заметила, что Григорян был очень бледен. На его руке, какой именно, не помню, на кисти руки я заметила наколку синего цвета, слово то ли "Рита", то ли "Рима", точно не помню. Закончив половой акт... он встал с меня..., подтянул брюки и вышел из комнаты. По счету Григорян, мне кажется, насиловал меня пятым из тех, кого я видела или чувствовала, что на мне лежат и совершают половой акт..."

т.2 л.д.76-77, 92-93

Из протокола освидетельствования обвиняемого Григоряна Э.Р., проведенного I декабря 1988 года, усматривается, что в области правой кисти обвиняемого Григоряна Э.Р. между большим и указательным пальцами имеется надпись "Рита" длиной 2 см. высотой 0,5 см., исполненная синим красителем.

т.28 л.д.20-22

**Tərcümə:** *Zərərçəkmiş L.Q.Mejlumyan təqsirləndirilən E.R.Qriqoryanın onların mənzilində etdiyi hərəkətlər barəsində 1988-ci il avqustun 29-da və 1988-ci il martın 9-da aşağıdakı izahatı vermişdir:*

*“... Onlar məni zorlayanda mən dəfələrlə huşumu itirdim... Özümə gələndə gördüm ki, yenə çarpayıda uzanmışam, döşək yox idi, yastıq döşəməyə, mənim ayaqlarımın altına düşmüşdü. Mənim ayaqlarım çarpayıdan sallanmışdı, mənim üstümdə isə Qriqoryan Eduard Robertoviç uzanmışdı. Mən onu dəqiq tanımışam. O, mənim üzərimdə uzanaraq mənimlə adi üsulla cinsi əlaqəyə girirdi. Mən bunu yaxşı hiss edirdim... Lakin bu zaman kimsə mənim sol ayağımı tutub aralayırdı. Mən Qriqoryanın sifətini yaxşı görürdüm. O mənə rus dilində nə isə deyirdi, onun üzünə baxanda fikirləşdim ki, ləzgidir. Qriqoryan mənimlə 5-10 dəqiqə müddətində cinsi əlaqədə olmuşdu. Bu zaman mən yalnız ağrı hiss edirdim. Mən onu da gördüm ki, Qriqoryanın rəngi ağappaqdır. Onun əlində, hansı əlində olması yadımda deyil, biləyində göy rəngli döymə üsulu ilə ya “Rita” ya da “Rima” sözü yazılmışdı, dəqiq yadımda deyil. O, cinsi əlaqəni başa çatdırandan sonra... mənim üstümdən qalxdı..., şalvarını çəkdi və otaqdan çıxdı. Mənə belə gəlir ki, mənim üzərimdə uzandıqlarını və mənimlə cinsi əlaqədə olduğunu gördüyüm və ya hiss etdiyim adamlar arasında Qriqoryan, gərək ki, sayca beşinci idi...”.*

*c.2 i.v. 76-77, 92-93*

*Təqsirləndirilən E.R.Qriqoryanın 1 dekabr 1988-ci ildə aparılmış müayinə protokolundan aydın olur ki, onun sağ bilək nahiyəsində, baş barmağı ilə şəhadət barmağı arasında göy rəngli mürəkkəblə döyülmüş, uzunluğu 2 sm, hündürlüyü 0,5 sm olan “Rita” sözü yazılmışdır.*

*c.28 i.v. 20-22*



Потерпевшая Меджлумян Л. Г. опознает обвиняемого Григоряна Эдуарда Робертовича.

Müəllifin prosesdəki qeydlərindən:


Меджлумян Люда
Т. 2. л.д. 83-103
„Хорошо увидела Григоряна. Он был бледный. Я подумала, что он лезгин. На руке было написано „Рима" или „Рита".
[illegible], Назарян
гор. Ереван.
стр. 218-224 I 13
Протокол для опознания.
Меджлумян.
Опознала
— он. Он был нас
№3. — 28.02. находились в [illegible] кухне. он насиловал меня, [illegible] в комнате, разбил стекло. Сначала он стоял. Потом ему сказали, чтобы он не стоял.
№5 опознала — Григоряна. Я его хорошо запомнила. Предупреждал всех нас убивать. Страшный был, самый активный. Он насиловал меня. Сестру не видела? Он был в самой первой группе
[illegible], отличались от всех. Он был светлее на руках татуировка. Он гов. на азерб. языке. Страшно был [illegible]. Стоял или нет не знаю

**Tərcümə***:* *“Mejlumyan Lyuda*

*Cild 2. i.v. 83-103*

*“Qriqoryanı yaxşı gördüm. Onun sifəti solğun görünürdü. Mən elə bildim, o ləzgidi. Əlində ya “Rima” ya da “Rita” yazılmışdı.”*

*Lukeriç, Nazaryan*
*Yerevan şəhəri*

*Səh. 218-224 I 13*
*Tanınma günü protokolu*
*Mejlumyan*
*Tanıdı*
*-o, o döyürdü bizi.*
*№3 -28.02 mənzildə idi. Bacım Karinanı və məni zorlayırdı, otağı dağıdırdı, şüşəni sındırdı. Əvvəlcə o dururdu. Sonra ona dedilər ki, durmasın.*

*№5 dərhal tanıdı --- Qriqoryanı. Hamıdan fərqlənirdi ,o daha ağ idi, əlində tatuirovka var idi. Azərbaycan dilində danışırdı. Ayaqları ilə dəhşətli şəkildə döyürdü. Sındırıb sındırmadığını bilmirəm.*
*Mən onu yaxşı yadımda saxlamışam. Hamını bizi öldürməyə səsləyirdi. Dəhşətli şəkildə döyürdü, ən fəalı idi. O, məni zorlayırdı. Bacımı görməmişdim. O, ən birinci qrupda idi."*

**Şərh:** Mən bu qeydləri videoyazının məhkəmədə nümayişi zamanı apardığıma görə fikirlər tam anlaşılmaya bilər. Bu səbəbdən mən şərhə ehtiyac duyulan məqamlarda fikirlərimi izah etməyə çalışacam. Yuxarıdakı qeydlərdən görünür ki, Mejlumyanlarla tanınma Yerevanda, müstəntiqlər Lukeriç və Nazaryanın iştirakı ilə olur və tanınmada bacıların hər ikisi onu yaxşı yadlarında saxladıqlarını, ağbəniz olduğunu, buna görə ləzgiyə oxşatdıqlarını, məhz Qriqoryanın ən aktiv olduğunu, hamını onları öldürməyə Qriqoryanın səslədiyini, hətta onun Azərbaycan dilində danışdığını qəti bildirirlər. Çox vacib olan bir detalı nəzərinizə çatdırım. L. Mejlumyan 9 mart və 29 avqust 1988-ci il tarixli ifadələrində istintaqa bəlli olmayan bir məqama diqqət yetirərək bildirir ki, Qriqoryanın sağ və ya sol əlində "Rima" və ya " Rita" sözləri yazılmışdır. Bundan sonra, istintaqçılar Qriqoryanın bədənində müayinə aparır və müəyyən edirlər ki, həqiqətən, onun sağ bilək nahiyyəsində baş barmaqla şəhadət barmağı arasında "Rita" sözləri yazılmışdır. Bu cür detallar cinayət işinin materiallarında onlarladır.

Kitabın birinci hissəsində mən maksimum ittiham aktından kənara çıxmaq istəməsəm də, bəzi halları nəzərinizə çatdırmaq məcburiyyətindəyəm. 1989-cu ilin 23 sentyabrında Ermənistan SSR-nin maarif-tarixçi cəmiyyəti "Huşamatyan" Yerevan şəhərində Arxitektorlar Evində 300 nəfərin , o cümlədən xarici jurnalistlərin iştirakı ilə Sumqayıt hadisələrinə siyasi qiymət vermək üçün "Sumqayıt, Soyqırım, Aşkarlıq" adı altında mətbuat konfransı keçirirlər. Sonradan həmin mətbuat konfransındakı çıxışlar 9 nəfərin başçılığı altında Ermənistan SSR "Bilik" cəmiyyəti tərəfindən toplu şəklində 1989-cu ildə çap olunub. Həmin material rus, ingilis dillərinə

tərcümə edilərək bir neçə saytda yerləşdirilib. Bu topluda olan materiallara mən irəlidəki bölmələrdə qayıdacam. İndi isə nəzərinizə, konfransdakı çıxışçıların içində ən uzun nitqi ilə yadda qalan publisist Samvel Şaxmurad-yanın dediklərini çatdırmaq istəyirəm: "Artıq Ermənistanda heç kimi təəccübləndirmir ki, Azərbaycan EA-nın akademiki Z.Bünyadovun "Niyə Sumqayıt" tipli absurd mülahizələr və yalanla dolu məqalələrində təəssüf və peşmançılıqla bağlı iki sözlük yer də ayrılmayıb. Əvəzində ermənilər mazaxist, "Sumqayıtı uyduranlar" elan olunmuşlar, hətta Sumqayıtda ermə-nilərin ermənilər tərəfindən qətlə yetirildikləri barədə fikirlər eşitməyə məcbur oluruq". Onun çıxışından sonra da konfrans antiazərbaycan ruhunda davam edir. Hərçənd ki, konfrans iştirakçılarının əksəriyyəti Z. Bünyadovun kimliyini bilirdi. Onun 2 dəfə Sovet İttifaqı Qəhrəmanı adı alması, kobudluğuna görə komandirini döydüyü üçün həmin adın birindən məhrum olunması barədə SSRİ-də rəvayətlər gəzirdi. Onun alim kimi adı isə hamıya bəlli idi. Z.Bünyadovun dediklərinin absurd, yalan olmaması konfransın sonunda bəlli olur. Ancaq təşkilatçılar buna da don geyindirməyə çalışırlar. Belə ki, adı qeyd olunmayan bir nəfər sual verir:

Sual: "Doğrudur ki, Sumqayıt iğtişaşçıları arasında bir nəfər erməni olub?"

Şahmuradyan: "Doğrudur. Söhbət Eduard Qriqoryandan gedir. Azər-baycanda onun barəsində eşidəndə şad oldular və indi Sumqayıt haqqında danışılarkən, onun adını birinci plana çıxarırlar. Bu, çox rahat dəlildir. Kimdir Qriqoryan və hansı yolla o qatillər və zorakılar arasında peyda olmuşdur? Onun atası erməni, anası rusdur. İki dəfə məhkum edilmişdir. Lyudmila Mejlumyanın ifadəsinə görə, 27 fevral axşam Qriqoryanın yanında onunla bir yerdə həbsxanada yatan bir neçə şəxs gəlib və deyiblər ki, "Sabah ermənilərin üstünə gedirik. Saat 3-də səni avtovağzalın yanında gözləyirik". O, etiraz etməyə başlayıb. Ona deyiblər ki, "Əgər gəlməsən, öldürəcəyik". Və Qriqoryan da onlarla gedib.

Göründüyü kimi, konfrans təşkilatçıları Qriqoryanla bağlı mükəm-məl məlumata malikdirlər və hətta cinayət işinin materiallarını da dəqiqliyi ilə bilirlər. Qriqoryanın anasının rus olmasını, ancaq 33 cild, 12 min səhifədən artıq olan cinayət işinin materiallarını diqqətlə oxuyanlar görə bilərdilər. Çünki həmin cinayət işinin yalnız bircə yerində anasının rus olması barədə məlumat verilir. Onun erməni olmasını zərərçəkən Mejlum-yan belə, ancaq üzləşmə zamanı bilir. Mejlumyanın bunu öyrəndiyi şərait də kifayət qədər maraq doğurur. Belə ki, özüm də daxil olmaqla, proses iştirak-çılarının hamısı üzləşmə videoyazılarının nümayişi zamanı Qriqoryanın

Mejlumyanın qarşısında alçalaraq, özünün də erməni olduğunu, buna görə onun üzünə durmaması üçün Mejlumyana necə yalvarmasının şahidi olmuşuq. Mejlumyan yalnız həmin üzləşmədən sonra Qriqoryanın erməni olmasını öyrənir. Buna baxmayaraq, onu ifşa edir. Həmçinin zərərçəkənlər Yerevanda olanda müstəntiq Kaliniçenko tərəfindən aparılan və videolentə alınan tanınma zamanı da Mejlumyan Qriqoryanı tanıyır, Yerevanda, öz millətindən olan digər müstəntiqlərin də yanında Mejlumyan Şahmuradyanın "nağılından" söhbət belə açmır. Qriqoryanın Petrosyanla üzləşməsi zamanı, Petrosyan onu ifşa edəndə, Qriqoryan ancaq ona məxsus azğınlıqla deyir: "Onun indi belə cəsarətli olmasına baxmayın, evində dovşan kimi idi". Həmin epizod saytlarda videoyazı şəklində var. Ona baxmaq kifayətdir ki, erməni millətçilərinin yalanı necə də məharətlə deməsinə məəttəl qalasan.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:


IIO.

Обвиняемый Наджафов Надир Ахмедхан оглы в предъявленном ему обвинении 24 февраля 1989 года виновным себя по данному эпизоду не признал и показал:

"... Григорян Эмму, голую, предложил вывести из квартиры на улицу Григорян Эдик. Когда Эмму выводили из подъезда, Сафаров Низами в прыжке ударил ее по спине ногой. Она упала и больше не смогла подняться. Эмму поволокли немного подальше от подъезда бросили на землю, стали избивать ногами по разным частям тела. Кроме других, Григорян Эмму ногами били Сафаров Низами, Исаев Афсар и Эдик Григорян. Григорян Эдик предложил ввести Григорян Эмме во влагалище металлическую трубу.

т.22 л.д.242-247

**Tərcümə:** *Təqsirləndirilən Nəcəfov Nadir Əhmədxan oğlu 1989-cu il fevralın 24-də ona elan edilmiş ittihamda bu epizod üzrə özünü təqsirkar hesab etməyərək ifadəsində demişdir:*

*"... Qriqoryan Emmanı çılpaq halda mənzildən küçəyə çıxarmağı Qriqoryan Edik təklif etmişdi. Emmanı blokdan çıxaranda Səfərov Nizami tullanaraq ayağı ilə onun belinə zərbə endirdi. O yıxıldı və daha ayağa qalxa bilmədi. Emmanı sürüyüb blokdan bir qədər uzağa yerə atdılar, onun*

*bədəninin müxtəlif hissələrinə təpiklə vurmağa başladılar. Qriqoryan Emmanı təpiklə vuranlar arasında başqaları ilə bərabər, Səfərov Nizami, İsayev Əfsər və Edik Qriqoryan da vardı. Qriqoryan Edik Qriqoryan Emmanın uşaqlıq yoluna metal boru soxmağı təklif etdi".*

c.22 i.v. 242-247

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



I20.

Обвиняемый Гусейнов Вагиф Вахабали оглы в предъявленном ему 22 февраля I989 года обвинении по данному эпизоду виновным себя в избиении и умышленном убийстве Григорян Э.Ш. признал. О преступлениях, совершенных в отношении Григорян Э.Ш., пояснил следующее:

"...В это время я находился рядом с Эммой, которая валялась на земле. С Исаевым я согласен не был, Григорян Эмму я убивать не хотел. Однако, ввиду того, что я находился рядом с ними, в изнасиловании участия не принимал, Сафаров и Исаев предложили, чтобы во влагалище Григорян Эммы трубу ввел именно я, а не Григорян Эдик, собиравшийся сделать это сам. Окружившая Григорян Эмму и нас толпа стала требовать, чтобы я скорее осуществил это решение. Григорян Эдик поднял над моей головой свой топор и стал торопить меня.

Я хотел нанести ей легкое телесное повреждение и то, только для того, чтобы Григорян Эдик, Сафаров Низами и другие оставили меня в покое..."

т.20 л.д.307-320

**Tərcümə:** *Təqsirləndirilən Hüseynov Vaqif Vahabəli oğlu 1989-cu il fevralın 22-də ona təqdim edilmiş bu epizod üzrə özünü E.Ş.Qriqoryanın döyülməsində və qəsdən öldürülməsində təqsirkar bilmişdir. O, E.Ş.Qriqoryana qarşı törədilmiş cinayətlər barəsində izahatında aşağıdakıları göstərmişdir:*

*"...Bu vaxt mən yerdə çabalayan Emmanın yanında idim. Mən İsayevlə razı deyildim, mən Qriqoryan Emmanı öldürmək istəmirdim. Lakin mən də onların yanında olduğum və zorlamada iştirak etmədiyim üçün Səfərov və İsayev təklif etdilər ki, Qriqoryan Emmanın uşaqlıq yoluna boru soxmağa hazırlaşan Qriqoryan Edikin əvəzinə bunu məhz mən edim. Qriqoryan Emmanı və bizi mühasirəyə almış kütlə tələb etməyə başladı ki, mən bu qərarı tezliklə həyata keçirim. Qriqoryan Edik baltasını başımın üstünə qaldırıb məni tələsdirməyə başladı.*

*Mən Emmaya yüngül bədən xəsarəti yetirmək istəyirdim, bu da yalnız ona görə ki, Qriqoryan Edik, Səfərov Nizami və başqaları məni rahat buraxsınlar...”.*

*c.20 i.v. 307-320*

**Şərh:** Hörmətli oxucu, bu dəhşətli cinayət epizodu barədə hələ Stavropol diyarında SSRİ xalq deputatları Sovetinin qurultayını izləyərkən, deputatlar İqityan, Starovoytova, Xanzadyanın çıxışlarından, akademik Saxarovun həyat yoldaşı Alixanyan-Bonner və digərilərinin mərkəzi mətbuatdakı yazılarından eşitmişdim. Ancaq onlar baş verən faciənin əsas təşkilatçısı barədə bir söz demir, bu cinayəti bütünlükdə Azərbaycan xalqının adına çıxırdılar. Bu erməni millətçilərinin sınaqdan keçmiş üsuludur. Bu gün onların uydurduğu, dünya mətbuatında yer almış, guya, Hitler tərəfindən alman əsgərlərinə deyilmiş belə bir fikri var: “Yəhudiləri öldürün, türklərin vaxtilə bir milyon yarım ermənini öldürməsi kimlərin yadındadır ?” Hitler bu sözləri heç vaxt deməyib. Sonralar ABŞ və Avropa alimləri Hitlerin əlyazamalarına qədər axtarsalar da, bu ifadəni tapa bilməyiblər. Bu ifadə onlara özlərinin uydurduğu “milyon yarım”ı beyinlərə yeritmək üçün lazım idi. Siz özünüz SSRİ prokurorluğunun müəyyən etdiyi faktı rəsmi sənədlərdən görürsünüz. Bu cinayəti Qriqoryan özü törətməyə hazırlaşır, lakin sonda balta ilə hədə-qorxu gələrək, V. Hüseynovu bu dəhşətli cinayəti törətməyə məcbur edir.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



I44.

Обвиняемый Наджафов Н.А. 24 февраля I989 года на допросе об обстоятельствах изнасилования и убийства Григорян Э.Ш. показал:

"...Григорян Эмму голую предложил вывести из квартиры на улицу Григорян Эдик: ...Григорян Эдик предложил ввести Григорян Эмме во влагалище металлическую трубу..."

т.22 л.д.242-247

**Tərcümə:** “*Təqsirləndirilən N.A.Nəcəfov 1989-cu il fevralın 24-də E.Ş.Qriqoryanın zorlanması və öldürülməsi şəraiti barədə istintaqda*

*ifadəsində demişdir:*

*“...Qriqoryan Emmanı çılpaq halda mənzildən küçəyə çıxarmağı Qriqoryan Edik təklif etdi. Qriqoryan Emmanın uşaqlıq yoluna metal boru soxmağı Qriqoryan Edik təklif etdi...”.*

*c.22 i.v. 242-247”*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



150.

Обвиняемый Гусейнов В.В. на допросе 22 февраля 1989 года показал:

"...В это время Исаев Афсар второй раз призвал ребят убить Григорян Эмму... Сафаров и Исаев предложили, чтобы во влагалище Григорян Эммы трубу ввел имен но я, а не Григорян Эдик, собирающийся это сделать сам... Григорян Эдик поднял над моей головой свой топор и стал торопить меня... Стали меня уговаривать... я полученной от Григоряна Эдика трубой ударил Григорян Эмму, целясь в середину ее полового органа, при этом ее ноги были приподняты и раздвинуты Сафаровым и Исаевым. В то время, когда я наносил удар трубой, Григорян Эдик держал Эмме одну руку, прижав ее ногой к земле..."

т.20 л.д.305-320

**Tərcümə:** *Təqsirləndirilən V.V.Hüseynov 1989-cu il fevralın 22-də dindirmə zamanı verdiyi ifadəsində demişdir:*

*“...Bu vaxt İsayev Əfsər uşaqlara ikinci dəfə təklif etdi ki, Qriqoryan Emmanı öldürək... Səfərov və İsayev təklif etdilər ki, Qriqoryan Emmanın uşaqlıq yoluna boru soxmağa hazırlaşan Qriroqyan Edikin əvəzinə bunu məhz mən edim... Qriqoryan Edik baltasını başımın üstünə qaldırıb məni tələsdirməyə başladı... Məni dilə tutmağa başladılar. Mən Qriqoryan Edikdən aldığım borunu Qriqoryan Emmanın cinsiyyət orqanının ortasına tuşlayıb onu boru ilə vurdum. Bu zaman Səfərov və İsayev onun ayaqlarını qaldırıb aralamışdılar. Mən Emmanı boru ilə vuranda Qriqoryan Edik onun bir qolundan tutaraq ayağı ilə yerə sıxmışdı...”*

*c.20 i.v. 305-320*

**Şərh:** Sumqayıt hadisələrində ən dəhşətli cinayət epizodu məhz, təxminən, 60 yaşı olan Emma Qriqoryanın başına gətirilən vəhşiliklərdir. Qriqoryanın təhriki ilə E.Qriqoryan cinayətkar qrup tərəfindən zorlandıqdan sonra yenə onun təhriki və hədə qorxusu ilə işgəncələrə məruz qalır.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

206.

Обвиняемый по делу Мамедов Г.Г. при предъявлении ему обвинения 22 февраля 1989 года показал:

"...Эдик сказал, что он живет в этом микрорайоне и знает, где проживают армяне.

т.18 л.д.238-252

**Tərcümə:** *Təqsirləndirilən Q.Q.Məmmədov 1989-cu il fevralın 22-də ona ittiham təqdim edilərkən verdiyi ifadəsində demişdir:*

*"... Edik dedi ki, o həmin mikrorayonda yaşayır və ermənilərin harada yaşadıqlarını bilir".*

*c.18 i.v. 238-252*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

213.

21 ноября 1988 года и 10 января 1989 года обвиняемый Наджафов Н.А. дал аналогичные показания, однако, уже отрицал, что искал ценности в квартире:

"...Хорошо помню, что в это время Григорян Эдик был вооружен топором. Поднявшись на 5 этаж, ребята стали ломать двер одной из квартир... Дверь данной квартиры я не ломал. Когда дверь была взломана одним из первых в квартиру ворвался Григорян Эдик и обухом имевшегося у него топора ударил вышедшего ему навстречу армянина.

т.22 л.д.271-275, 276-289

**Tərcümə:** *Təqsirləndirilən N.A. Nəcəfov 21 noyabr 1988-ci ildə və 10 yanvar 1989-cu ildə oxşar ifadələr vermiş, lakin mənzildə qiymətli şeylər axtardığını artıq inkar etmişdir:*

*“...Yaxşı yadımdadır, bu vaxt Qriqoryan Edik balta ilə silahlanmışdı. Uşaqlar 5-ci mərtəbəyə qalxıb mənzillərdən birinin qapısını sındırmağa başladılar. Həmin mənzilin qapısını mən sındırmamışam. Qapı sındırılandan sonra mənzilə ilk növbədə soxulanlardan biri Qriqoryan Edik idi. O, əlindəki baltanın küpü ilə qarşısına çıxan erməniyə zərbə endirdi”.*
*c.22 i.v. 271-275, 276-289*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

230.

С целью выявления других участников нападения на квартиру Петросяна 22 января 1989 года потерпевшему Петросяну М.Ш. был продемонстрирован видеофильм с видеозаписью обвиняемых по уголовному делу № 18/60206-88. Потерпевший подтвердил свои показания в отношении обвиняемого Григоряна Э.Р. и показал:

"...Я узнал этого человека... Это Григорян Эдуард. В нашу квартиру он пришел 28 февраля 1988 года. Сначала они сломали дверь. У Григоряна в руках был топор, которым он замахнулся на меня. В этот момент я его ударил молотком по руке. Топор в руке Григоряна провернулся и ударил меня обухом по голове. У меня пошла кровь. Я упал на пол и потерял сознание. Григорян бил меня топором по голове один раз..."

т.12 л.д.55-57

**Tərcümə:** *Petrosyanın mənzilinə hücumun digər iştirakçılarını aşkar etmək məqsədilə 1989-cu il yanvarın 22-də 18/60206-88 №-li cinayət işi üzrə təqsirləndirilən şəxslərin videoyazısı olan videofilm zərərçəkmiş M.Ş.Petrosyana göstərilmişdir. Zərərçəkən təqsirləndirilən E.R.Qriqoryan barəsində öz ifadələrini təsdiqləyərək demişdir:*

*“...Mən bu adamı tanıdım... Bu, Eduard Qriqoryandır. 1988-ci il fevralın 28-də bizim mənzilə gələn o idi. Onlar əvvəlcə qapını sındırdılar. Qriqoryanın əlində balta vardı. O, balta ilə məni vurmaq istəyirdi. Bu vaxt mən çəkiclə onun əlinə zərbə endirdim. Qriqoryanın əlindəki balta çevrildi və o, baltanın küpü ilə mənim başıma vurdu. Məni qan apardı. Döşəməyə*

*yıxıldım və huşumu itirdim. Qriqoryan mənim başıma balta ilə bir dəfə zərbə vurmuşdur...”.*

*c.12 i.v. 55-57*




Потерпевший Петросян М. Ш. опознает обвиняемого Григоряна Э. Р.



Zərərçəkmiş Petrosyan Qriqoryanı tanıyır.

Müəllifin prosesdəki qeydlərindən:


19.09.
Оглашение видео Ганджа.
(Трубовская явилась 11^30 часов)

и видел Сафарова, Мамедова, Григоряна
Надира, Вагифа, Исаева
и Григорян раздавал таблетки. Я принял
2 таблетки. После таблеток я стал сильным.
В начале 17 час вышел к перекрестку
Мир Дружбы, остановил москвич,
ехавший со стороны гор. Баку. За рулем
сидела женщина. Там же была девушка,
мужчина в очках.
Я лично 3-4 раза ударил женщину.
Потом пошел в дом 17/33 5 этаж
Группу направлял Григорян

**Tərcümə***: “19.09.*

*Gəncəliyevin videosunun nümayişi.*

*(Trubovskaya 11-30-da gəlir)*

*“Səfərovu, Məmmədovu, Qriqoryanı, Nadiri, Vaqifi, İsayevi gördüm.”*

***“Qriqoryan həb paylayırdı. Mən 2 həb qəbul etdim. Həblərdən sonra mən güclü oldum.***

*Saat 17 radələrində “Mir” və “Drujba”dakı yol kəsişməsinə çıxdım. Bakı şəhəri tərəfdən gələn “Moskviç”i saxladım. Sükan arxasında qadın oturmuşdu. Orada bir qız və eynəkli bir kişi də var idi.*

*Mən şəxsən 3-4 dəfə qadını vurdum. Sonra 17/33 saylı evin 5-ci mərtəbəsindəki mənzilə getdim.*

***Qrupu Qriqoryan yönləndirirdi****”.*

**Şərh:** Trubovskaya vəkildir. Nə üçün məhz onun gecikməsini dəftərimdə xüsusi qeyd etməyim barədə sonradan daha ətraflı məlumat verəcəm. Hələlik isə onu bildirim ki, prosesin müəyyən bir dönəmində Trubovskayanın vəkilliklə yox, prosesi pozmaqla məşğul olduğunu hiss etdim və ona xüsusi diqqət yetirməyə başladım.

Təqsirləndirilən Gəncəliyevin videoyazısından apardığım qeydlərdən də görünür ki, Qriqoryanın həb payladığını, qrupu Qriqoryanın yönləndirdiyini Gəncəliyev də təsdiqləyir.

Müəllifin prosesdəki qeydlərindən:


Очная ставка сл. Лукерич, Митников
Исаев — Григорян
Т. 29 л.д. 199-207.
«Григорян достал листок бумаги и посмотрел»
«Низами это третий или четвертый»
28.02 хотел пойти в магазин около спутника увидел людей.
Григорян начал хвалиться
Надир сказал посмотреть в свою бумагу.
«Достал клетчатый листок бумаги, на котором были цифры.
[illegible]

**Tərcümə:** *“Üzləşmə                Müstəntiq Lukeriç, Mitnikov*

*İsayev—Qriqoryan*

*C.29, i.v. 199-207*

*“Qriqoryan kağız vərəqi çıxarıb baxdı”.*

*“Nizami, bu üçüncüdü, ya dördüncü?”*

*28.02 mağazaya getmək istəyirdim sputnikin yanında adamlar gördü.*

*Qriqoryan lovğalanmağa başladı.*

*Nadir kağızına baxmağını söylədi.*

*“Dama-dama kağız parçası çıxartdı, hansının ki, üzərində rəqəmlər var idi”.*

*“Qriqoryan dedi-“Batalyon, ardımca”. Heç kim getmədi. Onda o, dedi: - “nədi qorxursunuz”.*

*Qriqoryan kişini balta ilə vurdu və soruşdu: “Nizami, üçüncüdü, ya dördüncü”.*

*Nizami dedi: “üçüncüdü Edik-can”. Blokdan biz tez getdik. “Edik dedi, ilanlar, hara gedirsiz” .*

**Şərh:** Dəfələrlə qeyd etdiyim “bu, üçüncüdü, ya dördüncüdü?” məsələsinə aydınlıq gətirmək istəyirəm. Daha əvvəl Petrosyan epizodunda rast gəldiniz ki, Qriqoryan zərərçəkən Petrosyanı öldürmək məqsədilə, başından balta ilə vurur. Zərbədən Petrosyan huşunu itirir, Qriqoryan isə onun öldüyünü düşünüb vurmağa davam etmir. Məhz həmin epizodda Qriqoryan Nizamidən neçənci adamı öldürdüyünü soruşur: - “üçüncü, ya dördüncü?” Yəni, təqsirləndirilənlər ifadə verib, Qriqoryanın bir neçə adamı öldürdüyünü təsdiq edirlər. Lakin bu ifadələrə cinayət işinin materiallarında dəfələrlə rast gəlinsə də, istintaq buna da əhəmiyyət vermir.

Müəllifin prosesdəki qeydlərindən:



**Tərcümə:** *“C. 20 i.v. 92 İsayevlə Hüseynovun üzləşmə protokolu*

*İsayevin ifadələri.*

*Edik mənə danışdı ki, onlar artıq ermənilərin mənzillərinə gediblər, onları soyub, zorlayıb və öldürüblər... Qriqoryan Edik cibindən hansısa siyahı çıxartdı, ona baxdı və mənim yanımda yerləşən bir qrupu binaya tərəf ardınca apardı.*

*C.23. i.v. 156-164 Video*

*"Edik hamıya həb payladı, hansının ki, qəbulundan sonra güc axınını hiss etdim".*

*"Edik hamını ermənilərin mənzillərini soymağa apardı, o onları tanıyırdı".*

*səh. 163 hal şahidinin sualına: - mən ermənilərin harada yaşadığını bilmirdim, bizi Qriqoryan aparırdı".*

**Şərh:** İstintaq materiallarında Qriqoryanın qrup üzvlərini ermənilərə qarşı amansız olmağa, onları öldürməyə, zorlamağa ruhlandırması dəfələrlə öz əksini tapıb. Məhz Qriqoryanda ermənilərin siyahısı olması faktını istintaq dövrü həm təqsirləndirilən şəxslər, həm də zərərçəkənlər dəfələrlə qeyd etsələr də, bu kimi vacib hala bilə-bilə fikir verilmir.

Müəllifin prosesdəki qeydlərindən:



**Tərcümə:** *“Qriqoryanın rolu*

- *İsayev- C.20 i.v. 92 İsayevlə Hüseynovun üzləşməsi (İsayevin ifadələri)*
  *“Qriqoryan cibindən hansısa siyahı çıxartdı, ona baxdı və bizi ardınca apardı”.*
- *Gəncəliyev- C.23 i.v. 156-164 video*
  *“Edik hamıya həb payladı, qəbul etdikdən sonra güc axınını hiss etdim”.*
  *C.26. “Nadir dedi ki, bundan sonra hara gedirik, Qriqoryan dama-dama dəftər vərəqi çıxartdı, hansının ki, üzərində nəysə yazılmışdı”*
  *İsayev- C. 29 i.v. 199-207 Qriqoryanla İsayevin üzləşməsi.*

*“Qriqoryan lovğalanmağa başladı, Nadir kağızına baxmağını dedi. O üzərində hansısa rəqəmlər olan dama-dama vərəq çıxartdı və dedi “Batalyon, ardımca gəlin”.*

- *Gəncəliyev- videodan “Qriqoryan həb paylayırdı. Mən 2 həb qəbul etdim və güc axınını hiss etdim”.*
  *Müəyyənləşdirmək iki nəfər yaxınlaşdı.*
- ***Hüseynov Vaqif-İki nəfərlə danışırdı, biri hündür digəri orta boylu, Sumqayıtlı deyildilər.***
  ***“Hər şey qaydasındadır, kütbeyinlər arxamca gəlir.”***
- *Arvadı-iki nəfərlə qarşılaşdıq, yaxşı baxmağa imkan vermədi sonra getdik.*
- *Məmmədov Qalib - Edikdə şəxslərin siyahısı var idi.*
- *Mejlumyan Lyuda – Pozulmuş və pozulmamış rəqəmlərlə bir dəftər vərəqi var idi.*
- *Məmmədov Qalib – C. 17 i.v. 104 Qriqoryan həb paylayırdı.*
  *“kütbeyinlər ardımca gəlir”.*

**Şərh:** Göründüyü kimi, mən bu qeydlərimdə iş materiallarına əsasən, Qriqoryanın bu cinayətkar qrupda təşkilatçılığını sübut edən bütün əsas faktları bir yerə toplayıram. Bütün ifadələrdə Qriqoryanın hamıya həb paylamağı, onda siyahının olmağı, ermənilərin harada yaşamağını onun bilməyi, ermənilərə qarşı qəddarlıq etməyə digər təqsirləndirilənləri də məhz onun çağırmağı dəfələrlə öz təsdiqini tapmağına baxmayaraq, istintaq Qriqoryanı bütün ağır cinayətlərdə təşkilatçılığa görə yox, iştiraka görə məsuliyyətə cəlb edib. Və hakim də bu mövqeyi davam etdirərək bütün səylərimə məhəl qoymadan, onu məhz sıravi iştirakçı kimi mühakimə edir.

Sizcə, sadaladığım bütün faktlar və ifadələr onun bu qrupda təşkilatçılığına dəlalət etmirdimi?! Bütün bu hallar üzrə mən daha ətraflı şərh verə bilərəm, lakin oxucuları yönləndirməmək, onların özlərinin nəticə çıxarması məqsədilə bunu etmirəm.

# QARA PLAŞLILAR KİMLƏR İDİ?

Cinayət işinin materialları ilə tanış olduqca, çoxsaylı suallar yaranmağa başlayırdı. Artıq məndə əminlik yaranmışdı ki, həbs olunan bu dəstənin başçısı Qriqoryandır. Lakin, cinayət işinin quruluşu hər vəchlə Qriqoryanı cinayətin sadə iştirakçısı kimi göstərməyə istiqamətlənmişdi. Hər hansı dəstə tərəfindən törədilmiş cinayət işinin materialları ilə nə vaxtsa tanış olmuş istənilən hüquqşünas yaxşı bilir ki, dəstə üzvlərinin ardıcıllığında əvvəlcə dəstə başçısının adı qeyd olunur, daha sonra cinayətdə iştirakına və törətdiyi cinayətlərin ağırlığına görə, sıralama davam etdirilir. Lakin ittiham aktından da görünür ki, Qriqoryanın adı bu sıralamada ən sonda qeyd olunur. Bundan əlavə, Qriqoryanın xüsusi rolu ilə bağlı bəzi şahid ifadələrinə, ümumiyyətlə məhəl qoyulmamışdı.

Bütün bu hallar içimə şübhə salmış, ağac qurdu kimi beynimi didməyə başlamışdı. İş materiallarını araşdırdıqca, Qriqoryanın arvadının, iş üzrə təqsirləndirilən qismində cəlb olunan Qalib Məmmədovun, Vaqif Hüseynovun ifadələri ilə tanış oldum. O ifadələrin hamısında qara plaşlı iki nəfərin adı çəkilir və Qriqoryanın mütəmadi şəkildə onlarla görüşdüyü qeyd olunurdu. Hətta mən bu ifadələrdəki məqamları proses boyunca qeyd dəftərçəmdə də göstərmişəm və həmin qeydləri indi nəzərinizə çatdırmaq istərdim:

Müəllifin prosesdəki qeydlərindən:



**Tərcümə:** *“ Müəyyən edilsin, iki nəfər yaxınlaşıb”.*

*Hüseynov Vaqif: “İki nəfərlə danışırdı, biri hündür, digəri orta boylu idi, Sumqayıtlı deyildilər”.*

*“Hər şey qaydasındadır, kütbeyinlər arxamca gəlirlər”.*

*Arvadı: “İki nəfərlə qarşılaşdıq, o, yaxşı görməyimə imkan vermədi, sonra getdilər”.*

*Məmmədov Qalib: C. 17. i.v. 104 - “Qriqoryan həb paylayırdı”.*

*“Kütbeyinlər arxamca gəlirlər”.*

**Şərh:** Bu ifadələrdən görünür ki, hər üç şahid Qriqoryanın mütəmadi şəkildə iki nəfərlə görüşdüyünü təsdiqləyirlər. İş materiallarında müstəntiq Qriqoryanın arvadını dindirərək, həyat yoldaşının hadisələrdən əvvəl harada olması barədə xronologiya qurmağa çalışır. Dindirmə zamanı Qriqoryanın arvadı onların çox mehriban yaşadıqlarını, Qriqoryanın hara getdiyi, kiminlə görüşdüyü barədə daim onu məlumatlandırdığını söyləyir. Sonrakı ifadələrində bildirir ki, bir axşam evə gələrkən, yaşadıqları binanın tinində iki nəfər qara plaşlı adamın dayanıb onları müşahidə etdiklərini görüb. Dönüb onlara tərəf baxmaq istədikdə, Qriqoryan yoldaşını çəkərək, ona kobud şəkildə rusca “чего зыришься?” ( “gözünü nəyə bərəldirsən?”) deyir və həmin adamları diqqətlə görməyinə imkan vermir. Daha sonra evə gəldiklərini söyləyir. Müstəntiqin sonra baş verənlər haqda sualına isə Qriqoryanın yoldaşı “məni evə qoyduqdan sonra getdi”,- söyləyir. Müstəntiq dərhal ondan Qriqoryanın hara getdiyini soruşur. Çünki daha əvvəl o, Qriqoryanın hara, kiminlə getdiyi, hətta gecikib-gecikməyəcəyi barədə onu daim məlumatlandırdığını demişdi. Lakin müstəntiqin bu sualına cavabında Qriqoryanın yoldaşı ərinin hara getdiyini bilmədiyini, bu dəfə hara getməsini deməməyindən onun vacib işinin olduğunu anladığını söyləyir.

Sadə məntiq isə Qriqoryanın evdən məhz həmin qara plaşlılarla görüşmək məqsədilə çıxdığını göstərir.

İttihamnamədə öz əksini tapmayan, ancaq cinayət işinin materiallarında öz əksini tapan, məhkəmə prosesi zamanı elan olunmuş, qeydi olmayan, ancaq yaddaşımda qalan ifadələrdən bir hissəsini nəzərinizə çatdırmaq istəyirəm.

Belə ki, Qalib Məmmədov və Vaqif Hüseynov istintaq dövrü verdikləri ifadələrində həmin qara plaşlıları xatırlayırlar. Qalib Məmmədov ifadəsində təxminən bildirir: “Biz kütlə ilə gedirdik, mən Qriqoryanın arxasında idim. Kənarda iki nəfər qara plaşlının durduğunu gördüm. Onlar Sumqayıtlı deyildilər gəlmə adamlara oxşayırdılar. Sonra gördüm ki, həmin qara plaşlılar Qriqoryana heç nə deməsələr də, Qriqoryan onlara tərəf çöndü və sanki, sakitləşdirici bir şəkildə əlini qaldırıb-yellədi, ardınca “hər şey

qaydasındadır, kütbeyinlər arxamca gəlir" dedi..."

Eyni ifadəni Vaqif Hüseynov da verir. Lakin çox mühüm ifadələrin səslənməsinə baxmayaraq, mən istintaq tərəfindən həmin qara plaşlıların kimliklərinin, Qriqoryanla nə məqsədlə görüşdüklərinin və nələri müzakirə etdiklərinin, Qriqoryanın onlara nədən belə dediyinin müəyyənləşdirilmədiyini gördüm. Məhz həmin ifadələr diqqətimi daha çox çəkdi və məni narahat etməyə başladı. Ona görə də istintaq qrupunun üzvlərindən kiminləsə tanış olmaq qərarına gəldim. Cinayət işinin materiallarına baxanda, orada istintaq qrupunun üzvü olan bir azərbaycanlının - Niyazi Vəlixanovun adı ilə rastlaşdım. Hazırda Niyazi Vəlixanov Bakı şəhərinin Nizami rayon Prokurorluğunun prokuror kriminalistidir. Vəlixanovla görüşüb şübhələrimi bölüşdüm. İlk söhbətdəncə N. Vəlixanov haqda çox xoş təəssüratlarım yarandı. O, səmimi şəkildə etiraf etdi ki, iş materialları ilə tam tanış ola bilməyib, sadəcə olaraq, ikinci, üçüncü dərəcəli dindirmələri aparıb, lakin bununla belə o da hadisələrin qələmə verildiyi kimi də sadə olmadığı barədə düşündüyünü bildirdi. Niyazi mənə işi yaxşı bilən istintaq qrupunda müstəntiq olan bir nəfər DTK polkovnikinin adını çəkdi (O Moskva yaxınlığındakı vilayətlərin birinin DTK-da müstəntiq işləyirdi, adını indi dəqiq xatırlamıram). Bəzi məsələləri öyrənməyim üçün məni həmin polkovniklə əlaqələndirməsini Niyazidən xahiş etdim. Ancaq Niyazi ümidsiz halda bildirdi ki, o, sənə heç nə deyən deyil və bu məsələ ilə bağlı da heç bir əlavə məlumat verməyəcək. Bundan sonra mən Niyazidən sadəcə təşkil edəcəyim "qonaqlığa" həmin polkovniki gətirməsini xahiş etdim. O razılaşdı...

Görüşümüz köhnə "Zoopark" adlanan restoranda baş tutdu və çox uzun çəkdi. Həmsöhbətimin içkiyə meylliliyi dərhal hiss olundu. Mən bilərəkdən məclisin sonuna yaxın Rusiyada işlədiyim dövrdən, orada rastlaşdığım çətinliklərdən, bir sözlə, peşəkarlıqdan söhbət açdım. Bu zaman həmin polkovnik də həvəslə öz işlərindən, professionallığından danışmağa başladı. Polkovnikin artıq özünü tamamilə professional birisi kimi təqdim etdiyi məqamda, etiraz etdim və dedim: "Axı siz necə özünüzü peşəkar sayırsınız ki, mən DTK işçisi olmaya-olmaya, Sumqayıt hadisələrinin təşkil olunduğunu işdən görə bilirəm, siz isə peşəkar olduğunuzu iddia etdiyiniz halda, bunu görə bilməyibsiniz?!" Sözlərim ona çox pis təsir etdi və dərhal kobud cavab verdi: " Sən özündən çox razısan. Mən bu işin mahiyyətini yaxşı bilirəm. İşin nəinki təşkil olunduğunu, hətta kimlər tərəfindən edildiyini də müəyyənləşdirmişik".

Daha sonra o, işdə adı keçən və məndə əsaslı şübhələr yaradan həmin qara plaşlıların şəxsiyyətini müəyyən etdiklərini, hətta onların fotoşəkillərini Qriqoryanın arvadına, təqsirləndirilən şəxslərin bəzilərinə təqdim etdiklərini və onların həmin şəxsləri tanıdıqlarını, məhz onların bu hadisə-

lərin təşkilatçıları olduqlarını və sonra Özbəkistana getdiklərindən xəbərləri olduğunu da vurğuladı. Polkovnikin dediyinə görə, o, hadisələrin təşkilatçılarının yerini dəqiq müəyyənləşdirərək, Qalkinin yanına gedib və həmin adamları Özbəkistandan gətirmək üçün ezamiyyət vərəqəsinə qol çəkməsini xahiş edib. Qalkin isə cavabında ona deyib: **“ Sən SSRİ KP MK-nın Birinci katibi Mixail Sergeyeviç Qorbaçovun çıxışını eşitmədin? Axı o dedi ki, Sumqayıt hadisələri xuliqan elementlərin işidir. İşi məhz bu cür də bitirmək lazımdır...”**

DTK polkovniki etiraf etdi ki, Sumqayıt işini savadsızlıqlarından yox, məhz bu səbəbdən belə tamamlayıblar. Həmin söhbətin şahidi olmuş Niyazi Vəlixanov da, yəqin ki, dediklərimi təsdiqləyər.

Qısa müddət sonra Oş, Fərqanə hadisələrinin baş verməsi də qara plaşlıların Özbəkistana məhz bu məqsədlə getdikləri ehtimalını yaradırdı. SSRİ dağıldıqdan sonra isə çoxlarına bəlli oldu ki, SSRİ DTK-da Afrika, Asiya ölkələrində iğtişaşlar, dövlət çevrilişləri təşkil edən xüsusi qurum olub. İstisna olunmur ki, həmin qara plaşlılar məhz o qurumun əməkdaşlarıylarmış. Bu hissəni araşdırmaq artıq başqalarının işidir.

## PROSESƏ KƏNAR MÜDAXİLƏLƏR

**S**umqayıt hadisələri üzrə keçirilən prosesin iştirakçısı kimi, birmənalı deyə bilərəm ki, işə kənardan çoxsaylı müdaxilələr olurdu. Bu, özünü bir neçə məqamda biruzə verirdi. İlk növbədə, təqsirləndirilən şəxslərin vəkilləri prosesdə peşə tələblərinə layiq olmayan şəkildə davranırdılar. Onlar nəyin bahasına olursa-olsun dustaqlarının ifadə verməmələrinə nail olmağa çalışır, onları bu yöndə istiqamətləndirirdilər. Hətta hansısa təqsirləndirilən şəxsin çarpaz dindirmələrlə yalan ifadələrini ifşa edəndə, onlar dərhal üstümə düşür, məni təhqir etməyə başlayırdılar. Təqsirləndirilən şəxslər də proses boyu bir ağızdan hamısı məni “erməni”, “ermənilərin şpionu” və s. bu kimi ifadələrlə təhqir edirdilər. Dəfələrlə Mənsur İbayevdən bu məsələyə müdaxilə etməsini, təhqir olunmağıma imkan verməməsini tələb edirdim. Lakin, M.İbayev hər dəfə “Aslan, sən onlara fikir vermə, bizim burada məqsədimiz başqadı, biz prosesdə problem yaratmadan istəyimizə nail olmalıyıq”,- deyərək, məni sakitləşdirməyə çalışırdı. Doğrudur, xarakterim bunlara fikir verməməyimə, reaksiyasız qarşılamağıma mane olurdu. Bunu hiss edən vəkillər də, bir növ, məni özümdən çıxarmaq üçün təqsirləndirilən şəxslərə yardım edirdilər. Təkcə Əsədağa Abdullayev adlı vəkil bu kampaniyaya qatılmırdı. Rauf Kərimov adlı vəkil isə xüsusi canfəşanlıq göstərirdi: daim əlində ya bir topa açar, ya da təsbeh tuturdu. Mən şahidləri dindirməyə başlayan kimi, əlindəki əşyanı oynatmağa başla-

yır, atmacalar atır, insanı qıcıqlandıracaq bütün elementlərlə məni hövsələdən çıxarmağa çalışırdı. Sonralar onu Bakı şəhər prokurorluğunda çalışan görmüşəm.

Onu da deyim ki, prosesdə Qalib Məmmədovun vəkili qismində iştirak edən Əsədağa Abdullayev "Bizim yol" qəzetinə verdiyi silsilə müsahibəsində mənim dediklərimi təsdiqləyir:

"**Ə.A.**- ...Başqa bir məqamı xatırlayıram, vəkillər Aslan İsmayılova qarşı özlərini son dərəcə pis aparırdılar.

**N.C. -** Konkret nə deyirdilər?

**Ə.A.**- Təhqiramiz sözlər işlədirdilər, yerli-yersiz.

**N.C. -** Nə üçün?

**Ə.A.**- Sadəcə, istəyirdilər ki, o, ittihamı müdafiə edə bilməsin. Müəyyən vəkillərin şəxsi maraqları var idi. Onlardan biri - Rauf Kərimov Aslan müəllimə qarşı bu kampaniyaya təşkilatçılıq edirdi. Bu adam, yeri gələndə, hakimi də təhqir edirdi, o, əvvəl prokurorluq işçisi olmuşdu.

**N.C.-** Nəyə əsasən təhqir edirdi?

**Ə.A. -** Guya, Aslan müəllim ittihamı düzgün aparmır. Ümumiyyətlə, onun suallar verməsinə də mane olurdular.

**N.C.-** Bu məntiq yaranmır ki, Rauf Kərimov Qriqoryanı müdafiə edirmiş?

**Ə.A.**- Belə baxanda, bəli, müdafiə edirdi. Çünki o, müttəhimini müdafiə etməklə Qriqoryanı vəziyyətdən çıxardırdı ki, həqiqət aşkar olunmasın..."

Vəkillər arasında Trubovskaya adlı bir qadın da vardı və səhv etmirəmsə, o, Qriqoryanın vəkili idi. Proses boyu apardığım gündəlikdə, artıq prosesin ortalarından demək olar ki, hər gün Trubovskayanın prosesə bir saat, saat yarım gecikdiyini qeyd etmişəm. Bu qeydiyyatın səbəbi də o idi ki, məndə həmin vəkilin hər prosesdən qabaq kiminləsə görüşdüyünə, təlimatlar aldığına dair təsəvvür yaranmışdı. Çünki məhz onun hər gecikmələrindən sonra təqsirləndirilən şəxslər və vəkillər arasında bir canlanma başlayırdı, sanki, o, hər kəsi təlimatlandırır, istiqamətləndirirdi.

Yalnız Əsədağa Abdullayev həmin dövr yaxınlaşaraq, məni başa düşdüyünü, lakin heç nə ilə kömək edə bilmədiyini söyləmişdi. Mən ondan dustağına vəziyyəti izah edib, hər şeyi olduğu kimi söyləməsini istədikdə, o, buna imkan verilmədiyini bildirdi. Hətta vurğuladı ki, digər vəkillər onun müdafiə etdiyi Qalib Məmmədovun valideynlərini inandırırlarmış ki, guya, Əsədağa prokurorluğa işləyir və ondan imtina etmək lazımdır. Lakin qəti şəkildə deyə bilərəm ki, həmin vəkil heç kimə işləmirdi. O, sadəcə olaraq, qanun çərçivəsində müdafiə etdiyi şəxsin hüquqlarını qoruyur, baş verən faciənin mahiyyətini anlayır və hər vəchlə bunun qarşısını almağa çalışırdı. Hətta mənə deyirdi ki, millətimizi rüsvay ediblər, ancaq yenə də bizim əlimizdən heç nə gəlmir.

Yeri gəlmişkən, deyim ki, kitabın irəlidəki səhifələrində vəkillərin və digərlərinin prosesə müdaxilələrini təsdiqləyən və 1989-cu ildə proses zamanı apardığım, bu günə qədər də saxladığım qeydlərimdən bəzilərini nəzərinizə çatdıracağam.

***Mən bunu indiyədək heç yerdə deməmişdim, ancaq indi deyirəm: həmin proses gedən dövrdə mənə bütün təqsirləndirilənlərin qohum və ya tanışları bu və ya digər formada rüşvət təklif ediblər. Mən isə onların hər birinə rüşvətsiz-filansız yalnız bir şərtlə kömək edəcəyimi bildirmişəm - məhkəməyə hər şeyin həqiqətdə necə olması barədə səmimi ifadə versinlər, mən də prokuror kimi qanunvericiliyin imkan verdiyi şəkildə minimum cəza istəyəcəm. Ancaq heç kim buna razı olmurdu.***

Mən Əsədağa Abdullayevə də bunu dedikdə, o, çalışıb kömək edəcəyini söylədi. Lakin bunu duyan digər təqsirləndirilənlərin vəkilləri Qalib Məmmədovun valideynlərini Ə.Abdullayevin əleyhinə qaldırmışdılar. Bundan bir müddət sonra isə mənə Qalib Məmmədovun prokurorluq orqanlarında işləyən qohumu (yanılmıramsa, həmin adam onda Neftçala rayon Prokurorluğunda işləyirdi) yaxınlaşaraq, həmkar olduğumuzu söylədi və məndən qohumuna kömək etməyimi xahiş etdi. Söz verdim ki, əgər Q.Məmmədov məhkəmədə səmimi ifadə verərsə, mən ona minimum cəza istəyəcəm.

Bir daha təkrarlayıram, mən həmin adama Q. Məmmədovun məhkəmədə səmimi ifadə verməsini xahiş etmişdim, Qriqoryanın üzünə durmasını yox! Çünki səmimi ifadə veriləcəyi halda, buna heç bir lüzum qalmırdı və hər şey artıq aydın olurdu. Bundan başqa, mən işlədiyim bütün dövrlərdə və sahələrdə istəyimə nail olmaq üçün heç vaxt qanun pozuntusuna yol verməmişəm.

Həmin adam razılaşdı, səhv etmirəmsə ya səhəri, ya da o biri gün bir daha mənə yaxınlaşaraq, artıq Q. Məmmədovun özü, valideynləri ilə danışdığını və ifadə verməyə onun razılığını aldıqlarını söylədi. Sadəcə, mənim onu dindirməyim lazım idi.

Növbəti proses səhər saat 11 radələrində başladı və Q. Məmmədova suallar ünvanladım. Açığı, əvvəlcə ona sualları ehtiyatla verirdim, çünki yenə də əzbərlədilmiş cavablar alacağımı gözləyirdim. Lakin elə ilk suallardanca hiss etdim ki, o obyektiv ifadələr vermək fikrindədir. Q. Məmmədov hadisələri tam təfsilatı ilə danışdı – özü, digər təqsirləndirilənlər, xüsusilə da Qriqoryan nə edib... O, təxminən bu cür ifadə verdi: "Hamımızı aparan Qriqoryan idi. Qriqoryan "kruqda" olan uşaqlara tabletka paylamışdı. Qriqoryan bunların içində qoçu idi, hamı ondan qorxurdu. Qriqoryanda siyahı vardı, "kletka" dəftər vərəqində binalar, mənzillər yazılmışdı və o mənzillərin qarşısında ermənilərin harada yaşadıqları göstərilmişdi.

Qriqoryan “komanda” verirdi ki, gedirik bu mənzilə, gedirik o mənzilə, hamını qızışdıran da məhz Qriqoryan idi” və s. Bu zaman Qriqoryan bir neçə dəfə açıq aşkar ona hədə-qorxu gəlsə də Q. Məmmədov ifadə verməyini davam edirdi. Maraqlıdır ki, digər təqsirləndirilənlər Q. Məmmədovun ifadə verdiyini görən kimi, onlar da dərhal Mənsur İbayevə müraciət etməyə başladılar ki, “biz də ifadə vermək istəyirik”. Bu zaman gözlənilməz hadisə baş verdi: hələ yarım saatdan artıq vaxt qalmasına baxmayaraq, Mənsur İbayev fasilə elan etdi və dərhal zaldan çıxdı. Mən çaşqın halda dəhlizdə onun qarşısını kəsdim və izah etdim ki, biz iki aya yaxındır bu iş üzrə zülm çəkirik və hər şeyin həlledici məqamında, onların ifadə verməyə hazır olduğu bir anda fasilə vermək doğru deyil. Bu zaman o, vacib şəxsi işinin olduğunu dedi. Mən bir daha xahiş etdim ki, nə qədər vacib iş olsa da, bu dindirməni başa çatdırmaq lazımdır. Hətta bura qədər də dedim ki, hələ bəlli deyil, onlar az sonra hansı ifadəni verəcəklər.

Bütün xahişlərimə baxmayaraq, İbayev razılaşmadı və “şəxsi işini” həll etməyə getdi...

Günorta saat üçdə - prosesin ikinci hissəsi başlayan kimi, söz verilməmiş Q. Məmmədov yerindən qalxdı və elan etdi ki, indiyədək verdiyi bütün ifadələr yalandı, bu ifadələri təzyiq altında verib və ona bu təzyiqi göstərən də Aslan İsmayılov olub. Guya, mən ona hədə-qorxu gələrək, Qriqoryanın üzünə durmağını istəmişəm, o da qorxduğundan Qriqoryanın üzünə durub.

Q. Məmmədovun ifadələrini dandığını gördükdə, mən dərhal digər təqsirləndirilənlərdən hansının ifadə vermək istədiyinə dair müraciət etdim. Onlar hamısı, əvvəlcədən sözləşiblərmiş kimi, bir ağızdan ifadə vermək istəmədiklərini bildirdilər. Mən deyəndə ki, axı siz hakimə müraciət edib, ifadə vermək istəyirdiniz, onlar bunu dandılar. Bununla da əgər o epizoda qədər, misqal-misqal da olsa, ifadə ala bilirdimsə, həmin gündən sonra təqsirləndirilənlər və vəkilləri, demək olar, tamamilə azğınlaşdılar, heç bir ifadə vermədilər və başladılar mənə atmacalar atmağa, təhqirlərlə məni özümdən çıxarmağa. Özü də təkcə təqsirləndirilənlər yox, onların qohumları da tutuquşu kimi eyni ifadələri, təhqirləri ünvanıma yağdırmağa başlamışdılar. Maraqlı olan odur ki, bu prosesdə müttəhimlərin qohumlarından və tanımadığım, mənə qarşı xüsusi nifrəti ilə seçilən şəxslərdən başqa, heç kim yox idi, sanki azərbaycanlıları bütün dünyada biabır edən Sumqayıt hadisələrinə deyil, sıradan bir “mal oğurluğu” ilə bağlı cinayət işinə baxılırdı. Hərçənd ki, bu dövr respublika ictimai cəhətdən çox fəal idi, xalq hərəkatının qalxınma dövrü idi. Bu gün də mənim üçün bu laqeydliyin sirri bəlli deyil. Hakimiyyətin hərəkətləri bəlli idi, onların başı hakimiyyətlərini qorumağa və hadisələrin mərkəzində dayanan SSRİ adlı imperiyanın rəhbəri

Qorbaçova yarınmağa qarışmışdı. Bəs AXC (Azərbaycan Xalq Cəbhəsi)? 1990-cı ilin yanvarın əvvəllərində Mərkəzin Bakıda təşkil etdiyi erməni qırğınının qarşısını təkbaşına alan AXC fəalları, bu respublikanın ziyalıları harada idilər, onlarındamı başları kürsü davasına qarışmışdı, onlardamı Mərkəzin hərəkətlərini başa düşmür, "Qriqoryan işinin" vacibliyini anlamırdılar?!

Qeyd edim ki, Q. Məmmədovun məhkəmədə səmimi ifadələr verdiyini vəkili Ə. Abdullayev də "Bizim Yol" qəzetinə müsahibəsində təsdiqləyir:

"**N.C.** – "Qriqoryan işi"nin dövlət ittihamçısı Aslan İsmayılov ANS-in bu barədə proqramında bildirib ki, Qalib Məmmədovun yaxınları ondan kömək istəyiblər. O da deyib ki, səmimi etiraf etsə, ona kömək edəcək. Bundan sonra Məmmədov Qriqoryanın onları yönəltdiyini, dərman verdiyini, onda ermənilərin siyahısının olduğunu etiraf edib. Ancaq bu zaman hakim Mənsur İbayev fasilə elan edib. Fasilədən sonra isə Məmmədov Aslan İsmayılovun təzyiqi nəticəsində o cür ifadə verdiyini bildirib...

**Ə.A.** - Ola bilsin ki, belə bir hadisə olub. Həmin vaxt eynilə Sumqayıt hadisələri ilə əlaqədar mən başqa zalda digər prosesə çıxdığımdan, bir sıra məqamları unuda bilərəm. Amma Məmmədov həmin etirafları edib. Mən özüm də ona deyirdim ki, həqiqəti söyləsin. Əgər o, həqiqəti söyləsəydi, vəziyyət başqa cür olardı. Məsələ onda idi ki, o, məhkəməyə deyirdi ki, istintaqa yalan ifadə verib, Qriqoryan orda olmayıb. Onda mən dərinə gedib, dedim ki, bax, Qalib, belə deyirsən, başa düşürəm, amma mənə de görüm, əslində necə olub, həqiqəti söylə. Bundan sonra mənə etiraf edirdi, qəlbinin lap dərinliyindəki həqiqəti deyirdi. O zaman ona bildirirdim ki, o biri təqsirləndirilən şəxslərdən qorxma, həqiqəti söylə, mən sənə "böhtan at" demirəm ki... Olanı söylə, əgər qorxursansa, yazılı ifadə ver. Razılaşırdı, amma məhkəmədə vəziyyət dəyişirdi, ayrı şey deyirdi.

**N.C. -** Bəs ona kim təsir edirdi?

**Ə.A.** - Ola bilsin ki, kiməsə deyirdi və həmin adam həqiqəti söyləməyə imkan vermirdi. Ya da görünür, onlara təsir edən qüvvələr var idi …

**N.C. -** Ancaq incə bir məqama yenidən qayıtmaq istərdim. Qalib Məmmədov etirafedici ifadəsini verəndə, hakim İbayev fasilə elan edib, hətta ittihamçı İsmayılov buna etiraz edib. Fasilədən sonra Qalib Məmmədov onu bu cür ifadə verməyə İsmayılovun təhrik etdiyini bildirib. Siz onun ifadəsini belə tez dəyişməsini araşdırdınızmı?

**Ə.A.** - Bilirsiniz necədir, mənə elə gəlir ki, prosesdə müəyyən adamları birləşdirmişdilər. Qalibin atası mənə müraciət etmişdi ki, bəs vəkillər deyir ki, guya, mən onun oğlunun azad olunmasına mane oluram. Vəkillər ona deyirmiş ki, Əsədağa Abdullayev birliyimizi pozur. Amma Qalib mənə

təklikdə etiraf edəndə ki, həqiqətən Qriqoryan təşkilatçılıq edirmiş, onda ona dedim ki, olan şeyləri, həqiqəti danış, niyə olmayanlardan danışırsan, niyə bunlarla birləşirsən? O, söz versə də, üstündə dayanmırdı. Ya qorxurdu, ya da təhrik edirdilər…"

Gördüyünüz kimi, məhkəməyə, təqsirləndirilənlərə kənardan təzyiqlərin olduğunu həmin vəkil də etiraf edir.

Onu da deyim ki, mən əvvəlcə o işdə M. İbayevə inandığım qədər, heç kimə inanmırdım. Çünki işlə əlaqədar yanına gedəndə, onun daim Şəhriyarın şerlərini oxuduğunu görürdüm. Məndə dərin inam vardı ki, Şəhriyarı oxuyan bir insanda ədalət, millət, vətən sevgisi hər şeydən üstün olmalıdır...

Üstəlik, o özü də hər dəfə "sənə etibar edirəm, çünki mən o işi bilmirəm, necə deyəcəksən, o cür də olacaq"- deyərək, məni arxayınlaşdırırdı. İlk dəfə İbayevə olan inamım Q. Məmmədovla bağlı epizodda sarsıldı. Heç onda da İbayevin işi bu dərəcədə batıracağını gözləmirdim. Sonadək ümidliydim ki, bu qədər aşkar hal, sübuta yetirilmiş faktları İbayev mütləq nəzərə alacaq və ədalətli hökm çıxararaq, millətin üzərinə atılmış bu çirkabı təmizləyəcək... Çox təəssüf ki, heç də həmişə insanın inamı, ümidləri doğrulmur. Görünür, onda daha sadəlövh idim.

Bu kitabda M.İbayevin adını tez-tez hallandırmağım heç də hansısa qisasçılıqdan, qərəzdən irəli gəlmir. Bəlkə də o vaxt SSRİ-nin mövcud olmasını, DTK mifini, rəhbərliyin mövqeyini nəzərə alsaq, onun hərəkətlərini başa düşmək olar. Ancaq onun bu günkü mövqeyini, baş vermişlərə don geyindirmək cəhdini, həqiqətləri, kimlərin göstərişini icra etməsini tarix üçün açmamasını heç cür anlaya bilmirəm. Bu, artıq bağışlanmazdır!

Bu məqamda prosesdən bir qədər aralanaraq ermənilərin bu gün həmin prosesi hansı formada və necə yalanlar uydurараq dünya ictimaiyyətinə təqdim etdiklərini bir daha göstərmək üçün yenidən "Sumqayıt, Soyqırım, Aşkarlıq" adlı mətbuat konfransına qayıdıb, orada yer alan bir məqama nəzər yetirmənizi xahiş edirəm. Həmin konfransda Ermənistan Vəkillər Kollegiyasının vəkili Ruben Rştuni çıxış edərək bildirir: "Biz Sumqayıtda zərərçəkənlərə kömək etmək üçün öz fəaliyyətimizə başlayanda, mən istintaq qrupunun rəisi (hüquqşünas kimi çıxış edənin obyektivliyindən başqa, savadı da aydın görünür. Qalkin istintaq qrupunun rəisi yox, rəhbəri olmuşdur-A.İ.) Qalkinin adına teleqram vurmuşdum. Teleqramın surəti əlimdədir: "Qriqoryan Emma, Ambartsumyan Mişanın ölümü ilə bağlı ibtidai istintaqın yekununda zərərçəkənlərin maraqlarını təmsil etmək tapşırığı almışam. Çox xahiş edirəm, əvvəlcədən işlə tanış olmaq vaxtını mənə bildirəsiniz. Ünvan: Yerevan 162a, hüq. məsləhətxanası. Vəkil Rştuni."

Daha sonra vəkil Rştuni əlavə edir ki, onun və zərərçəkənlərin işlə tanış olmaq hüququ pozulub və onlar istintaq qurtarandan sonra cinayət işinin materialları ilə tanış ola bilməyiblər. İşdə iştirak edən prokuror kimi, deyilənlərin yalan olduğunu nəzərinizə çatdırıram. Belə ki, nəinki istintaq dövrü, məhkəmə istintaqı zamanı da onların cinayət işinin materialları ilə tanış olmasına heç kim maneçilik törətməyib. Bəzi materiallarla tanış olarkən, əlimə düşən bu yazı yenidən məni məhkəmə prosesinə qaytardı. Həmin məhkəmə prosesində zərərçəkənlərin nümayəndələrinin iştirakı tam təmin olunmuşdu. Çünki onlar məhkəmə prosesinin ilk anlarından prosesdə iştirak edirdilər. Hətta təqsirləndirilən şəxslərə ifşaedici suallar verəndə vəkillərin məni təhqir etdiyinə narazılıqlarını da bildirirdilər. Lakin Qriqoryanın dindirilməsi başladıqda, ifşa olunması artıq onları narahat etdi və az sonra prosesdən qeyb oldular. Vəkil Rştunidən fərqli olaraq, mən yalan danışmaq istəmirəm. Bu səbəbdən nəzərinizə çatdırıram ki, prosesdəkilərin Yerevandan olduqlarını bilsəm də, konkret kimlərin nümayəndə qismində iştirak etdikləri yadımda deyil. Həmin proses iştirakçıları arasında məhz onun olduğunu da tam əminliklə iddia edə bilmərəm. Ancaq istisna etmirəm ki, iş materialları aşkarlananda həmin siyahıdan Rştuninin adı çıxacaq.

Bir maraqlı faktı da qeyd edim: konfrans materiallarından görünür ki, respublika rəhbərliyi tərəfindən Sumqayıtda zərərçəkmiş şəxslərin maraqlarını qorumaq üçün yaradılmış vəkillər korpusu bütün işlərdən, o cümlədən zərərçəkən Emma Qriqoryanın işindən də tam məlumatlıdırlar. Ancaq hansı səbəbdənsə "Qriqoryan işi"ni bilən yoxdur, hərçənd ki, Sumqayıt hadisələrində Emma Qriqoryanın cinayəti də daxil olmaqla, ən ağır cinayətlər məhz bu qrup tərəfindən törədilib.

İndi isə yenidən proses boyunca aşkarladığım faktlara qayıdaraq qeyd etmək istəyirəm ki, proses gedən vaxt Ali Məhkəmənin çox sayda gənc işçisinin həmin məhkəmə prosesinə ciddi marağının şahidi olmuşdum. Onlar daim gəlib prosesdə iştirak edirdilər. Bir dəfə, prosesin sonlarına az qalmış iki gənc oğlan yaxınlaşıb özlərini Ali Məhkəmənin məhkəmə iclas katibləri kimi təqdim etdilər. Dedilər ki, məhkəmə gedən dövrdə bura daim bir nəfər gəlib Qriqoryanla danışır, sonra isə ikinci mərtəbəyə - ümumi şöbəyə qalxıb oradan harasa zəng edir. Artıq onda mən baş verənlərdən dolayı, bütün ətrafımdan, sözün həqiqi mənasında, diksindiyim üçün onlara acıqla "gedin, bu barədə ya hakim M. İbayevə, ya da Ali Məhkəmənin sədri Hüseyn Talıbova deyin", - söylədim. Onların baxışları və cavabları isə indiyədək yadımdadır: "Aslan müəllim, bu iş sizdən başqa, heç kimə lazım deyil". O məqamda həmin gənclərdən bu cür söz eşitmək, sanki, məni yenidən canlandırdı.

İndi bu kitab vasitəsilə həmin gənclərə müraciət etmək istəyirəm. Çox güman ki, onlar artıq hansısa vəzifə sahibləridirlər. Fikrimcə, həmin hadisələrin birbaşa şahidləri olaraq, o zaman olduğu kimi, indi də mövqelərini bildirsələr, həqiqətin üzə çıxmasına böyük töhfə vermiş olar, tarix qarşısında borclarını ləyaqətlə yerinə yetirərlər.

Yadımdadır, gənclərə dedim ki, o adamı bir də görsələr, mütləq mənə göstərsinlər. Aradan bir müddət keçdikdən sonra, fasilə vaxtı həmin gənclər yaxınlaşaraq, adamın ikinci mərtəbədən harasa zəng etdiyini söylədilər. Biz dərhal ikinci mərtəbəyə qalxdıq. O vaxtkı Ali Məhkəmə hal-hazırda Ağır Cinayətlərə dair İşlər üzrə Azərbaycan Respublikası Məhkəməsinin yerləşdiyi binada idi. İkinci mərtəbədə düzünə bir, dəhlizin sağ tərəfində isə yan-yana qapılar vardı. Qapılardan biri açıq qalmışdı və içəridə kimsə vardı. Gənclər dərhal açıq qapını göstərərək, adamın məhz bu o otaqdan harasa zəng vurub danışdığını bildirdilər. Biz otağa girdik və həmin şəxsdən kim olduğunu soruşdum. O, rus dilində və kobud şəkildə “sənə nə var?”- dedi. Respublika Prokurorluğunun əməkdaşı olduğumu bildirdim və bir daha kimliyini soruşdum. Bu zaman o “Respublika Prokurorluğunun əməkdaşısansa, get, rəisliyini orada elə, burada sənin haqqın yoxdu nəsə tələb etməyə”- dedi, ancaq vəziyyətin də gərginləşdiyini görüb cibindən vəsiqə çıxardı. Dedi ki, Azərbaycan SSR DTK-nın əməkdaşıdır. Vəsiqəsini alıb baxmaq istədim, vermədi. Bu zaman yanımdakı iki gəncin köməkliyi ilə onun qolundan tutub Hüseyn Talıbovun yanına aparmağa cəhd etdik, o isə müqavimət göstərərək, nə istədiyimi soruşdu. “Ali Məhkəmənin sədri Hüseyn Talıbovun yanına gedək,”- dedim. Maraqlıdır ki, o vaxtadək müqavimət göstərən həmin şəxs onunla Ali Məhkəmənin sədrinin yanına getmək istədiyimi eşidən kimi, yumşaldı və razılaşdı. Hüseyn Talıbovun otağındaca ona izah etdim ki, bu şəxs prosesi aparmağa mane olur, işə müdaxilə edir, qanunsuz olaraq Qriqoryanla görüşür. Hətta ona bu şəxsin digər dustaqlarla da görüşdüyündən əminliyimi bildirdim və xahiş etdim ki, erməni milliyyətindən olan DTK əməkdaşının proses gedə-gedə Ali Məhkəmənin binasında nə axtardığını ciddi şəkildə araşdırsınlar. Hüseyn Talıbov məni tanıyırdı və əzmlə “sən narahat olma, mən bunu araşdıracam” – dedi. Ancaq mən bu günə qədər də nə həmin epizodun sonrakı taleyini, nə də Hüseyn Talıbovun nəyi araşdırdığını, hansı nəticəyə gəldiyini bilmədim...

Bu epizodla bağlı başqa bir məqamı qeyd etmək istəyirəm. Ali Məhkəmənin binasında tutub sədrə təhvil verdiyim həmin Çaturyan barəsində mən gündəliyimdə də qeyd edirəm:

Müəllifin prosesdəki qeydlərindən:


1. До начала процесса приходил Чатурян – выяснял у судьи как дела у Григорьян
2. 23.08. в конвое ________
В этот же день у Григорьян обнаружили лезвие

**Tərcümə:** *"1.Proses başlamazdan əvvəl, Çaturyan gəlirdi - hakimdən Qriqoryanın işlərinin necə getdiyini müəyyənləşdirirdi.*

*2. 23.08 Konvoyda*________

*Elə həmin gün Qriqoryanda ülgüc tapdılar".*

**Şərh:** Qeydlərdən göründüyü kimi, "avqustun 23-ü, konvoyda" yazıb, davamını qeyd etmirəm. Bildirim ki, həmin gün mən "konvoy"da rüşvət hallarının olduğunu aşkarlamışdım. Mənə bəlli olmuşdu ki, təqsirləndirilənlərin vəkilləri, qohumları və sair şəxslər rüşvət müqabilində təqsirləndirilən şəxslərlə qeyri-qanuni görüşürlər. Və məhz həmin gün Qriqoryanda ülgüc tapılır. Mən əmin idim ki, Qriqoryanı ya öldürmək, ya da qaçırmaq istəyirlər. Ülgüc də ona məhz bu məqsədlə verilmişdi. Lakin, etdiyim bütün xəbərdarlıqlara məhəl qoyan yox idi.

Daha sonra mən gündəliyimin başqa bir yerində yenə qeyd aparıram:

Müəllifin prosesdəki qeydlərindən:


6.09
Трубовская опоздала на 1 час
Мирзоев заявил отвод, что прокурор заинтересован в исходе дела, так как участвует в суде идёт с обвинением…

**Tərcümə:** *"6. 09.*
*Trubovskaya bir saat gecikdi.*
*Mirzəyev prokurorun işdə maraqlı olmasına dair etiraz bildirir, belə*

*ki, o, təqsirləndirilən şəxslərin vəkilləri ilə görüşməsinə mane olur.”*

**Şərh:** Qeydlərdən görünür ki, məhz Qriqoryanın vəkili Trubovskaya prosesə həmişəki kimi gecikir və o, prosesə qatıldıqdan sonra vəkil Mirzəyev prokurora etiraz bildirir, mənim prosesdən kənarlaşdırılmamı istəyir. Guya, mən vəzifə səlahiyyətlərimdən sui-istifadə edirəm.

Daha sonra yuxarıdakı qeydin davamı olaraq yazıram:

Müəllifin prosesdəki qeydlərindən:



**Tərcümə:** *“Rəhbərliyim vasitəsilə h/h-yə zəng vurmuşam və vəkillərlə görüşü qadağan etmişəm.*

*Bu yalandır.*

*- özüm zəng vurmuşam*

*- qadağan etməmişəm, qanuna əməl olunmasını xahiş etmişəm, belə ki, İsayev 30.08-də venalarını kəsib, Qriqoryanda daha əvvəl lezviya tapılıb, Nəcəfov venalarını kəsib”.*

**Şərh:** İndi isə ardıcıllıqla bütün bu qeydlərimin altında nələrin olduğunu izah edim.

Avqustun 23-də müəyyənləşdirirəm ki, “konvoy”a rüşvət verərək, istənilən şəxsin Qriqoryanla və digər şəxslərlə görüşməsini təmin edirlər. Məhz həmin gün axtarış aparılır və Qriqoryanda “lezviya” tapılır. Sonrakı günlərdə İsayevin, Nəcəfovun damarlarını kəsərək intihar etmək cəhdləri baş verir.

Bir daha vurğulamaq istəyirəm ki, mən dəfələrlə məhkəməni Qriqoryanın öldürülə biləcəyi, yaxud qaçıralacağı barədə xəbərdar edirdim və bunun qarşısını almaq üçün tədbirlər görülməsini də istəmişdim. Lakin, yenə də buna məhəl qoyan yox idi.

Bütün bu gördüklərimdən və məhkəməyə etdiyim müraciətlərin əhəmiyyətsizliyini anladıqdan sonra, təqsirləndirilənlərin mühafizəsini təmin edən hərbi hissəyə rəhbərlik vasitəsi ilə deyil, şəxsən zəng vururam.

Onlara baş verənləri, hadisələrin ciddiliyini izah edib, qanuna riayət olunmasını xahiş edirəm. Məhz bundan sonra - sentyabrın 6-sı Trubovskaya məlum olmayan səbəblərdən yenə prosesə gecikir və o, prosesə qatıldıqdan dərhal sonra vəkil Mirzəyev mənim işdə maraqlı olduğuma dair etiraz bildirir. Elə bu epizod mənim vəkillərin Trubovskaya tərəfindən təlimatlandırıldığına dair şübhələrimin əsassız olmadığını təsdiqləyir. Trubovskayanın özünün kimin tərəfindən təlimatlandırılmasını isə dəqiq deyə bilmirəm...

Müəllifin prosesdəki qeydlərindən:


11-30 7.09.
Адвокат Керимов перебил адвоката Ахмедова.
Сразу после этого адв. Мирзаев просит суд снять обоснованный вопрос адв. Ахмедова.
После Керимов просит суд указать ~~адв~~ прокурору якобы он диктует секретарю.

**Tərcümə:** *“ 11-30 7.09*

*Vəkil Kərimov vəkil Əhmədovun sözünü kəsirdi.*

*Bundan dərhal sonra vəkil Mirzəyev məhkəmədən vəkil Əhmədovun əsaslandırılmış sualını çıxartmağı xahiş edir.*

*Bundan sonra Kərimov məhkəmədən xahiş edir ki, prokurora göstəriş versin, guya o, katibə diktə edir”.*

**Şərh:** Məhkəmədə nələrin baş verdiyini qısaca olaraq nəzərinizə çatdırmaq istərdim.

Belə ki, mən təqsirləndirilənlərə onları ifşa edə biləcək, Sumqayıt hadisələrinin təşkil olunmasını aydınlaşdıracaq suallar ünvanlayanda, dərhal vəkillər yerdən müdaxilə edərək, təqsirləndirilən şəxslərə suala cavab verməmələrini, onların cavab verməmək hüququnun olduğunu deyirdilər. Dəfələrlə hakimdən vəkillərin müdaxiləsinə imkan verməməsini xahiş etsəm də, məhkəmə buna heç bir məhəl qoymurdu. Belə olduqda isə, həm vəkillər bilərəkdən məhkəmədə çaxnaşma salıb, suallarımın eşidilməsinə imkan vermirdilər, həm də məhkəmə iclas katibi təqsirləndirilənlər suallara cavab vermədiyindən, həmin sualları məhkəmə iclas protokollarına qeyd etmirdi. Məhz bu səbəbdən, məcburiyyət qarşısında qalıb, verdiyim suallara cavab ala bilib və ya bilməməyimdən asılı olmayaraq, həmin sualları məhkəmə iclas protokollarına qeyd etməsi üçün məhkəmə iclas katibinə diktə edirdim.

Bu gün həmin protokollar təhlil edilsə, dediklərimin eynilə orada öz əksini tapdığı da üzə çıxar.

Müəllifin prosesdəki qeydlərindən:


20.11.89г.

**Tərcümə:** *"20.11.89-cu il Müstəntiqlərin çağırılmasını istəyirdi. Qriqoryan etiraz bildirdi.*

- *Trubovskaya müdafiə etdi - təzyiq göstərir, işə aidiyyati olmayan suallar verir. Kərimov, Mirzəyev, Medoyev-məhkəmənin mülahizəsinə*
  *əleyhinə - Əhmədov".*

**Şərh:** Bir məqamı da qeyd edim ki, proses boyunca məhkəmə gedişatını pozmağa tək vəkillər yox, Qriqoryan da çox can atırdı. Daim yerli-yersiz, icrası mümkün olmayan vəsatətlər verməklə, prosesi uzatmağa və ya işi başqa istiqamətə yönləndirməyə cəhd göstərirdi. Bu vəsatətlərdən biri də qeydimdə göstərdiyim həmin "müstəntiqlərin məhkəməyə çağırılması" ilə əlaqədar olanıdır. Qriqoryan bilə-bilə ki, həmin müstəntiqlər artıq Azərbaycandan kənardadırlar və onların məhkəməyə gəlmələrini təmin etmək qeyri-mümkündür, yenə də məhkəməyə buna dair vəsatətlər təqdim edirdi.

Daha sonra isə o, mənimlə bağlı da etiraz bildirdi. Bu etirazı vəkili Trubovskaya müdafiə edir və bildirir ki, guya, mən işə aidiyyəti olmayan suallar verirəm. "İşə aidiyyəti olmayan sual" saydıqları isə mənim qara plaşlılarla, payladığı həblərlə, erməni ailələrinin yaşadığı qeyd olunmuş vərəqlərlə bağlı olan məqamlar idi.

Bundan əlavə, mən ondan belə bir suala da cavab almağa çalışmışam**:** ***axı əgər, azərbaycanlı təqsirləndirilənlər ermənilərə qarşı törətdikləri cinayətləri ermənilərin azərbaycanlılara qarşı etdiklərinin cavabı olaraq qiymətləndirirdilərsə, Qriqoryanın buna nə aidiyyəti var? Niyə o özü erməni ola-ola, ermənilərdən, guya, azərbaycanlıların qisasını almağa çalışırdı?***

Trubovskaya məhz bu sualların da işə aidiyyətinin olmadığını, həmin sualların cinayət işinin materiallarında öz əksini tapmadığını əsas gətirərək,

Qriqoryanın etirazını müdafiə edirdi.

Bir daha təkrarlayıram ki, əgər bu gün həmin məhkəmə iclas protokolları açılıb, araşdırılsa və proses boyunca verdiyim suallar incələnsə, o zaman kimin suallarının işə aidiyyətinin olub-olmaması aydın şəkildə ortaya çıxacaq.

## MƏTBUATIN ROLU VƏ RƏHBƏRLİYİN BİGANƏLİYİ

Əvvəldə qeyd etdiyim kimi, Sumqayıtda məlum hadisələr baş verəndə mən Rusiyada işləyirdim və bu haqda ilk dəfə mətbuat vasitəsi ilə xəbər tutdum. Hadisələrlə bağlı məlumatlar tək SSRİ-də yox, bütün dünyada işıq sürətilə yayılmışdı. Mərkəzi KİV bu barədə verilişlər, xəbərlər yayır, məqalələr dərc edirdi. Və bu xəbərlərdə hadisənin təşkilatçıları da, icraçıları da "qatil", "cani", bir sözlə, "vəhşi" kimi təqdim olunan azərbaycanlılar idi. Sonrakı dönəmlərdə bəlli oldu ki, baş verənləri bu formada tək SSRİ mətbuatı yox, bütün dünya mediası da eyni qaydada təqdim edib. Sözsüz ki, o dövr beynəlxalq aləmə azərbaycanlıların "vəhşi" obrazında təqdim olunmasında KİV-ın müstəsna xidməti olmuşdu.

Mən hər zaman o qənaəti bölüşmüşəm ki, mətbuatın işi informasiyanı dəqiq və qərəzsiz çatdırmaqdan ibarət olmalıdır. Həmin vaxt məlumat dəqiq çatdırılırdı, qərəzsiz və ya qərəzli olub-olmaması isə başqa bir müzakirənin mövzusudur.

Qriqoryan və 6 nəfər azərbaycanlının üzərində məhkəmə prosesi başlayanda, mən həmin kütləvi informasiya vasitələrinin eyni qaydada davranacağına, yəni hadisəyə ciddi maraq göstərəcəyinə ümidliydim. Lakin, proses başladıqdan sonra, mən, ümumiyyətlə, nə hər hansı mətbuat nümayəndəsini məhkəmə zalında gördüm, nə də mərkəzi mətbuatda hər hansı informasiyanın dərcinə rast gəldim. Sanki, elə mətbuata azərbaycanlıların o "vəhşiliyi etdikləri" haqda xəbərləri yaymaq lazımıymış və bununla da işlərini tamamlamışdılar.

Prosesin başlanmasından, təxminən, 9-10 gün keçdikdən sonra, mən mətbuatın bu biganəliyi ilə bağlı işlədiyim şöbənin rəisinə danışdım. Onun cavabı qəti və qısa oldu: "Get, öz işinlə məşğul ol! Sənin işin dövlət ittihamını müdafiə etməkdir". Bu zaman mən Respublikanın Prokuroru İlyas İsmayılovun yanına getmək qərarına gəldim. Görüşdüm və ona məsələnin nə qədər önəmli olduğunu, vaxtilə bu hadisələrin kütləvi informasiya vasitələri ilə bütün dünyada işıqlandırıldığını, indi isə çox vacib bir məqamda mətbuatın kənarda durmasını söylədim. O, səbrlə məni dinlədi və nə kimi təklifimin olduğunu soruşdu. Onun reaksiyasından bu hala çox acıdığını anladım. Mən ondan prosesin mərkəzi mətbuatda - ya "Pravda", ya

“İzvestiya” qəzetində, ya da o zaman üçün SSRİ-nin əsas televiziya xəbərləri proqramı sayılan “Vremya”da işıqlandırılmasında yardımçı olmağını xahiş etdim. İlyas İsmayılov mənim yanımdaca Rafiq adlı Mərkəzi Komitə katibinə zəng vurdu və onunla çox sərt danışdı. İlyas müəllimin dedikləri olduğu kimi yadımdadır: “Orada oturub boş-boş işlərlə məşğulsunuz... Sumqayıt hadisələri ilə bağlı çox ciddi proses gedir, işdə təqsirləndirilənlərdən biri də Qriqoryan familiyalı ermənidir. Bu proses isə heç bir mətbuatda işıqlandırılmır...” Mən həmin şəxsin cavabını eşitmədim, lakin İlyas İsmayılov mənə “get, mətbuatdan prosesdə iştirak edəcəklər”,- söylədi və həqiqətən də, səhərisi ya “Pravda”, ya da “İzvestiya” qəzetində xüsusi müxbir işləyən Zaur Kadımbekov fasilə vaxtı mənə yaxınlaşdı. O, özünü təqdim edib, bildirdi ki, ona mənimlə əlaqə saxlayıb, proses barədə mərkəzi qəzetlərə məlumat verməyi tapşırıblar. Mən çox böyük məmnuniyyətlə prosesdə baş verən maraqlı epizodları ona danışdım, gördüm ki, onun da diqqətini çəkdi. Hər halda, o, ilk gün prosesdə sonadək iştirak etdi və qeydlər də götürdü. Lakin, həmin gündən sonra o şəxsi nə gördüm, nə də bir yazısını oxudum.

***Bu gün tam əminliklə deyirəm ki, məhkəmə gedən dövrdə mərkəzi mətbuatda prosesi işıqlandıran hər hansı bir yazı və ya məlumat olmayıb. Ola bilsin ki, yerli mətbuatda nəsə verilsin - bunu nə təsdiq, nə də inkar edə bilərəm, çünki bu barədə nə məndən soruşan olmayıb, nə də mən onları görməmişəm. Həmçinin o vaxt yerli mətbuatı mütəmadi izləmirdim, ancaq mərkəzi mətbuatı diqqətlə nəzərdən keçirirdim və hər hansı məlumata da rast gəlməmişdim. Bu faktın özü də cavab tələb edən çoxsaylı suallara yol açırdı: necə olur ki, həmin hadisələr baş verən zaman nəinki SSRİ-nin bütün mərkəzi mətbuatının, hətta dünyanın aparıcı KİV-nin də nümayəndələri Sumqayıtda idilər? Onları məhz o anda ora kimlər dəvət etmişdi? Əgər hadisələr bu cür ciddı rezonans yaratmışdısa, nədən bu diqqət və maraq məhkəmə prosesinə göstərilmirdi? Niyə bütün dünyaya azərbaycanlıları vəhşi kimi təqdim edən mətbuat indi susmuş, işlərini bitmiş sayırdı? Niyə prosesin sonrakı taleyi ilə heç maraqlanmırdılar? Zaur Kadımbekovun prosesdə sonrakı iştirakına və prosesi işıqlandırmasına nə və yaxud kim mane olmuşdu?***

Şübhəsiz ki, bu sualların cavablandırılması qismən Sumqayıt hadisələrinin mahiyyətinin müəyyənləşməsinə işıq salardı...

Mətbuatın bu hadisələrdəki əhəmiyyətli rolundan danışarkən, digər maraqlı məlumatı da oxucuların diqqətinə çatdırmaq istərdim.

Xatırladım ki, 1995-ci ildən 2004-cü ilədək, ayrı-ayrı vaxtlarda həm ABŞ-da, həm Avropa ölkələrində çoxsaylı konfranslarda, o cümlədən konflikt zonaları, münaqişəli vəziyyətlərin həllinə dair müzakirələrdə iştirak

etmişəm. Bütün bu tədbirlərdə iştirak edənlərin hamısı Sumqayıtda baş vermiş hadisələrdən xəbərdar idilər. Hərçənd ki, cinayət işinin materiallarına görə, Sumqayıt hadisələrində cəmi 32 nəfər adam ölmüşdü. Ancaq Sumqayıt hadisələrindən bir qədər sonra - 1989-cu ilin iyununda Özbəkistanın Fərqanə vilayətində özbəklərlə məshəti türkləri arasında baş vermiş şiddətli çaxnaşmadan heç kimin xəbəri yox idi. Həmin hadisələrdə hücuma məruz qalanlar məshəti türkləriydilər. Hakimiyyət nümayəndələri o dövrdə məshəti türklərini təşkil olunmuş şəkildə Fərqanədən çıxartmışdılar. Hətta bir il ərzində Özbəkistanın məshəti türkü olan bütün əhalisi keçmiş İttifaq respublikalarına qaçmışdı. SSRİ Daxili İşlər Nazirliyi Cinayət-Axtarış Baş İdarəsinin rəis müavini B.B. Dziovun sözlərinə görə, Fərqanədə baş vermiş iğtişaşlarda 106 nəfərin öldüyü müəyyənləşdirilmişdir. SSRİ Baş Prokurorluğunun məlumatına görə isə, 1990-cı ilin sonlarında bu hadisələr nəticəsində 112 nəfərin həlak olduğu dəqiqləşdirilmişdir ki, onların da 51 nəfəri məshəti türkü olmuşdur. Həmçinin, 1011 nəfərin müxtəlif dərəcəli bədən xəsarəti alması, Hərbi Qüvvələrin 137 nəfər hərbçisinin və 110 milis əməkdaşının yaralanması (milis nəfərindən biri vəfat etmişdir), 757 yaşayış evinin, 27 dövlət əhəmiyyətli obyektin, 275 avtonəqliyyat vasitəsinin yandırılıb və qarət olunması müəyyən edilmişdir. Lakin bu məlumatlar dünya ictimaiyyətinin nəzərinə dəqiqliyi ilə çatdırılmamışdı. 1990-cı ildə Qırğızıstanın elə həmin Fərqanə çöllərində yerləşən Oş şəhərində qırğızlarla özbəklər arasında baş vermiş konflikt nəticəsində isə, rəsmi məlumatlara görə, 1200 nəfərə yaxın insanın ölməsinə baxmayaraq, bundan da heç kimin xəbəri yox idi.

Bunlardan savayı, 11 mart 1990-cı il Litvadakı, 1990-cı ilin oktyabrında Qaqauziyadakı millətlərarası konfliktlərdən də çoxlarının xəbəri yox idi.

İstər-istəməz, sual ortaya çıxır: nədən ən az itkilərin olduğu Sumqayıt hadisələri dünya ictimaiyyətinə bu cür təfərrüatı ilə çatdırıldığı halda, Fərqanədə, Oşda yüzlərlə, minlərlə adamın tələfatına gətirmiş hadisələr barədə beynəlxalq aləm bu qədər bilgisizdi? Maraqlıdır, deyilmi?!...

... Proses boyunca hadisələrin axarını gördükdə, bu işdə təşkilatçıların əslində kimlərin olduğunu anladıqda və təqsirləndirilən azərbaycanlıların da qorxduqlarından doğru ifadə verib həqiqətin üzə çıxmasında məhkəməyə yardımçı olmaq istəmədiklərini gördükdə, mən yardım üçün bu dəfə işlədiyim şöbənin rəisi İldar Dadaşovun yanına getdim. Elə ona izah etməyə başlamışdım ki, bu hadisələr təşkil olunub, o, dərhal sözümü kəsdi və bu mövzuda dediklərimin ciddiliyini özümün anlamadığımı, mənimlə danışmaq istəmədiyini, SSRİ Prokurorluğunun bu işlə məşğul olduğunu, yekun nəticəyə də gəlindiyini söylədi və bir daha “sənin vəzifən dövlət

ittihamını müdafiə etməkdir”- dedi. Ona təqsirləndirilənlərin ifadə verməcdiklərini söylədikdə, hakim işlədiyimi xatırlatdı və qanuna müvafiq olaraq nə etmək lazımdırsa, onu da etməyimi, istintaq sənədlərinə qiymət verməyimi tövsiyyə etdi. O şöbədə həmin illər işləyənlərdən sağ qalanlar etiraf edərlər ki, rəhmətlik İldar Dadaşov çox savadlı və o dövrkü Azərbaycan reallıqları baxımından yanaşanda, çox təmiz adam idi. Baxmayaraq ki, prokurorluqda işlədiyim son tarixədək onunla münasibətlərimiz pis olub, ancaq mən onun bu xüsusiyyətlərini də həmişə demişəm. Onunla aramızda olan bu xoşagəlməz söhbətdən sonra mənə kömək etməyəcəyini anladım və İ. Dadaşova müraciət etmədən, birbaşa İlyas İsmayılovun yanına getdim. Hərçənd ki, o dövr prosedur qaydaya əsasən, prokurorluq işçisi hər hansı bir məsələ ilə bağlı çalışdığı şöbənin rəisinə, şöbə rəisi Respublika prokurorunun həmin şöbə üzrə müavininə, Respublika prokurorunun müavini isə öz növbəsində Respublika prokuroruna məruzə edirdi. Yalnız bu prosedur tamamlandıqdan sonra Respublika prokuroru lazım bildikdə həmin şöbənin işçisini qəbul edirdi. Mən bütün bu qaydalara riayət etmədən, heç bir şəxsi münasibətim olmadan və işi mənə şəxsən özü tapşırdığından, birbaşa Respublika prokuroru İlyas İsmayılovun yanına getdim. Məni ora gətirən səbəb isə Qriqoryana göstərilən xüsusi münasibət idi. Çünki dəfələrlə Qriqoryana mürəkkəb suallar verməyə başlayanda, tək Qriqoryanın deyil, digər təqsirləndirilənlərin vəkilləri də müdaxiləyə başlayırdılar, sanki, bütün proses Qriqoryanın müdafiəsinə yönəlmişdir.

İlyas İsmayılovun yanında olarkən, prosesdəki bütün azərbaycanlıların nədənsə Qriqoryandan qorxduqlarını və məhz buna görə ifadə vermədiklərini bildirdim. İlyas İsmayılov məni maraqla dinlədi və soruşdu ki, təklifim nədir. Xahişimi dedim: “Bütün təqsirləndirilənlərin saxlandığı Bayıl təcridxanasının rəisinə tapşırılsın ki, dustaqlara, məhkəmədə səmimi ifadə verməlırinin onların cəzalarını yüngülləşdirəcəyi bir daha izah edilsin və təqsirləndirilənlərin Qriqoryandan niyə qorxduqlarının səbəbləri öyrənilsin”. O dedi: “ Sən təklif edirsən ki, mən qanunu pozum?!”. Mənsə, ona səmimi ifadə verməyin cəzanı yüngülləşdirməsini təqsirləndirilənlərə izah etməyin məhz qanunun tələbi olduğunu bildirdim. Sonra o, Respublika prokurorunun birinci müavini Murad Babayevə zəng etdi və bu işlə məşğul olmağı tapşırdı. İ. İsmayılovun otağından çıxdıqdan sonra, (hər ikisinin otağı 3-cü mərtəbədə olurdu) yanında qonaqlarının olması səbəbindən, təxminən, 20 dəqiqə sonra M. Babayevin qəbuluna girdim. İçəri daxil olan kimi, M. Babayev “nə olub, nə problem var orada?”- deyə narazılığını bildirdi. Mən baş verənləri bir daha ona da danışdım. O isə hərəkətlərimdən narazı olsa da, yanımdaca bir nəfərə zəng vurdu. Zəng vurduğu şəxsə adı və atasının adı ilə müraciət edərək, dedi: “Yanımda Sumqayıt hadisələri üzrə

prosesə çıxan prokuror var, o deyir ki, guya orada Qriqoryan azərbaycanlılara hədə-qorxu gəlib, qoymur ifadə verməyə. Görün, orada nə edə bilərsiniz”. Daha sonra o, zəng etdiyi adamın Daxili İşlər Nazirinin müavini Əzim Piriyev olduğunu söylədi.

M. Babayevin zəngi işi həll etmək məqsədiylə yox, sadəcə, zəng etmək xatirinə edildiyindən heç bir səmərəsi olmadı...

Bütün bu uğursuz cəhdlərdən sonra, daha rəhbərlikdən kiməsə bir daha müraciət etmədim. Çünki bir dəfə mənim subordinasiya qaydalarını pozduğumun üzümə vurulacağından, “rəisin var, get, rəisinə şikayət elə” deyiləcəyindən ehtiyatlandım. Rəisim isə qəti şəkildə təkid etməyə davam edirdi ki, bu işi SSRİ Prokurorluğu aparıb, onların yazdığını biz poza bilmərik!!! Hətta “nə oldu, bu işin təşkil olunduğunu SSRİ Prokurorluğu görmədi, sən görürsən?”- deyərək, mənə ancaq ittiham çərçivəsində hərəkət etməyi tapşırırdı. Obyektivlik naminə deyim ki, münasibətlərimizdən onun mənə qarşı qərəzli olduğunu fikirləşirdim. İldar müəllim rəhmətə gedəndən az sonra İlyas müəllimlə onun haqqında danışarkən çox savadlı, obyektiv adam olduğunu, ancaq mənə qarşı nədənsə qərəzli olduğunu dedim. İ. İsmayılov təccübləndi və dedi ki, hər dəfə o, səninlə mübahisə etdiyini desə də həmişə sənin savadlı və obyektiv olduğunu xüsusi vurğulayardı.

Ola bilsin, o dövr aramızdakı narazılıqları məni qorumaq üçün imiş. Bunlara baxmayaraq, bu cür etinasızlıq, laqeydlik səbəbindən artıq rəhbərlikdən heç kimə müraciət etmədim...

Yeri gəlmişkən, bu məqamda yenə xatirələrimə baş vuraraq, göstərmək istəyirəm ki, rəhbərliyin belə qabarıq şəkildə biganəliyi ilə təkcə Sumqayıt hadisələrində rastlaşmamışam.

Xatırladım ki, məni 1986-ci ildə Zelençuk rayonuna məhkəmə sədri göndərəndə, ora getmək istəməməyimin səbəblərindən biri həmin rayonun bölgədə “yeyib-içən rayon” imicinə malik olmasıydı. Yerləşməsindən, “qonaqlarından” asılı olaraq, rayonda, bir növ, intizamsızlıq hökm sürürdü. Belə bir rayonda işləmək isə mənim üçün çox çətin idi. Məhkəmədəki hakimlər işə istədikləri vaxt gəlib, istədikləri vaxt gedərdilər. Hakimlərlə olan yaş fərqim isə işimi bir qədər də çətinləşdirirdi. Lakin, mən yenə də məhkəmədə intizam yaratmağa, məhkəmənin işinə savadlı kadrları cəlb etməyə çalışırdım. Bir qədər sonra çıxdığım proseslərə mənimlə birlikdə çıxan, çox aqressiv, lakin bir o qədər də savadlı bir vəkili tanıdım. Bu cür savad sahibinin nə üçün sənədlərini hakimliyə vermədiyini soruşduqda, o, Zelençuk rayonunda doğulduğunu, hakimliyə də çox can atdığını, ancaq qardaşının həmin rayonda böyük bir kolxozun sədri olduğundan və birinci katiblə yola getmədiyindən, onun hakimliyinə də imkan verilmədiyini söylədi. Mən birinci katibi xəbərdar etmədən, birbaşa Diyar Ədliyyə

Şöbəsinin rəisi Limanovun mənə olan müsbət münasibətindən istifadə edərək, savadlı və kifayət qədər təcrübəli Vladimir Pavloviç Striqinin hakimliyə seçilməsinə yardımçı olmasını xahiş etdim. Beləliklə, Striqin hakim seçildi. Azərbaycana qayıdanda, məndən öz yerimə məhkəmə sədri olaraq kimi təklif etdiyimi soruşduqda da, məhz Striqini məsləhət gördüm. Bununla da Striqin məhkəmə sədri oldu - hərçənd ki, o yerə çoxları iddialıydı. Azərbaycana köçdükdən sonra Striqinlə əlaqəm kəsildi...

Təxminən, 1995-ci ildə işimlə əlaqədar Moskvada idim. Onda məni artıq Prezident Aparatındakı vəzifəmdən də azad etmişdilər və mən təzəcə vəkilliyə başlamışdım. Moskvada xəbərlər proqramına baxarkən, Rusiya Federasiya Şurasının iclasının getdiyini və Striqinin də orada əyləşdiyini gördüm. Elə verilişdən öyrəndim ki, Striqin Federasiya Şurasında hüquq-mühafizə orqanları ilə əlaqəli hansısa qurumun rəhbəri və senatordu. Məlumat bürosu vasitəsilə Striqinin iş nömrəsini tapdım. Köməkçisi ilə əlaqə saxlayaraq, özümü təqdim etdim və vaxtilə Striqinlə birlikdə işlədiyimi, onunla danışmaq istədiyimi bildirdim. O, telefon nömrəsini götürdü. Heç aradan 10 dəqiqə keçməmişdi ki, telefon zəng çaldı. Striqin idi. Mənimlə çox xoş ovqatda danışan Striqin dərhal qaldığım ünvanı soruşdu. Bir qədər sonra Striqinin maşını gəldi və məni Kremlin yanında yerləşən "Rossiya" mehmanxanasında Striqin üçün ayrılmış apartamentə götürdü. O zaman Striqin ayrıca evdə yaşamırdı, çünki özü Moskvada tək qalırdı. Ailəsi isə Zelençukda idi. Elə "Rossiya" mehmanxanasının yuxarı mərtəbəsində yerləşən, özləri üçün ayrılmış restoranda əyləşdik. Şam yeməyində uzun sürən söhbətimiz oldu. Söhbət əsnasında mən Rusiyanın əleyhinə çox sərt fikirlər səsləndirdim: Qarabağ problemində Rusiyanın Ermənistana hərbi-siyasi dəstəyindən, Sumqayıtda baş verənlərdən, sözügedən prosesdən danışdım. Bundan başqa, Azərbaycanda və Ermənistanda ruslar üçün yaradılan şəraitin müqayisəsini apardım, bizdə vəziyyətlərinin Ermənistandakından qat-qat üstün olduğundan bəhs etdim. Striqin əsl Rusiya vətənpərvəri idi və mənim Rusiyaya müsbət münasibətimi, tənqidlərimin xoş məramlı olduğunu bilirdi. Bütün bunları dinlədikdən sonra Striqin etiraf etdi ki, vəziyyətin məhz bu cür olduğundan xəbərsizdir və dediklərimə tam səmimiyyətilə inanır. Üstəlik, bildirdi ki, mənə borcu var, əgər o zaman onu hakimliyə, oradan da öz yerimə çəkməsəydim, indi bu mərtəbələrə gəlib çata bilməzdi. Açığı, o məqamadək bunu xatırladacağını ağlıma da gətirmirdim. Daha sonra bildirdi ki, borcunu qaytarmaq üçün 15-20 senatorla birlikdə Azərbaycana gələ, həmin qaçqın şəhərcikləri, qaçqınların vəziyyəti ilə tanış ola və bu məsələni Federasiya Şurasında qaldıra bilər. Bunun üçünsə ona formal olaraq Azərbaycan parlamentindən dəvət məktubu lazımdır ki, o, rəsmi səfərlə Azərbaycana gələ bilsin. Məhz bu məqamda Striqin bildirdi ki,

o, Federasiya Şurasının sədri Vladimir Şumeyko ilə çox yaxın dostdur və onun vasitəsilə bu məsələni Federasiya Şurasında qaldıra bilər. Nəzərinizə çatdırım ki, Vladimir Şumeyko Stavropolla qonşuluqda yerləşən Krasnodar şəhərindən və günlərini yemək-içməklə keçirənlərdən idi.



**Soldan sağa: Aslan İsmayılov, Vladimir Striqin və onun köməkçisi. Moskva, 1995-ci il.**

Azərbaycana qayıdan kimi, parlamentə zəng vurdum, bir neçə cəhddən sonra Arif Rəhimzadənin Vilayət adlı köməkçisi ilə əlaqə yarada bildim. Söhbət əsnasında həmin şəxsin məni tanıdığını anladım və ona hadisələri tam təfsilatı ilə danışdım. Həmin şəxs bildirdi ki, hər şeyi Arif Rəhimzadəyə məruzə edəcək. Əlaqə üçün ev telefonumu da verdim. Üstündən bir gün sonra, axşam evə gələndə yoldaşım Arif Rəhimzadənin zəng vurduğunu və onunla əlaqə saxlamağımı istədiyini söylədi. Gec olduğundan, həmin gün zəng vurmadım. Səhərisi köməkçisi ilə danışdım və o, dedi ki, Arif müəllimin hər şeydən xəbəri var, mənimlə danışmaq istəsə də alınmayıb. Tapşırıb ki, Arif Rəhimzadənin adına rəsmi məktub yazım və məktubda yuxarıda söylədiklərimi, yəni Striqinə hansı yaxşılıqları etdiyimi də göstərim. Təəccübləndim və bu cür məktubun nəyə gərəkdiyini soruşdum. O isə bunun parlamentin Striqini dəvət edə bilməsi üçün lazım olduğu-

nu söylədi. Mən bunun son dərəcədə qeyri-ciddi və qeyri-etik olduğunu, belə bir məktub yazmaq fikrində olmadığımı bildirdim və bununla da söhbəti yekunlaşdırdım. Bu hadisədən, təxminən, 4-5 ay sonra artıq Federasiya Şurasında yox, Rusiya Dövlət Dumasında deputatların təşəbbüsü ilə Qarabağ problemi müzakirə olundu və bu müzakirələr ermənilərin təşəbbüsü ilə olduğundan onların xeyrinə də istiqamət aldı. Mən növbəti dəfə Qarabağ məsələsi, dövlətçilik və dövlət üçün lazımlı məsələdə məmur biganəliyinin şahidi oldum. Hərçənd ki, müraciətimdən dərhal sonra A.Rəhimzadə bu məsələ ilə ciddi məşğul olmalı idi, ancaq o, nədənsə sığortalanmaq üçün məndən bu cür məntiqə və əxlaqa sığmayam məktub tələb edirdi... Sonralar bildim ki, o, Azərbaycan Respublikasının Müstəqilliyi ilə bağlı Parlamentdə qəbul olunan "Müstəqillik haqqında Konstitusiya Aktı"nın əleyhinə səs verənlər sırasında olub və açığını deyim, bu, məndə heç təəccüb doğurmadı.

## AZƏRBAYCANLILAR ERMƏNİLƏRİ NECƏ XİLAS EDİRDİLƏR?

İş materialları, zərərçəkənlərin ifadələri göstərir ki, azərbaycanlılar heç də təqdim edildikləri kimi, "vəhşi" olmayıblar, onlarda ermənilərə qarşı təsvir olunduğu sayaq nifrət də yox imiş, əksinə azərbaycanlılar Sumqayıtda baş verən iğtişaşlar zamanı öz canları və təhlükəsizlikləri bahasına erməniləri xilas etməyə çalışıblar ki, bunu iş materiallarında həm təqsirləndirilənlər, həm də zərərçəkən ermənilərin özləri də ifadələrində dəfələrlə açıq şəkildə təsdiqləyirlər. Fakt olaraq, əlimdəki ifadələri aşağıda şərhsiz nəzərinizə çatdırıram:

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



I7.

Обвиняемый Ганджалыев Эльчин Али оглы в предъявленном ему 24 февраля I989 года обвинении вину свою признал частично и показал, что 28 февраля I988 года примерно после I4 час.30 мин. пришел в чайхану, расположенную в I микрорайоне города. Услышав в чайхане разговор о происходящих у автовокзала событиях, решил посмотреть, что там происходит и поэтому пошел к автовокзалу.

"...В толпе, окружившей пассажиров "Москвича", я увидел троих работников милиции в форме, званий их я не разглядел. Они уговаривали толпу прекратить избиение, но толпа...не обращала на них внимания..."

т.23 л.д.323-333

**Tərcümə:** ***"****Təqsirləndirilən Gəncəliyev Elçin Əli oğlu 1989-cu il fevral ayının 29-da ona qarşı irəli sürülmüş ittihamı qəbul edərək, günahını qismən boynuna almış və ifadəsində demişdir ki, 1988-ci il fevral ayının 28-də, təxminən, saat 14:30-da I mikrorayonda yerləşən çayxanaya gəlmişdir. Çayxanada gedən söhbətlərdən avtovağzaldakı hadisələrdən xəbər tutmuş, orada baş verənlərlə maraqlanaraq, hadisə yerinə baxmaq üçün avtovağzala getmişdir.*

*Daha sonra təqsirləndirilən şəxs Gəncəliyev E.A. izah etdi: "Moskviç"də oturan sərnişinləri əhatəyə alan dəstənin arasında mən 3 milis formalı adam gördüm, amma rütbələrini ayırd edə bilmədim. Onlar dəstəni adamları döyməmələri üçün yola gətirməyə çalışırdılar. Amma dəstə... onlara fikir vermirdi..."        c.23 i.v.323-333*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

20.

Обвиняемый Мамедов Галиб Гадиршах оглы при предъявлении ему обвинения 22 февраля 1989 года по данному эпизоду вину признал полностью и показал, что 28 февраля 1988 года,примерно в 15 часов 15 минут он вышел из дома своего дальнего родственника Сафарова Низами и один пошел в город. Далее он пояснил:

"...Кто-то из толпы, кто именно, я не видел, стал выкрикивать, что Есеяны лезгины по национальности. Тогда мы прекратили избивать потерпевших. В это время к Есеянам подошли два работника милиции. Откуда они появились там, я не видел. Один из работников милиции взял девушку, а другой мужчину и женщину и увели их в сторону от возбужденной толпы..."

т.18 л.д.231-252

**Tərcümə:** *"Təqsirləndirilən Məmmədov Qalib Qədirşah oğlu 22 fevral 1989-cu ildə ona qarşı irəli sürülmüş ittihamda, göstərilən epizod üzrə günahını tam boynuna alır və bildirir ki, 28 fevral 1988-ci ildə, təxminən, saat 15:15-də uzaq qohumu Səfərov Nizaminin evindən çıxır və tək şəhərə gedir. Daha sonra o, bildirir: "...Dəstədən kimsə qışqırdı ki, (onun kim olduğunu ayırd edə bilmədim) Yeseyanlar milliyatcə ləzgidirlər. Bunu eşidəndə, biz zərərçəkmişləri döyməkdən əl çəkdik. Elə bu vaxt 2 milis işçisi Yeseyanlara yanaşdı. Onların haradan peyda olduğunu mən*

*görmədim. Milis işçilərindən biri qızın qolundan tutdu, o biri milis nəfəri isə qadınla kişidən yapışdı...”. c.18 i.v.231-252*

**Şərh:** Sumqayıt hadisələrində tez-tez “ləzgi” sözünə rast gəlinməsinə o dövr mən əhəmiyyət vermirdim. 1993-cü il hadisələri göstərdi ki, bu hal da təsadüfi deyilmiş, yəni, o zaman da Azərbaycanda yaşayan qardaş xalqlar arasında milli münaqişə salmaq istəyən qüvvələr var imiş.

18/55461-88 №-li cinayət işinin ittiham aktından:
Səfərov Nizami Sumbat oğlu:



26.

Как я пояснил, в толпу пробрались работники милиции. Мне показалось, что они не сумгаитские. Они бежали со стороны магазина "Кавказ", где стояли их автобусы. Среди работников милиции был полковник. В них толпа кидала камни, палки. Кто-то сбил с полковника фуражку. Работникам милиции удалось увести пассажиров автомашины "Москвич". Куда их увели, я не знаю.

Т.I6 л.д.I90-208

**Tərcümə:** ***“****Bayaq dediyim kimi, milis nəfərləri də dəstəyə müdaxilə eləməyə başladılar. Mənə elə gəldi ki, onlar Sumqayıtdan deyillər. Onlar «Qafqaz» mağazası tərəfindən gəlirdilər, milislərin avtobusları orada dayanmışdı. Milis işçiləri arasında polkovnik də vardı. Dəstə onlara tərəf daş, ağac atırdı. Kimsə polkovnikin baş geyimini vurub, başından aşırdı. Milis işçiləri birtəhər «Moskviçi» hadisə yerindən aralaya bildilər. Onları hara apardılar, bilmirəm”.*

*c.16 i.v.190-208”*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:


28.

Потерпевший Есеян Левон Ширинович пояснил:

"... Я сказал, что вы делаете, я слепой человек, мы ни в чем не виноваты. Меня обругали нецензурно на армянском языке, потом меня перестали бить и кто-то сказал: "Давайте я вас отвезу в больницу вместе с женой". Я согласился и тот, кто это предложил, повел нас. Я слышал, что за нами шли люди, а тот мужчина, который нас вел, говорил, что это лезгины, не трогайте их. Он привел нас в больницу, где нам была оказана первая помощь. Я попросил этого парня узнать, где моя дочь. Он мне сказал, что не беспокойтесь, она в безопасном месте...Все оставшееся время 28 февраля 1988 года мы провели в больнице, а 29 февраля 1988 года примерно в II-I2 часов нас на машине отвезли в Баку... Когда мы пришли домой, то наша дочь уже находилась дома..."

т.I л.д.I25-I39

**Tərcümə:** *Zərərçəkmiş Yeseyan Levon Şirinoviç bildirdi: «….mən dedim ki, siz neynirsiniz, mən kor adamam, bizim heç nədə günahımız yoxdu. Erməni dilində mənə söyüş söydülər, sonra döyməkdən əl çəkdilər. Kimsə dedi: "Gəlin, sizi də, arvadınızı da xəstəxanaya aparım». Mən razılaşdım və mənə bu təklifi eləyən bizi apardı. Eşidirdim ki, arxamızca adamlar gəlir. Bizi aparan kişi isə deyirdi ki, onlara toxunmayın, onlar ləzgidilər. Kişi bizi xəstəxanaya gətirdi. Burada bizə ilk tibbi yardım göstərdilər. Həmin adamdan xahiş elədim ki, qızımın harada olduğunu öyrənsin. O dedi ki, narahat olma, qızın etibarlı əllərdədir...1988-ci il fevralın 28-ni biz bütün günü xəstəxanada keçirdik. 1988-ci ilin 29 fevralında isə, təxminən saat 11-12 radələrində bizi maşına mindirib, Bakıya apardılar… Biz evə çatanda gördük ki, qızımız artıq evdədir…»*

*c.1 i.v.125-139*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

78.

Свидетель Касумов С.Т., проживающий в первом подъезде дома № I7/33"Б" в 3 микрорайоне города, показал:

"...28 февраля 1988 года, примерно в I7 час.30 мин. я находился в своей квартире, услышал шум на лестничной площадке./Я живу на 3 этаже/. Я вышел на лестничную площадку и увидел, что с 4 этажа спускаются Межлумян Григорий и его жена Роза. У них обоих лица были в крови. В каком состоянии была у них одежда, я не обратил внимания. Григорий и Роза плакали, они сказали, что их избили, и попросили, чтобы я их спрятал. Я их завел в свою комнату и спрятал в спальной комнате. Примерно через полчаса или час ко мне в дверь вновь кто-то постучал. Я открыл дверь, в дверях стояла младшая дочь Межлумян... Я ее впустил в квартиру, она мне стала рассказывать, что погромщики приняли ее за азербайджанку и, не тронув ее, отпустили. После этого я вышел на улицу и стоял возле подъезда...Потом я поднялся наверх и зашел в свою квартиру. В нашей квартире, кроме Межлумян Григория, Розы и младшей дочери, находилась еще одна дочь Межлумян. Как ее зовут, я не знаю, но у нее светлые волосы. Как она заходила к нам в квартиру, я не видел. Когда я пришел домой, жены еще не было. Потом, примерно через полчаса, я вышел из квартиры посмотреть, что происходит на улице. На лестничной клетке между вторым и третьим этажом увидел еще одну дочь Межлумян. Она поднималась наверх, была полностью раздета и вся избита. У нее было сильно избито лицо, шла кровь. Тело у нее тоже было избито, но какие повреждения у нее были, я не могу сказать потому что я стеснялся на нее смотреть. Я завел ее в квартиру, дал ей платье жены. Ее одели и ее родственники стали ей оказывать помощь. Потом уже пришла жена Когда в квартиру Межлумян заходили погромщики, я не видел, находился дома и слышал как по подъезду бегали люди..."

т.3 л.д.I-5, I9I-I93

**Tərcümə:** *Şahid Qasımov S. T. 3-cü mikrorayondakı №1733 «V» binasının birinci alaqapısında yaşayan sakin ifadəsində belə dedi:*

*«…1988-ci ilin fevral ayının 28-də, təxminən saat 17.30 radələrində, mən evimdə idim. Pilləkən meydançasında səs-küy eşitdim. Yeri gəlmişkən, mən 3-cü mərtəbədə yaşayıram. Pilləkən meydançasına çıxdım və gördüm ki, dördüncü mərtəbədən Mejlumyan Qriqoriy və onun arvadı Roza aşağı enirlər. Onların hər ikisinin üzü qan içində idi. Əyin-başlarının nə vəziyyətdə olduğuna fikir vermədim. Qriqoriy və Roza ağlayırdılar, dedilər ki, onları döyüblər. Məndən xahiş elədilər ki, onları gizləyim. Mən onları evimə buraxdım və yataq otağımda gizlətdim. Təxminən ya bir, ya da bir saat yarımdan sonra yenə qapım döyüldü. Qapını açdıqda Mejlumyanların kiçik qızını gördüm…Onu evə buraxdım. O dedi ki, iğtişaşçılar onun azərbaycanlı olduğunu düşünüb, toxunmadan buraxıblar. Bu məsələdən sonra küçəyə çıxdım və bir müddət alaqapının yanında dayandım. ... Sonra yuxarı qalxıb, evə çıxdım. Evimizdə Mejlumyan Qriqoriydən, Rozadan, kiçik qızlarından başqa, mejlumyanların daha bir qızları da vardı. Adı necəydi, bilmirəm. Yadımdadı ki, sarışın saçları vardı. Onun evimizə necə girdiyini də görməmişdim. Evə gələndə, arvadım hələ evdə yox idi. Sonra, təxminən, yarım saatdan sonra, mən evdən çıxdım ki, baxım, görüm, küçədə nə baş verir? İkinci və üçüncü mərtəbələrin arasındakı meydançada Mejlumyanların daha bir qızını da gördüm. O, yuxarı qalxırdı, əyni-başı cırılmışdı, özünü də döymüşdülər. Sifətinə elə bərk vurmuşdular ki, üzündən qanı axırdı. Bədənində də zərbə izləri vardı, amma mən o zərbə izlərini sizə dəqiq təsvir edə bilmərəm. Çünki ona tərəf baxmağa utanırdım. Onu evə apardım, arvadımın donunu verdim ki, geyinsin. Qohumları kömək eləyib, onu geyindirdilər. Daha sonra arvadım gəldi. Mejlumyanların evinə iğtişaşçılar hücum çəkəndə, mən onları görmədim. Mən evdə idim, dəhlizdə adamların ora-bura qaçdığını eşidirdim...”*

## PROSESDƏN GƏLDİYİM NƏTİCƏ VƏ MƏHKƏMƏDƏKİ NİTQİM

Prosesdən gəldiyim nəticə qəti idi: Sumqayıt hadisələri bilərəkdən təşkil olunub, kökü isə Dağlıq Qarabağ Muxtar Vilayətində baş verən hadisələrdən qaynaqlanır! Çünki cinayət işinin materiallarında bunu təsdiqləyən onlarla ifadələr var ki, onların bir hissəsini nəzərinizə çatdırıram:

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

245.

13 сентября 1988 года обвиняемый Исаев А.И. по данному вопросу пояснил:

"... 27 февраля вечером, когда я ехал на завод... на дорогах везде стояли толпы людей и не давали проехать транспорту... На заводе... все рабочие были взволнованы рассказами об издевательствах над азербайджанцами со стороны армян и беспокоились о своих семьях.

...Я считаю, что все эти беспорядки подготовили и спровоцировали лица, приехавшие из Карабаха, лица, приехавшие в Сумгаит из сельских районов и лица, ранее судимые, такие, как Григорян, которым было все равно, кого убивать и грабить. До этих событий лично я часто и много общался с лицами армянской национальности и у меня неприязни к ним не было. Во время беспорядков я попал под влияние толпы и под влияние Григоряна, Наджафова и Гусейнова, поэтому пошел с ними..."

т.27 л.д.138-144

**Tərcümə:** *"1988-ci il sentyabrın 13-də təqsirləndirilən şəxs İsayev A. İ. bu məsələ ilə bağlı bildirmişdir:*
*«...Fevralın 27-də, axşam, mən zavoda gedəndə yolların hamısında insan dəstələri toplanmışdı və nəqliyyatın gedişinə mane olurdular. Zavodda...bütün işçilər danışırdılar ki, ermənilər azərbaycanlıları təhqir eləyir. Hamı da öz ailəsinin aqibətinə görə qorxurdu. Mənə elə gəlirdi ki, belə qarmaqarışıqları Qarabağdan gələnlər, kənd yerlərindən Sumqayıta gələn adamlar salır və Edik Qriqoryan kimi əvvəllər məhkum olunmuş adamlar yaradırdı. Belə adamlara heç bir fərqi yoxdu, kimi öldürsünlər, haranı soyub-talasınlar. Bu məsələlərə qədər, mən ermənilərlə çox ünsiyyətdə olmuşam və onlara qarşı məndə heç bir xoşagəlməz hiss olmayıb. İğtişaşlar zamanı mən dəstənin, Qriqoryanın, Nəcəfovun və Hüseynovun təsiri altına düşmüşdüm, buna görə də onların ardınca getdim...".*

*c.27 i.v.138-144*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:


247.

Обвиняемый Гусейнов В.В. по данному эпизоду обвинения на допросе 22февраля 1989 года показал:

"... Находясь в толпе, из разговоров я понял, что армяне в Карабахе и Армении убивают азербайджанцев..."

т. 20 л.д. 315-320

**Tərcümə:** *Təqsirləndirilən şəxs Hüseynov V. V. ittihamın bu epizodu ilə bağlı 1989-u il, 22 fevral tarixindəki sorğuda belə ifadə verib: «...Dəstənin arasında dayananda, mən gedən danışıqlardan başa düşdüm ki, ermənilər Qarabağdadır və oradakı ermənilər azərbaycanlıları öldürürlər».*
*c.20 i.v.315-320*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:


248.

Обвиняемый Ганджалыев Э.А. по этому же вопросу показал:

"... Из слухов, распростра-нявшихся в толпе, я понял, что армяне на территории НКАО расправляются с азербайджанцами и то же самое готовится в Сумгаите..."

т. 23 л.д. 323-333

**Tərcümə:** *“Təqsirləndirilən şəxs Gəncəliyev E. A. bu məsələ ilə bağlı bunları deyib:*
*«Dəstələr arasında yayılan söhbətlərdən mən belə başa düşdüm ki, ermənilər DQMV ərazisində azərbaycanlılarla haqq-hesab çürüdürlər. Üstəlik, belə bir şeyin baş verəcəyi Sumqayıtda da gözlənilir».*
*c.23 i.v.323-333”*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

20.

Обвиняемый Мамедов Галиб Гадиршах оглы при предъявлении ему обвинения 22 февраля 1989 года по данному эпизоду вину признал полностью и показал, что 28 февраля 1988 года,примерно в 15 часов 15 минут он вышел из дома своего дальнего родственника Сафарова Низами и один пошел в город. Далее он пояснил:

"...Примерно к 16 часам я пришел к городскому автовокзалу, возле которого в районе фонтана я встретил группу ребят: Сафарова Низами, Наджафова Надира, Гусейнова Вагифа..., Ганджалыева Эльчина, Григоряна Эдуарда и Исаева Афсара. Все названные мною лица стояли вместе, образуя круг и скандировали: "Карабах наш, не отдадим Карабах!" Через промежутки сомкнутых вокруг ребят я видел, что в центре стоял Григорян Эдик и тоже выкрикивал вместе с другими..."

т.18 л.д.231-252

**Tərcümə:** *"Təqsirləndirilən Məmmədov Qalib Qədirşah oğlu 22 fevral 1989-cu ildə ona qarşı irəli sürülmüş ittihamda, göstərilən epizod üzrə günahını tam boynuna alır və bildirir ki, 28 fevral 1988-ci ildə, təxminən, saat 15:15-də uzaq qohumu Səfərov Nizaminin evindən çıxır və tək şəhərə gedir. Daha sonra o, bildirir: "...təxminən, saat 16-da mən şəhər avtovağzalına tərəf gəldim. Avtovağzalın yanında, Fəvvarələr rayonunda uşaqların bir qismi ilə qarşılaşdım- Səfərov Nizami, Nəcəfov Nadir, Hüseynov Vaqif, Gəncəliyev Elçin, Qriqoryan Eduard və İsayev Əfsər. Adını çəkdiyim uşaqların hamısı çevrə vurub dayanmışdılar və qətiyyətlə deyirdilər: "Qarabağ bizimdir, biz Qarabağı heç kimə verməyəcəyik!". Bir müddətdən sonra bir-birinə sarılmış uşaqların arasında lap mərkəzdə Edik Qriqoryanı gördüm, o da gənclərin dediklərini təkrarlayırdı..."*

*c.18 i.v.231-252*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



246.

Обвиняемый Наджафов Н.А. на допросах I8 ноября I988 года и 24 февраля I989 года показал:

"...Я признаю себя виновным в том, что 26 февраля I988 года, находясь на пересечении улиц Мира и Дружбы города Сумгаита, примкнул к многочисленной группе хулиганствующих лиц, которая вынашивала намерения отомстить сумгаитским армянам за злодеяния армян в Карабахе против азербайджанцев, и своими действиями в дальнейшем выражал свое неприязненное отношение к армянской нации, сознавая, что мои действия, так же как и действия многих других, возбуждают ненависть к армянам и чувство неприязни..."

т.22 л.д.265, 3I3

**Tərcümə:** *"Təqsirləndrilən şəxs Nəcəfov N. A. 1988-ci il 18 noyabr və 1989-cu il fevralın 24-dəki dindirmələr zamanı belə ifadə verib:*
*«...Mən özümü günahkar bilirəm ki, fevralın 26-da Sülh və Dostluq küçələrinin arasındakı kəsişmədə olarkən, buradakı çoxsaylı dələduz dəstələrinə qoşulmuşam. Bu dəstə Sumqayıtda yaşayan ermənilərdən Qarabağda yaşayan azərbaycanlılara qarşı ermənilərin törətdiyi əməllərin heyfini almaq məqsədi güdürdü. Daha sonrakı əməlləri ilə onlar erməni millətinə qarşı olan kin-küdurətlərini büruzə verirdilər. Özümün və başqalarının əməllərinin ermənilərdə bizə qarşı nifrət hissi oyatdığını anlayır və buna görə özümü günahkar hesab edirəm...»*
*c.22 i.v.265, 313"*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:



250.

Обвиняемый Мамедов Г.Г. 22 февраля 1989 года показал:

"...Примерно к 16 часам я пришел к городскому автовокзалу, возле которого, в районе фонтана я встретил группу следующих ребят: Сафарова Низами, Наджафова Надира, Гусейнова Вагифа..., Ганджалыева Эльчина,... Григоряна Эдуарда и Исаева Афсара. Все названные мною парни стояли вместе, образуя круг, и скандировали: "Карабах наш, не отдадим Карабах!" Через промежутки сомкнутых в круг ребят я видел, что в центре стоял Григорян Эдик и тоже выкрикивал вместе с другими. После того, как выкрики прекратились, Григорян скомандовал: "Давай пошли за мной!" и вывел всех нас на перекресток улиц Мира и Дружбы... останавливать автотранспорт с целью выявления лиц армянской национальности..."

т.18 л.д.239-240

**Tərcümə:** *"Təqsirləndirilən Məmmədov Q.Q 1989-cu ilin 22 fevralında deyib:*

*«...Təxminən, saat 16 radələrində mən şəhər avtovağzalına gəldim, Fəvvarələr rayonunun yanında mən o biri uşaqlarla qarşılaşdım – Səfərov Nizami, Nəcəfov Nadir, Hüseynov Vaqif, Gəncəliyev Elçin, Qriqoryan Edik və İsayev Əfsər. Adlarını çəkdiyim uşaqların hamısı çevrə vurub, dayanmışdılar, qışqırırdılar ki, «Qarabağ bizimdir!» «Qarabağı heç kimə veməyəcəyik!» Bir müddətdən sonra fikir verdim ki, Qriqoryan Edik də uşaqların ortasında dayanıb və hamının qışqırdığı sözləri o da təkrarlayır. Səs-küy qurtarandan sonra Qriqoryan əmr elədi: «Ardımca gəlin!» və bizi Sülh küçəsi ilə Dostluq küçəsinin kəsişdiyi yerə apardı. Biz burada nəqliyyatı dayandırıb, insanların arasından erməniləri seçməli idik...»*

*c.18 i.v.239-240"*

18/55461-88 №-li cinayət işinin ittiham aktından:

25I.

Обвиняемый Сафаров Н.С. на допросах I2 января и 20 февраля 1989 года показал:

"...27 февраля я на митингах слышал требования, чтобы в течение 24 часов армяне, проживающие в г.Сумгаите, выехали из города... Таковы были требования потому, что до жителей Сумгаита дошли слухи, что в Армении и Карабахе притесняют азербайджанцев, издеваются над ними, убивают, насилуют женщин, выгоняют из своих домов. Один из выступающих говорил, что он сам приехал из Армении и он вынужден был оттуда уехать... И люди, веря в это, возмущались, кричали: "Карабах наш!". "Долой армян!". Причиной беспорядков явились эти разговоры и слухи, которые распространялись по Сумгаиту..."

т.I6 л.д.I70-I76, 207-208

**Tərcümə:** *"Təqsirləndirilən Səfərov N. S. 1989-cu ilin 12 yanvar və 20 fevralında bildirdi:*
*«...Fevralın 27-də mən mitinqlərdə eşitdim ki, Sumqayıtda yaşayan ermənilər 24 saat ərzində şəhəri tərk etməlidirlər... Bu tələblərin səbəbi o idi ki, burada belə şaiyələr yayılmışdı ki, Qarabağda yaşayan azərbaycanlılar ermənilər tərəfindən təqibə, işgəncələrə məruz qalır, onları alçaldırlar, sıxışdırıb çıxarırlar, öldürürlər, qadınlarını zorlayırlar, evlərindən qovurlar. Çıxış edənlərdən biri danışırdı ki, o özü Ermənistandan gəlib və onu oradan köçməyə məcbur ediblər... İnsanlar isə buna inanaraq, qəzəblə bağırırdılar: «Qarabağ bizimdir!», «Rədd olsun ermənilər!». Şəhərdəki iğtişaşların səbəbi də bax, Sumqayıtda yayılan bu söz-söhbətlər idi.... »*
*c.16 i.v.170-176, 207-208"*

**Şərh:** Oxuduğunuz ifadələrdən görünür ki, təhrikedici amil məhz Ermənistanda və DQMV-də gedən proseslər, azərbaycanlıların qətlə yetirilməsi, doğma yurd-yuvalarından qovulmalarıdır. İstintaq dövrü dindirilən təqsirləndirilənlər cinayətləri ermənilərin DQMV və Ermənistanda azərbaycanlıların öldürülməsi, zorlanmasına cavab olaraq etdiklərini göstərmişdilər. Eyni məzmunlu ifadələri zərərçəkmişlər də vermişdirlər. Törədilmiş

cinayətin motivi xuliqanlıq deyil, məhz göstərdiyim hadisələr olmuşdur. Məsələni qabardan, bunu bir qığılcıma çevirən, dəstə üzvlərini təşkilatlandıran isə Qriqoryan və digərləri olmuşdur. Əsas təşkilatçı Mərkəz olsa da, istintaq, hadisələrin kimlər tərəfindən təşkil olunmasını, təşkilatçıların yerdəki nümayəndələrini müəyyənləşdirməyib, onları məsuliyyətə cəlb etməyib. Qriqoryanın qrupa təşkilatçılığı istintaq materiallarında tam sübuta yetirilsə də, o, təşkilatçı kimi məsuliyyətə cəlb olunmayıb, çünki istintaq dövrü saxtakarlıqlara yol verilib, istintaq sonadək aparılmayıb, bəzi mühüm məsələlər araşdırılmayıb, istintaq materiallarının bir hissəsi işdən çıxarılıb, ümumiyyətlə cinayət işinə yaxşı əl gəzdiriblər. Belə ki, görüşdüyüm DTK polkovniki qara plaşlıların fotoşəkillərinin təqsirləndirilənlərə təqdim olunduqda onları tanıdıqlarını, məhz onların Qriqoryanla görüşdüklərini, Qriqoryanın onlara "hər şey qaydasındadır kütbeyinlər arxamca gedirlər" deməsini təsdiqləməsini bildirdikdən sonra mən həmin hərəkətlərin aparıldığını təsdiqləyən protokolları cinayət işinin materiallarında tapa bilmədim. Üstəlik, məhkəmədə də işin hərtərəfli araşdırılmasında nə təqsirləndirilənlər, nə onların vəkilləri, nə hakim, nə rəhbərlik, nə də digər şəxslər maraqlı olmayıblar.

Proses boyunca rəhbərlik tərəfindən gördüyüm münasibət, laqeydlik və prosesə olan müdaxilələr məni, demək olar ki, ümidsizləşdirmişdi. Çünki, gün kimi aydın olan faktları sübut edə bilmirdim. Daha doğrusu, sübut etdiyim faktları nə məhkəmə, nə də rəhbərlik görmək, eşitmək istəmirdi. Məhz bu səbəbdən artıq mənim üçün önəmli olan məhkəmənin tezliklə yekunlaşması və son nitqimi söyləməyim idi.

Artıq oxuculara da məlumdur ki, məhkəmə boyunca, mən daim ifadələrə dair qeydlər aparırdım. Prosesin yekunlaşmasına, təxminən, bir ay qalmış, topladığım ifadələrin, sübutların əsasında yekun nitqimə hazırlaşmağa başladım. Çünki, demək olar, bütün ifadələr təkrarlanırdı, məhkəmə tərəfindən yeni heç nə müəyyənləşdirilmirdi. Sona 15 gün qalmış məhkəmədəki çıxışım faktiki, tam hazır idi. Nitqim 2 hissədən ibarət idi: birincisində təqsirləndirilən şəxslərin törətdikləri cinayətlər və sübutları, ikincisində - çıxışın əsasını təşkil edən hissədə isə Sumqayıt hadisələrinin səbəbləri, şərait və hadisələrin təşkilini sübut edən halları əks etdirmişdim.

Dəqiq tarixi xatırlamıram, amma bilirəm ki, məhkəməyə 1 gün qalmış, ya da məhkəmə günü çıxışımın ikinci hissəsi itdi. Maraqlısı isə odur ki, çıxışın məhz Sumqayıt hadisələrinin təşkil olunmasını izah və sübut etdiyim, bununla əlaqədar təkliflər verdiyim hissəsi yoxa çıxmışdı. Çıxışın hansı şəraitdə, necə yoxa çıxdığını təsvir edə bilməsəm də, həmin vaxt məhkəmədə DTK işçisinin olmasını, ümumiyyətlə, prosesin DTK-nın nəzarəti altında keçməsini nəzərə alaraq, "yoxaçıxma əməliyyatı"nı da məhz

bu qurumun fəaliyyəti ilə əlaqələndirmişdim.

Nitqimin hazır mətni itdiyindən, onun yenidən hazırlanmasına vaxtım olmadığından həmin hissədə məcbur qalıb, qısa konspektlərə əsaslanaraq çıxışımı qurdum. İşi müfəssəl bildiyimdən və bütün təfərrüatları dəqiqliyi ilə yadımda saxladığımdan, mətnin itməsi mənə xüsusi maneçilik törədə bilmədi. Məhkəmədəki çıxışım, faktiki olaraq, əvvəlcədən hazırladığım nitqimlə üst-üstə düşdü. Dəqiqliyi ilə yadımdadı ki, prosesdəki son nitqim bir gün yarım çəkdi və əsasını da məhz ikinci hissə təşkil etdi.

Çıxışıma, öncə təqsirləndirilənlərin törətdikləri cinayətlərdən və onların hansı maddələrlə təqsirli bilindiklərini, bunu sübuta yetirən halları şərh etməkdən başladım. Mühüm bir məqamı da qeyd edim ki, çıxışım itməzdən əvvəl, bütün təqsirləndirilən şəxslərin nədə təqsirləndirildiklərini yazsam da, məhkəmədən hansı cəzanı istəyəcəyim barədə hələ heç bir qeyd aparmamışdım. Bu işdə daha çox DTK-dan şübhələndiyimdən, artıq ehtiyatla davranmağa başlamışdım.

Bundan əlavə, rəisim İldar Dadaşova məhkəmədən Qriqoryana və Vaqif Hüseynova güllələnmə cəzası verilməsini; Sumqayıt hadisələri Mərkəz tərəfindən təşkil olunduğundan, bu barədə cinayət işinin qaldırılmasını; istintaq dövrü saxtakarlıqlara, hadisələrin təşkilini bilə-bilə gizlətdiklərinə görə, SSRİ Prokurorluğu istintaq qrupu haqqında xüsusi qərardad çıxarılmasını istəyəcəyimi bildirmişdim. O isə çox kəskin şəkildə etiraz edərək, ağlımı itirdiyimi söyləmişdi və qəti şəkildə tapşırmışdı ki, nə cinayət işinin qaldırılmasından, nə xüsusi qərardaddan, nə də ölüm cəzasından söhbət belə gedə bilməz və mən məhkəmədən maksimum 15 il azadlıqdan məhrumetmə cəzası istəyə bilərəm.

Söylədiklərim mənə ehtiyatla davranmaq üçün çox ciddi əsaslar verirdi. Bu ehtiyatkarlığım o vaxtkı əlyazmalarımda əks olunub və aşağıda fotoşəkillərini təqdim edirəm:

Müəllifin prosesdəki qeydlərindən:



Müəllifin prosesdəki qeydlərindən:





Müəllifin prosesdəki qeydlərindən:



**Şərh:** Bu qeydlərdən görünür ki, təqsirləndirilənlərin bəzilərinin ümumi xarakteristikasını, hər birini hansı maddələrlə təqsirli saydığımı və hansı cəzanı nəzərdə tutduğumu - Qriqoryan və Vaqif Hüseynov istisna olmaqla, bütün digər təqsirləndirilənlərə cəzaların məcmusu qaydasında yekun olaraq hansı cəzanı tələb edəcəyimi yazmışam.

Ancaq qeyd etdiyim kimi, Qriqoryanla Hüseynova yekun olaraq hansı cəzanı tələb edəcəyimi yazmamışam. Niyə? Çünki hələ çıxışımı ilkin olaraq hazırlayan zaman da, yekunda istəyəcəyim cəzaları qeyd etməmişdim. Bu işdə DTK-dan şübhələnməyim, dediyim kimi, məni ehtiyatlı davranmağa sövq etmişdi və buna görə, Qriqoryanla Hüseynova tələb edəcəyim ölüm hökmünü qeydlərimdə yazmaqdan vaz keçmişdim. Əslində, ehtiyatlanmaqda da haqlı idim - həmin dövr xüsusilə dövlət orqanlarında çalışanların hər birində bütün otaqlarda DTK-nın kameralarının, dinləmə cihazlarının quraşdırıldığına dair xof, şübhələr, hətta faktlar vardı. Güllə-

lənmə cəzaları tələb edəcəyimi bilib, məni elə o andaca işdən kənarlaşdıra biləcəklərindən ehtiyatlandığımdan həmin iki nəfərin yekun cəzasını vərəqimə qeyd etməmişdim. Beləliklə, mən məhkəmədə Eduard Qriqoryanı Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 67-ci maddəsi (milli və irqi düşmənçilik və ya ədavət salmaq, milli şərəfi və ləyaqəti alçaltmaq məqsədilə qəsdən edilmiş hərəkətlər, eləcə də irqi və ya milli mənsubiyyətdən asılı olaraq vətəndaşların hüquqlarını birbaşa və ya dolayısı ilə məhdudlaşdırma, yaxud da birbaşa və ya dolayısı ilə üstünlüklərini müəyyən etmə ), 72-ci maddəsi (talan, dağıtma, odlama və başqa bu kimi hərəkətlərlə edilən kütləvi iğtişaşın təşkili, habelə onun iştirakçıları tərəfindən yuxarıda göstərilən cinayətlərin bilavasitə edilməsi və ya onların hakimiyyətə silahlı müqavimət göstərməsi ), 94-cü maddəsinin 2, 6, 7-ci bəndləri (tamah məqsədilə; xüsusi amansızlıqla və ya bir çox şəxsin həyatı üçün təhlükəli olan üsulla; başqa cinayəti gizlətmə və ya onun edilməsini yüngülləşdirmək məqsədilə, habelə zorlamaqla əlaqədar adamöldürmə), 15-ci maddəsi, 94-cü maddəsinin 2, 8-ci bəndləri (ağırlaşdırıcı hallarda qəsdən xuliqanlıq niyyətilə; xüsusi təhlükəli residivist tərəfindən, yaxud əvvəllər qəsdən adam öldürmüş şəxs tərəfindən öldürməyə sui-qəsd), 109-cu maddəsinin 3-cü hissəsi ( bir qrup şəxs tərəfindən zorlama) ilə təqsirli bilib ölüm cəzasına; Vaqif Hüseynovun Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 67-ci maddəsi (milli və irqi düşmənçilik və ya ədavət salmaq, milli şərəfi və ləyaqəti alçaltmaq məqsədilə qəsdən edilmiş hərəkətlər, eləcə də irqi və ya milli mənsubiyyətdən asılı olaraq vətəndaşların hüquqlarını birbaşa və ya dolayısı ilə məhdudlaşdırma, yaxud da birbaşa və ya dolayısı ilə üstünlüklərini müəyyən etmə), 72-ci maddəsi ( talan, dağıtma, odlama və başqa bu kimi hərəkətlərlə edilən kütləvi iğtişaşın təşkili, habelə onun iştirakçıları tərəfindən yuxarıda göstərilən cinayətlərin bilavasitə edilməsi və ya onların hakimiyyətə silahlı müqavimət göstərməsi), 94-cü maddəsinin 2, 6, 7-ci bəndləri ( tamah məqsədilə; xüsusi amansızlıqla və ya bir çox şəxsin həyatı üçün təhlükəli olan üsulla; başqa cinayəti gizlətmə və ya onun edilməsini yüngülləşdirmək məqsədilə, habelə zorlamaqla əlaqədar adamöldürmə), 15-ci maddəsi, 94-cü maddəsinin 2, 8-ci bəndləri (ağırlaşdırıcı hallarda qəsdən xuliqanlıq niyyətilə; xüsusi təhlükəli residivist tərəfindən, yaxud əvvəllər qəsdən adam öldürmüş şəxs tərəfindən öldürməyə sui-qəsd), 144-cü maddəsinin 3-cü hissəsi (yaşayış sahəsinə, habelə binaya, anbara və ya başqa saxlanc yerlərinə girməklə soyğunçuluq) ilə təqsirli bilib ölüm cəzasına; Nadir Nəcəfovu Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 67-ci maddəsi (milli və irqi düşmənçilik və ya ədavət salmaq, milli şərəfi və ləyaqəti alçaltmaq məqsədilə qəsdən edilmiş hərəkətlər, eləcə də irqi və ya milli mənsubiyyətdən asılı olaraq

vətəndaşların hüquqlarını birbaşa və ya dolayısı ilə məhdudlaşdırma, yaxud da birbaşa və ya dolayısı ilə üstünlüklərini müəyyən etmə ), 72-ci maddəsi ( talan, dağıtma, odlama və başqa bu kimi hərəkətlərlə edilən kütləvi iğtişaşın təşkili, habelə onun iştirakçıları tərəfindən yuxarıda göstərilən cinayətlərin bilavasitə edilməsi və ya onların hakimiyyətə silahlı müqavimət göstərməsi), 94-cü maddəsinin 2, 6, 7-ci bəndləri ( tamah məqsədilə; xüsusi amansızlıqla və ya bir çox şəxsin həyatı üçün təhlükəli olan üsulla; başqa cinayəti gizlətmə və ya onun edilməsini yüngülləşdirmək məqsədilə, habelə zorlamaqla əlaqədar adamöldürmə ), 15-ci maddəsi, 94-cü maddəsinin 2, 8-ci bəndləri (ağırlaşdırıcı hallarda qəsdən xuliqanlıq niyyətilə; xüsusi təhlükəli residivist tərəfindən, yaxud əvvəllər qəsdən adam öldürmüş şəxs tərəfindən öldürməyə sui-qəsd ), 109-cu maddəsinin 3-cü hissəsi (bir qrup şəxs tərəfindən zorlama) və 144-cü maddəsinin 3-cü hissəsi ilə (yaşayış sahəsinə, habelə binaya, anbara və ya başqa saxlanc yerlərinə girməklə soyğunçuluq) təqsirli bilib 15 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Nizami Səfərovu Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 67-ci maddəsi (milli və irqi düşmənçilik və ya ədavət salmaq, milli şərəfi və ləyaqəti alçaltmaq məqsədilə qəsdən edilmiş hərəkətlər, eləcə də irqi və ya milli mənsubiyyətdən asılı olaraq vətəndaşların hüquqlarını birbaşa və ya dolayısı ilə məhdudlaşdırma, yaxud da birbaşa və ya dolayısı ilə üstünlüklərini müəyyən etmə), 72-ci maddəsi (talan, dağıtma, odlama və başqa bu kimi hərəkətlərlə edilən kütləvi iğtişaşın təşkili, habelə onun iştirakçıları tərəfindən yuxarıda göstərilən cinayətlərin bilavasitə edilməsi və ya onların hakimiyyətə silahlı müqavimət göstərməsi ), 94-cü maddəsinin 2, 6, 7-ci bəndləri (tamah məqsədilə; xüsusi amansızlıqla və ya bir çox şəxsin həyatı üçün təhlükəli olan üsulla; başqa cinayəti gizlətmə və ya onun edilməsini yüngülləşdirmək məqsədilə, habelə zorlamaqla əlaqədar adamöldürmə), 109-cu maddəsinin 3-cü hissəsi (bir qrup şəxs tərəfindən zorlama), 144-cü maddəsinin 3-cü hissəsi (yaşayış sahəsinə, habelə binaya, anbara və ya başqa saxlanc yerlərinə girməklə soyğunçuluq), 144-cü maddəsinin 4-cü hissəsi (soyğunçuluq xüsusi təhlükəli residivst tərəfindən edilmişsə və ya zərərçəkmiş şəxsə külli miqdarda ziyan vurmuşsa), 145-ci maddəsinin 2-ci hissəsinin 1, 2, 8-ci bəndləri (quldurluq, yəni xüsusi mülkiyyətdə olan əmlaka sahib olmaq məqsədilə hücuma məruz qalmış şəxsin həyatı və ya belə zorakılıq tətbiq ediləcəyi hədəsi ilə bağlı basqın qabaqcadan əlbir olan dəstə tərəfindən; silah və ya silah kimi istifadə olunan digər predmetlər işlətməklə, yaşayış sahəsinə, habelə binaya, anbara və ya başqa saxlanc yerlərinə girməklə edilmişsə) ilə təqsirli bilib 14 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Əfsər İsayevi Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 67-ci maddəsi (milli və irqi düşmənçilik və ya ədavət salmaq,

milli şərəfi və ləyaqəti alçaltmaq məqsədilə qəsdən edilmiş hərəkətlər, eləcə də irqi və ya milli mənsubiyyətdən asılı olaraq vətəndaşların hüquqlarını birbaşa və ya dolayısı ilə məhdudlaşdırma, yaxud da birbaşa və ya dolayısı ilə üstünlüklərini müəyyən etmə), 72-ci maddəsi (talan, dağıtma, odlama və başqa bu kimi hərəkətlərlə edilən kütləvi iğtişaşın təşkili, habelə onun iştirakçıları tərəfindən yuxarıda göstərilən cinayətlərin bilavasitə edilməsi və ya onların hakimiyyətə silahlı müqavimət göstərməsi), 94-cü maddəsinin 2, 6, 7-ci bəndləri (tamah məqsədilə; xüsusi amansızlıqla və ya bir çox şəxsin həyatı üçün təhlükəli olan üsulla; başqa cinayəti gizlətmə və ya onun edilməsini yüngülləşdirmək məqsədilə, habelə zorlamaqla əlaqədar adamöldürmə), 109-cu maddəsinin 3-cü hissəsi (bir qrup şəxs tərəfindən zorlama) ilə təqsirli bilib 13 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Qalib Məmmədovu Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 67-ci maddəsi (milli və irqi düşmənçilik və ya ədavət salmaq, milli şərəfi və ləyaqəti alçaltmaq məqsədilə qəsdən edilmiş hərəkətlər, eləcə də irqi və ya milli mənsubiyyətdən asılı olaraq vətəndaşların hüquqlarını birbaşa və ya dolayısı ilə məhdudlaşdırma, yaxud da birbaşa və ya dolayısı ilə üstünlüklərini müəyyən etmə), 72-ci maddəsi (talan, dağıtma, odlama və başqa bu kimi hərəkətlərlə edilən kütləvi iğtişaşın təşkili, habelə onun iştirakçıları tərəfindən yuxarıda göstərilən cinayətlərin bilavasitə edilməsi və ya onların hakimiyyətə silahlı müqavimət göstərməsi), 109-cu maddəsinin 3-cü hissəsi (bir qrup şəxs tərəfindən zorlama), 144-cü maddəsinin 3-cü hissəsi (yaşayış sahəsinə, habelə binaya, anbara və ya başqa saxlanc yerlərinə girməklə soyğunçuluq), 144-cü maddəsinin 4-cü hissəsi (soyğunçuluq xüsusi təhlükəli residivst tərəfindən edilmişsə və ya zərərçəkmiş şəxsə külli miqdarda ziyan vurmuşsa), 145-ci maddəsinin 2-ci hissəsinin 1, 2, 8-ci bəndləri (quldurluq, yəni xüsusi mülkiyyətdə olan əmlaka sahib olmaq məqsədilə hücuma məruz qalmış şəxsin həyatı və ya belə zorakılıq tətbiq ediləcəyi hədəsi ilə bağlı basqın qabaqcadan əlbir olan dəstə tərəfindən; silah və ya silah kimi istifadə olunan digər predmetlər işlətməklə, yaşayış sahəsinə, habelə binaya, anbara və ya başqa saxlanc yerlərinə girməklə edilmişsə) ilə təqsirli bilib 10 il müddətinə azadlıqdan məhrumetmə cəzasına məhkum edilmələrini tələb etmişəm. Tam məsuliyyət ilə deyirəm ki, əgər həmin işə bu gün çıxacaq olsam, yenə də 1989-cu ildə məhkəmədən tələb etdiyim cəzaları Eduard Qriqoryana, Vaqif Hüseynova və digər təqsirləndirilən şəxslərə tələb edərdim. Çünki milliyyətindən, irqindən, dinindən asılı olmayaraq, hər kəs insandır və hər bir cinayətkar da mütləq layiqli cəzasını almalıdır...

İndi isə çıxışımın Sumqayıt hadisələrinin təşkil olunmasına dair hissəsinə keçirəm. Konspektlərimə nəzər salanda, görürük ki, Sumqayıt hadisələrinin səbəb və şəraitini göstərərək, yazıram:

Müəllifin prosesdəki qeydlərindən:


— Причины и условия
— все подсуд. — мы думали, что в Кафане и в НКАО действительно режут азербайджанцев
— потерпевшие — говорили, что мстят за матерей, сестер, братьев — изнасилованных и убитых в Кафане и НКАО т. 11. л.д. 23 Асафян и др.

**Tərcümə***:* *"- Səbəb və şəraiti.*

- *Bütün təqsirləndirilənlər – Biz düşünürdük ki, Qafanda və DQMV-də həqiqətən də azərbaycanlıları kəsirdilər.*
- *Zərərçəkənlər – deyirdilər ki, Qafanda, DQMV-də zorlanmış və öldürülmüş analarının, bacılarının, qardaşlarının qisasını alırlar. C. 2. i.v. 23 Asafyan və digərləri".*

**Şərh:** Göründüyü kimi, Sumqayıt hadisələrinin səbəblərini Qafanda və Əsgəranda axtarıram ki, bunu həm təqsirləndirilənlər, həm də zərərçəkənlər öz ifadələrində təsdiqləyirlər.

Bundan sonra fikirlərimi davam etdirərək, yazıram:



**Tərcümə***: "21.02.88-ci il DQMV-dəki hərəkatlər milliyyətçilik əlamətləridir. Məsələ "Sumqayıtın əsası DQMV ekstremistləri tərəfindən qoyulmuşdur – Azərbaycanın tərkibindən çıxmaq" – vilayət sessiyasının qərarı.***

***Bu cinayət işi onların vicdanındadır.***

*Qafanda və DQMV-də 2 nəfər öldürülüb, 12 yaş və cavan adam, cavan adamlar.*

- *Manuçarov – "Krunk"un rəhbəri.*

*İlk dəfə olaraq SSRİ-də beynəlmiləlçiliyin bünövrəsi altına dinamit qoyulub 06.03.88-ci il Ali Sovet müəyyənləşdirib".*

**Şərh:** Bir daha təkrarlayıram ki, apardığım qeydlər məhkəməyədək tələsik şəkildə tutduğum tezislər olduğundan, mən bunların geniş şərhinə ehtiyac duyuram.

***Məhkəmədəki çıxışımda Sumqayıt hadisələrinin kökünü DQMV-yə apararaq, qeyd etdim ki, DQMV Xalq Deputatları Sovetinin 20 fevral 1988-ci il sessiyasında qəbul edilən qərar (həmin iclasda DQMV-nin Azərbaycandan ayrılıb Ermənistana birləşdirilməsi qərara alınıb. Qərar 21.02.1988-ci ildə dərc olunub) DQMV-də millətçilik əhval-ruhiyyəsinin əlamətlərinin olduğunu göstərir. Ardınca da bildirdim ki, Sumqayıt hadisələrinin əsasını məhz bu qərarı qəbul edən ekstremistlər qoyublar. Həmçinin, məhkəməyə bu cinayət işinin həmin ekstremistlərin vicdanında qaldığını da söylədim.***

***Bundan əlavə, Sumqayıt hadisələrinin səbəbini izah edərkən, Əsgəranda və DQMV-də gənc azərbaycanlıların öldürülməsini, minlərlə azərbaycanlıların dədə-baba yurdlarından vəhşicəsinə didərgin salınmalarının təhrikedici faktor olmasını əsas gətirdim. Həmçinin, Manuçarovun başçılıq etdiyi "Krunk" cəmiyyətinin fəaliyyətindən danışaraq, bildirdim ki, bu cəmiyyət millətçiliyi, ekstremizmi yaymağa başlayıb, məqsəd də Dağlıq Qarabağı Azərbaycandan ayırıb Ermənistana birləşdirmək olub və bütün bu hallar da Sumqayıtda xüsusi adamlar tərəfindən əhali arasında iğtişaş törədilməsinə zəmin yaratmışdır.***

***Daha sonra SSRİ Ali Sovetinin 6 mart 1988-ci il iclasını xatırladaraq, həmin iclasda səslənən "ilk dəfə olaraq, SSRİ-nin beynəlmiləlçilik bünövrəsinin altına dinamit qoyulub" fikrinin əslində, məhz DQMV Xalq Deputatları Sovetinin sessiyasının 20.02.1988-ci il tarixli qərarından qaynaqlandığını və SSRİ-də beynəlmiləlçiliyin məhz həmin qərarla laxladığını vurğuladım.***

Daha sonra nitqimi yekunlaşdıraraq, məhkəmədən xahiş etdim:

Müəllifin prosesdəki qeydlərindən:


— таблетки (Мам., Гянджа, Исаев, Саф.)
— подошли двое „Бараны идут за мной"
— жена подошли двое
— список
— организатор, но не выявлен
— только у него топор
— „Низами, какой у меня третий или четвертый"

— поручить возб. уг. дело по факту организации через Григоряна
— ч/опред. в адрес следствия

Кафан

Сафаров,
Мамедов

**Tərcümə***: “ – həb paylayırdı (Məmmədov, Gəncəliyev, İsayev, Səfərov)*

- *İki nəfər yaxınlaşdı, “kütbeyinlər arxamca gəilr”*
- *arvadı - iki nəfər yaxınlaşdı*
- *siyahı*
- *təşkilatçıdır, ancaq müəyyən edilməyib*
- *balta ancaq ondadı*
- *“Nizami - məndə neçəncidi, üçüncü, ya dördüncü?”*

***- Qriqoryanın vasitəsilə təşkilatçılıq faktı üzrə cinayət işinin qaldırılmasını xahiş etmək***

***- istintaq barəsində xüsusi qərardad***

*Qafan”*

**Şərh:** ***Yekunda, mən şahid ifadələrinə əsasən, Qriqoryan və digər şəxslərin Sumqayıt hadisələrinin təşkilində cinayətlərini sübut edən, lakin istintaqın araşdırmadığı faktları sadalayaraq, məhkəmədən Sumqayıt***

***hadisələrinin Mərkəz tərəfindən təşkil olunması və Qriqoryanın və digərlərinin təşkilatçılığı ilə həyata keçirilməsi barədə yeni cinayət işinin qaldırılmasını və istintaq dövrü saxtakarlıqlara yol verdiklərinə, hadisələrin təşkilini bilə-bilə gizlətdiklərinə görə, SSRİ Prokurorluğu İstintaq qrupu haqqında xüsusi qərardad çıxarılmasını xahiş etdim...***

Cinayət işi ilə tanış olan peşəkar hüquqşünaslar mənim məhkəmə çıxışıma irad tutub, cinayət işinin bütöv həcmdə, tam, hərtərəfli və obyektiv aparılması üçün yenidən istintaqa qaytarılmasının daha məqsədə uyğun olmasını göstərə bilərlər. Ancaq bilə-bilə ki, istintaqın fikri Sumqayıt hadisələrinin təşkilini, Qorbaçovun çıxışında dediyi kimi, yalnız “xuliqan elementlər”lə bitirməkdir və bu məqsədlə artıq çoxsaylı saxtakarlıqlara yol verilibdir, mən bunu edə bilməzdim. Çünki belə addım cinayət işini bütövlükdə məhv etməyə gətirib çıxara bilərdi. Məhkəmə hökmündən sonra baş verənlər də mənim şübhələrimin haqlı olduğunu tam təsdiqlədi.

Mənim üçün çox ağrılı, təəssüfedici haldır ki, 1989-cu ildə söylədiklərim, az qala hamıya yalvara-yalvara izah etməyə çalışdığım xüsusatlar, məhkəmədən tələb etdiklərim (az sonra SSRİ-nin rəhbər vəzifəli şəxsləri tərəfindən etiraf olunsa da),10 ildən artıq müddətdə mütəmadi olaraq bu məsələni gündəmə gətirmək istəsəm də, ancaq üstündən 20 ildən də artıq vaxt keçdikdən sonra həmyerlilərimin diqqətini cəlb etdi.

Halbuki, bütün şahid ifadələrində, məhkəməyə təqdim olunan sübutlarda və iş materiallarında bu dəstənin iştirakçılarının cinayətləri tamamilə sübuta yetirilmişdi. Dəstə üzvləri, həqiqətən, erməni millətindən olan şəxslərə qarşı ağır cinayətlər törətmişdilər. Bu gün arxiv materiallarını araşdıran hər bir hüquqşünas mənimlə tam razılaşacaq. Məhz bu səbəbdən, prokuror kimi, son nitqimdə də əsaslandırılmış şəkildə yuxarıda göstərdiyim ağır cəzaları istəmişdim.

***Amma... dönə-dönə onu da bir daha vurğulayıram ki, azərbaycanlılar bu cinayəti məhz erməni Qriqoryanın başçılığı altında törədiblər. Məhkəmənin əsas vəzifəsi bunu sübut etmək idi. Lakin...***

## MƏHKƏMƏNİN HÖKMÜ

İndi isə oxuculara məhkəmənin çıxardığı hökmə dair apardığım qeydləri təqdim edirəm:

Müəllifin prosesdəki qeydlərindən:



Gördüyünüz kimi, məhkəmə dediklərimin tam əksini etdi... Eduard Qriqoryanı Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 72-ci maddəsi, 109-cu maddəsinin 3-cü hissəsi, 15-ci maddəsi və 94-cü maddəsinin 2-ci bəndi ilə təqsirli bilib 12 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Vaqif Hüseynovu Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 72-ci maddəsi və 144-cü maddəsinin 3-cü hissəsi ilə təqsirli bilib 6 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Nadir Nəcəfovu Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 72-ci maddəsi və 144-cü maddəsinin 3-cü hissəsi ilə təqsirli bilib 7 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Nizami Səfərovu Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 72-ci maddəsi, 109-cu maddəsinin 3-cü hissəsi və 144-cü maddəsinin 3-cü hissəsi ilə təqsirli bilib 8 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Əfsər İsayevi Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 72-ci maddəsi ilə təqsirli bilib 3 il müddətinə azadlıqdan məhrumetmə cəzasına; Qalib Məmmədovu

Azərbaycan Respublikası Cinayət Məcəlləsinin 72-ci və 144-cü maddəsinin 4-cü hissəsi ilə təqsirli bilib 4 il müddətinə azadlıqdan məhrumetmə cəzasına məhkum edilməsinə dair hökm çıxardı, cinayət işinin qalan hissəsini isə əlavə istintaq aparılması üçün SSRİ prokurorluğuna qaytardı. Əlavə istintaqa qaytarılmış cinayət işi, sonra bildiyimə görə, SSRİ prokurorluğu tərəfindən istintaq aparılması üçün Stavropol diyar prokurorluğuna göndərildi və orada heç bir istintaq hərəkəti aparılmadan cinayət işinə xitam verildi. Bu hal mənim tamamilə düzgün hərəkət etdiyimi bir daha sübuta yetirdi.

Hər kəsə yüngül cəzalar verilmiş, Sumqayıt hadisələrinin Mərkəz tərəfindən Qriqoryan və digəriləri vasitəsi ilə təşkil olunması barədə cinayət işinin qaldırılması, istintaqı natamam aparmış SSRİ Prokurorluğu istintaq qrupu haqqında xüsusi qərardad çıxarılması barədə tələbimə isə, ümumiyyətlə, məhəl qoyulmadan proses yekunlaşdırılmışdır. Əgər məhkəmədə azacıq milli təəssüb, millətinə, tarixinə hörmət hissi olsaydı, Eduard Qriqoryanı sadə bir xuliqan, cinayətkar kimi məsuliyyətə cəlb etməzdi. ***Məhkəmənin birbaşa səlahiyyəti və borcu idi ki, SSRİ Prokurorluğu tərəfindən aparılmış istintaqın materiallarına, əldə olunmuş sübutlara (yuxarıda bir hissəsini sadalamışam), şahid, təqsirləndirilən və zərərçəkənlərin ifadələrinə əsaslanaraq, Sumqayıt hadisələrinin əvvəlcədən planlaşdırıldığına, təşkil olunduğuna dair cinayət işinin qaldırılması haqqında qərardad çıxarsın!*** Lakin məhkəmə dəlil-sübutları bir kənara atıb, SSRİ MK-nın birinci katibi Mixail Sergeyeviç Qorbaçovun “Sumqayıt hadisələri xuliqan elementlərin işidir” fikirlərini əsas götürərək, başına bəla açmamaq üçün işi elə belə də yekunlaşdırmağa qərar verdi...

Bu məhkəmənin nəticəsi isə onunla yekunlaşdı ki, Qriqoryan 12 il cəza aldı, qısa müddət sonra “cəzasını” çəkmək üçün Rusiyaya, oradan da Ermənistana göndərildi. Sonrakı taleyi bəlli deyil.

Bu gün – həmin hadisələrdən 21 il keçəndən sonra işə baxan hakim Mənsur İbayev iddia edir ki, guya, Qriqoryanın cinayəti sübuta yetirilməmişdi. Mən bir daha həmin işdə vəkil qismində iştirak edən Ə.Abdullayevin müsahibəsinə qayıdıb oradan bəzi məqamları diqqətinizə çatdırmaq istəyirəm:

“**N.C. -** Həmin dəstənin başçısı və təşkilatçısının Qriqoryan olması sübut olundumu?

**Ə.A. -** Bəli...

**N.C. -** İsmayılov bildirir ki, o, Sumqayıt hadisələrinin təşkilatçılığı ilə bağlı ayrıca cinayət işinin qaldırılmasını təklif edib, hətta hakim İbayev, Ali Məhkəmənin sədri Hüseyn Talıbov da vəd versələr, sonralar sənədlər məhv edilib və saxtalaşdırılıb. Belə bir təklif olubmu?

**Ə.A. -** Bəli, o, belə vəsatət qaldırmışdı.

**N.C.** - Bəs İbayev nədən vədinə əməl etməyib?

**Ə.A. -** Bu məsələni dəqiq deyə bilmərəm. Çünki bu, hakimin daxili işidir. Yenə deyirəm, bu iş SSRİ Kommunist Partiyası Mərkəzi Komitəsinin nəzarəti altında olub. Belə olanda hakimlərin müstəqilliyindən danışmaq mümkün deyildi. Hakimlər cızılan çərçivədən kənara çıxsaydılar, partiya cəzası alacaqdılar ki, onlar da belə şeydən qorxurdular...

**N.C**. - Bəs Mənsur İbayevə kim təsir edə bilərdi?

**Ə.A. -** Bilirsiniz, İbayevin yanına naməlum adamlar gəlirdi və ona təzyiq sezilirdi. O bilirdi ki, proses partiya nəzarətindədi. Heç kim güman etməzdi ki, SSRİ dağılacaq, əgər o, verilən göstərişdən kənara çıxsaydı, başqa cür olardı. ***İbayev özünü qorudu, yəqin, ona dedilər ki, Qriqoryana güllələnmə hökmü çıxarsa, başağrısı olar.*** Yalnız erməni qızının ifadəsi ilə 12 il azadlıqdan məhrumetmə cəzası çıxartdı. ***Ancaq tam sübutlar vardı ki, Qriqoryan barəsində ölüm hökmü çıxartsın.*** İstintaqda verilən ifadələr məhkəmədə yetərincə araşdırılsaydı, məlum olacaqdı ki, rəhbərliyi Qriqoryan edirmiş. Ancaq təqsirləndirilən şəxslər üçün elə vəziyyət qurulmuşdu ki, gəlin, biri-birimizin əleyhinə ifadə verməyək və özümüzü də bununla qurtaraq. Onları kimsə idarə edirdi..."

Qeyd etmək istəyirəm ki, bu müsahibədə bəzi yalnışlıqlara yol verilsə də mahiyyət olduğu kimidir.

Bilavasitə iştirakçısı olduğum proses haqqında danışarkən, Sumqayıt hadisələri ilə bağlı həbs olunmuş Əhməd Əhmədov barəsində də bəzi məqamları oxucuların diqqətinə çatdırmaq istəyirəm. Belə ki, Ə. Əhmədovun məhkəmə prosesi qanuna zidd olaraq, Azərbaycanda deyil Moskvada keçirildi. Mərkəzin xeyir-duası və bütün dünya mətbuatının iştirakı ilə erməni millətçiləri Silva Kputikyan, Zori Balayan və onların muzdlu nökərlərinin dəstəyi sayəsində Moskvada məhkəmə yox, bir "şou" düzənləndi. Ə. Əhmədovun təqsirləndirilən şəxs kimi adi insani haqları belə pozuldu. Həmin prosesdə onunla birlikdə icraçı qismində məsuliyyətə cəlb edilib həbs olunan 2 nəfər azərbaycanlının işi məhkəmədə sübuta yetirilmədiyindən, əlavə istintaqa qaytarıldı. Məhkəmə prosesində cinayəti ümumiyyətlə sübuta yetirilməyən, iştirakçılar olmadan təşkilatçı qismində Əhməd Əhmədov isə güllələnmə hökmünə məhkum edildi və az sonra tələm-tələsik də güllələndi...

Axı icraçıların kim olduqları müəyyənləşdirilməyibsə, Əhmədov nəyi təşkil edə, kimlərə göstəriş verə, kimlərə rəhbərlik edə bilərdi? Məhkəmə bunları nəzərə almadı və Əhməd Əhmədov təqsiri sübuta yetirilmədiyi halda, güllələndi! Qriqoryan isə təşkilatçı kimi cinayəti tamamilə sübuta yetirildiyi halda, 12 il müddətinə azadlıqdan məhrumetmə cəzasına

məhkum edildi...

Əziz oxucular!

Arxiv materiallarından, sizə təqdim etdiyim fotoşəkillərdən Qriqoryanın cinayətinin sübuta yetirilmədiyinimi düşünürsünüz?! Mən əminəm ki, bu materiallara baxan hər bir hüquqşünas məhkəmənin nə dərəcədə qeyri-obyektiv yekunlaşdığının şahidi olacaq. Məhz Azərbaycan rəhbərliyinin və şəxsən Mənsur İbayevin cəsarətsizliyi və qətiyyətsizliyi ucbatından Qriqoryanın, digər təşkilatçıların və sonradan bunların vasitəsilə Mərkəzin başında dayanan Qorbaçovun Azərbaycan xalqına qarşı törətdikləri cinayətlər vaxtında ifşa olunmadı.

Əminəm, nə vaxtsa Azərbaycan səlahiyyətliləri, tarixçiləri Sumqayıt hadisələri ilə bağlı bütün cinayət işlərini, əsasən "Qriqoryan işini" tapıb araşdıracaq, erməni millətçilərini və onların muzdlu nökərlərini, başda Qorbaçov olmaqla, ifşa edəcəklər. Əgər bunu etməsək, biz bütün dünya parlamentləri qarşısında erməni millətçilərinin növbəti dəfə "soyqırım" böhtanına məruz qalacağıq. Bu dəfə həmin soyqırımın adı "Sumqayıt soyqırımı" olacaq. Artıq onlar bu fəaliyyətə "qədəm" qoyublar. Sumqayıt hadisələri ilə bağlı hadisələrin ildönümü ərəfəsində ictimaiyyətin fikrini bir daha bu hadisələrin araşdırılmasına yönəltmək üçün 26 fevral 2010-cu il tarixdə www.1news.az saytına müsahibə verdim. 2 mart 2010-cu il tarixdə isə həmin saytda "Azərbaycan Baş prokurorluğu Ermənistan Baş prokurorluğunun təxribatını ifşa etdi" başlıqlı xəbəri oxudum. Həcmi heç bir səhifə olmayan həmin xəbərdə Ermənistan Baş prokurorluğunun öz saytında yerləşdirdiyi materiallar təxribat adlandırılır və Sumqayıt hadisələrinin istintaqını aparan prokurorun aşkar etdiyi faktların həmin saytda yerləşdirilməsinin yaddan çıxdığı vurğulanırdı. Məsələnin əslini görmək üçün Ermənistan prokurorluğunun www.genprok.am saytına baxmaq qərarına gəldim. Həqiqətən, orada ermənilərin özlərinin aşkarladığı saxta faktlar kifayət qədər idi. Ancaq mən başqa faktın da şahidi oldum. Belə ki, onlar öz saytlarında "Sumqayıt" adlı xüsusi bölmə açıb oranı saxta sənədlərlə doldurmuşdular. Və mən bunları gördükdən sonra əmin oldum ki, növbəti dəfə həmin o saxta sənədlər Azərbaycan adlı məmləkətə baş ağrısı gətirəcək. Bizimkilər isə bunu dərk etməyərək, bəyanat verməklə kifayətlənmişlər. Heç o bəyanatdakı məlumatları da düzgün verməmiş, mənim Sumqayıt hadisələrində kim olduğumu belə, səhv göstərmişlər, çünki həmin işdə mən istintaqı aparan yox, SSRİ prokurorluğu tərəfindən istintaqı aparılmış Sumqayıt hadisələri ilə bağlı cinayət işində dövlət ittihamını müdafiə edən prokuror olmuşam. Bu yerdə, vaxtilə Rusiyanın Baş Naziri olmuş V.S.Çernomırdinin sözlərini xatırlamamaq olmur. V.Çernomırdin başçılıq etdiyi Nazirlər Kabinetinin növbəti yarıtmaz işini gördükdə

demişdi: “Bir dəfə yaxşı etmək istədik, ancaq həmişəki kimi alındı”. Bizim prokurorluğun bu sayaq işlərini və kitabın ikinci hissəsində daha ətraflı qeyd edəcəyim halları gördükdən sonra, peşəmi müvəqqəti dəyişib, bu hadisələrlə bağlı kitab yazmaq qərarına gəldim - necə alınacaq, Sizlər qiymət verərsiniz.

# SUMQAYIT

# HADİSƏLƏRİNİN

# TƏFƏRRÜATI

## SUMQAYITA GƏTİRƏN YOL – SƏBƏBLƏR VƏ NƏTİCƏLƏR...

Bu kitabı yazmaqda məqsədim bilavasitə iştirakçısı olduğum “Sumqayıt prosesi”nə aydınlıq gətirmək və məhkəmə işi ətrafında baş verən hadisələri təsvir etməklə, onu yekunlaşdırmaq idi. Əlimdəki sənədlərlə işləyərkən, istər-istəməz sırf prosesə aidiyyatı olmayan, ancaq məlum hadisələrlə əlaqədar başqa materiallarla da tanış oldum və rastlaşdıqlarım məni dəhşətə gətirdi. Təbliğatda ermənilərdən geri qaldığımızı bilirdim, ancaq bu dərəcədə olduğunu təsəvvür etməzdim.

20 ildən artıq zaman kəsiyində Sumqayıt hadisələrinin ardınca başlayan Qarabağ münaqişəsinin qızışma nöqtəsi, onun inkişaf tempi, bunda SSRİ, həmçinin Azərbaycan rəhbərliyinin, digər güc mərkəzlərinin rolu, marağı, Sumqayıt hadisələrinin əsl səbəbləri, onun kimlərin vicdanında qalması, ümumiyyətlə, Azərbaycanın tarixinin və coğrafiyasının bugünkü duruma gəlib düşməsi ilə bağlı öz fikirlərim, qənaətlərim var idi. Bu istiqamətdə araşdırmaya başladıqda, adlarını çəkdiyim professor Ç.Sultanovun çoxsaylı əsərlərindən, qismən də politoloqlar R.Ağayev və Z.Əlizadənin birgə yazdıqları kitabdan savayı, mənzərəyə aydınlıq gətirən, diqqətimi cəlb edən hər hansı başqa bir dəyərli, mükəmməl mənbəyə rast gəlmədim. Ermənilərin mövqeyini müdafiə edən saxta materiallar isə saysızdır. Ona görə də “Sumqayıt prosesi” ilə bağlı kitabı bir qədər genişləndirmək barədə düşündüm. Amma o dövrkü hadisələr barəsində yazıb-yazmamağıma dair ciddi tərəddüddə qaldım, çünki görəcəyim iş həm mənim peşəm deyildi, həm bunun üçün xeyli vaxt, əhatəli araşdırma tələb olunurdu. Buna baxmayaraq, fikirləşdim ki, kitabı oxuyan hər kəsin mənim bildiyim və Azərbaycanın həm tarixinə, həm də taleyinə təsir etmiş bəzi faktları, heç olmasa tezis formasında öyrənməyə haqqı çatır.

Bildiklərim, mənə məlum olanlar əsasında məsələnin kökünə, mahiyyətinə aparıb çıxaran bir “yol xəritəsi” cızdım. Və bu xəritə də məni düz əsas ünvana gətirib çıxardı: Qarabağda sonradan baş verənlərin özülü Sumqayıtda qoyulmuşdu və vahid bir planın tərkib hissələriydi!

Sözsüz ki, bu hadisələr Azərbaycanın başqa şəhərlərində də törədilə bilərdi və buna cəhdlər də olub. Planın niyə məhz Sumqayıtda baş tutması da mənimçün aydındır. Ancaq bu barədə danışarkən, ardıcıllığı pozmaq istəmirəm, ona görə də DQMV-yə qayıdıb məsələni başından təsvir etmək istəyirəm.

Bu gün ermənilər Qarabağın əzəli və əbədi erməni torpaqları olmasını, ermənilərə qarşı türklərin etnik təmizləmə siyasəti apardıqlarını bütün dünyaya sübut etməyə çalışırlar və bu işdə heç bir saxtakarlıqdan

çəkinmirlər. Baxmayaraq ki, 2005-ci ildə Türkiyə Prezidenti A.Gülün keçmiş Ermənistan Prezidenti R.Köçəryana əldə olan bütün arxivləri açmaq və dünya tarixçilərinin sərəncamına vermək təklifi indiyədək cavabsız qalıb. Onların sübut kimi təqdim etdikləri sənədlərin mənbəyi, mənşəyı bəlli deyil, tarixçi olmadığımdan hansısa tarixi araşdırmalar aparmaq fikrində deyiləm, ancaq bu gün əlimdə olan və 1823-cü ildə rus məmurları tərəfindən tərtib edilmiş "Qarabağ əyalətinin təsviri" adlı sənəddəki məlumatları diqqətinizə çatdırmaq istəyirəm: **"...Qarabağ xanlığında 90 min sakin, bir şəhər və 600-dən çox kənd, o cümlədən 150 erməni kəndi vardı. Şuşa şəhərində Zaqafqaziya türklərindən (azərbaycanlılardan) ibarət 1948 ailə və ermənilərdən ibarət 474 ailə yaşayırdı. Kəndlərdə müvafiq rəqəmlər 12.902 və 4.331 olmuşdur".**

XX əsrdə Qarabağı Ermənistana birləşdirməyə dair cəhdlər olub, onlardan birinin qarşısını Nəriman Nərimanov, digərini isə Mircəfər Bağırov alıb. Buna görə də ermənilər Qarabağı dinc yolla, rəhbərliyin basqısı ilə almağın mümkünsüzlüyünü görərək, başqa taktikaya əl atmalı oldular. Elə bir plan hazırladılar ki, millətlərarası çaxnaşma salıb, ondan istifadə etməklə Qarabağı Azərbaycanın tərkibindən ayırmağa müvəffəq olsunlar. DQMV-nin Azərbaycandan ayrılacağı planının ilk qaranquşu Z. Balayanın "Ocaq" kitabı oldu. Kitab ilk dəfə 1983-ci ildə çapdan çıxanda, "EÜH" (Erməni Ümummilli Hərəkatı) və "KRUNK" təşkilatlarının ideoloji bazası rolunu oynamağa başladı və bu təşkilatların ideya-siyasi planlarının müjdəçisinə çevrildi. İkinci dəfə isə, 1985-ci ildə Qazax rayonunda, Azərbaycan torpaqlarında ermənilərin qanunsuz təsərrüfatlar salması ilə Azərbaycan SSR və Ermənistan SSR arasında son on illərdə ilk dəfə ərazi insidenti baş verdi. Hər iki cəhd millətin siyasi duyumunu, onun millətçi çağırışlara münasibət bildirmək qabiliyyətini sınaqdan keçirmək məqsədilə edilmişdi. Sınaq uğurlu keçmişdi. SSRİ rəhbərliyi tərəfindən ermənilərin bütün hərəkətlərinə dəstək verilir, azərbaycanlıların isə ən həyasız haqsızlığa müqaviməti, az qala, dövlətə xəyanət kimi qiymətləndirilirdi.

Bundan sonra - 10 sentyabr 1985-ci ildə erməni yazıçı Xanzadyan məktubla M. Qorbaçova müraciət edərək, DQMV-nin Ermənistan SSR-in tərkibinə verilməsini tələb edir. Xanzadyan məktubunda deyir: **"Qarabağ olmasa, bizə heç bir yenidənqurma lazım deyil!"** Qorbaçov bu ultimativ xarakterli məktubun ağırlığını və onun təsir gücünü dərk edir və özünün də sona qədər anlamadığı "yenidənqurma"sının taleyindən narahat olur. Çünki ona özünün "dahiliyini", sərsəm ideyalarını, boşboğazlığını dünyaya sırımaq üçün erməni diasporunun təbliğat maşını hava və su kimi lazımıydı və o, bunu itirmək istəmirdi.

1987-ci ilin axırlarından başlayaraq, Moskvadan və Yerevandan

yüksək vəzifəli və tanınmış qonaqlar tez-tez Stepanakertə gəlirlər. Moskva və Yerevan Universitetlərində Mikoyanın oğlu və Z.Balayan çıxış edir. Kremlin siyasi mətbəxinə yaxın olan akademik A.Aqanbeqyan da bu təbliğata qoşulur...

Bundan əvvəl isə Baş katibin xanımı R.M.Qorbaçova ABŞ-a ilk səfəri zamanı gözlənilmədən Erməni Mədəniyyət Mərkəzinə səfər etmiş, orada hamını təəccübləndirən və yaddaşlara həkk olunan belə bir cümlə işlətmişdi: **"Biz erməni xalqı ilə sovet xalqları arasında dostluğun möhkəmlənməsinə tərəfdarıq..."** Baş katibin xanımı bununla nə demək istəyirdi?! Erməni xalqı "sovet xalqı" deyildimi?! Əgər R.Qorbaçova "rus xalqı ilə erməni xalqı arasında dostluğun möhkəmlənməsinə tərəfdarıq" desəydi, bu, anlaşılan olardı. Ancaq onun fikrini məhz bu cür ifadə etməsinin özü Qorbaçov cütlüyünün erməni xalqına olan müstəsna münasibətindən xəbər verirdi. Bu cütlükdə kimin daha çox söz sahibi olması isə mübahisə mövzususuna çevriləcək məsələdir. Bu gün erməni xalqı iddia edir ki, Azərbaycanla münasibətlər məhz 88-ci ildən Sumqayıt hadisələrindən sonra korlandı. O zaman Baş katibin xanımının vaxtından əvvəl edilmiş bəyanatı nəyə dəlalət edirdi?!

Bundan əlavə, həmin Mərkəzin səfər obyekti kimi seçilməsi də, yəqin ki, təsadüfi deyildi. Deyilənə görə, bu obyekt səfər proqramına lap son dəqiqədə daxil edilmişdi. R.M.Qorbaçovanın Erməni Mədəniyyət Mərkəzində hədiyyə kimi qəbul etdiyi qiymətli əşyalar əhvalatı da bu epizodla bağlıdır. Bu faktın özü isə DQMV-nin beynəlxalq orbitə çıxarılması tarixinə ciddi "kriminal çalarlar" qatır. Belə ki, ABŞ–ın erməni diasporundan bahalı zərgər bər-bəzəyini qəbul edərkən, R. Qorbaçovanın dediklərinə baxaq: "Bu, sovet və erməni xalqları arasında (!?) dostluğun möhkəmlənməsinə xidmət edəcəkdir". Görünür, bu parça təsadüfən (və ya qəsdən) Mərkəzi televiziyada verilmişdi, axşamkı proqramda isə o, artıq kəsilmişdi. Sovet rəhbərinin və onun xanımının bahalı və adi pul şəklində bəxşişlərə meylli olması bəzilərində şübhə doğura bilər, mən isə Stavropol diyarında məhkəmə sədri işlədiyimdən, onların bu sahədəki "bacarıq və aludəçiliklərinə" qəti şübhə etmirəm, çünki Qorbaçov fəaliyyətinə Stavropoldan başlamışdır. Orada isə o "Mişa konvertik" adı qazanmışdır. Ona görə də Qarabağ məsələsində "kriminal çalarlar"ın mühüm rol oynaması fikri mənim üçün təəccüblü, gözlənilməz deyildi.

Əvvəldə qeyd etdiyim kimi, təbliğata akademik Abel Aqanbekyan da çox fəal şəkildə qoşulmuşdu. Alim Ç. Sultanov "dahi sovet iqtisadçısı", akademik A.Aqanbekyan haqqında "Arası kəsilmiş uçuş. İkinci cəhd" kitabında yazır: "BAM tikintisinin əsaslandırılması "böyük iqtisadçı" Aqanbekyanı xarakterizə edir. BAM-ın dəyəri 1991-ci ilin qiymətlərinə

görə, 12 milyard rubl və ya o zamankı kursa görə, 7,5 milyard dollar təşkil edirdi. Aqanbekyan və onun komandasının hesablamalarına görə, BAM-ın öz xərcini ödəmə müddəti 10 il idi; çox illər keçib, ancaq öz xərcini ödəmədən isə söhbət belə getmir. Dünya təcrübəsi göstərir ki, belə nəhəng tikintilərin oz xərcini ödəməsi barədə böyük ehtiyatla danışmaq lazımdır; onlar, hər şeydən əvvəl, prestij xarakteri daşıyır və bunu yalnız iqtisadiyyatı güclü olan ölkələr özünə rəva bilər (məsələn, La-Manşın altından keçən İngiltərə-Fransa tuneli hələ də itkilidir). Bu gün BAM, demək olar ki, SSRİ-nin zəif iqtisadiyyatına hiss olunacaq zərbəni vurdu. Əgər bu gün məlum olsa ki, BAM-ın tikilməsi məsələsində Aqanbekyana məsləhətlər okeanın o tayından verilib, müəllif təccüblənməz: SSRİ-nin zəif iqtisadiyyatına son dərəcə gözəl zərbə vurulub - onun iqtisadi qüdrətinin güclənməsi adıyla o dağıdılıb."

Əhalisi pis vəziyyətdə yaşayan SSRİ elminin yüksək səviyyədə olması, aparıcı ölkələrin elm ocaqları ilə rəqabət aparması heç kimdə şübhə doğurmur. Məhz Aqanbekyan kimi elm dəllalları bu sıraya qoşulduqdan sonra SSRİ elmi də çökdü. Aqanbekyanın barəsində Rusiya prokurorluğu tərəfindən "yaşadığı Vətənin sirrini satdığına görə", qaldırılmış cinayət işi də onun şəxsiyyətini xarakterizə edən haldır.

Ancaq Aqanbekyan sovet vaxtı ölkənin partiya və dövlət başçıları ilə sıx əlaqəsinə görə tanınmışdı. Siyasi Büronun heç bir mühüm qərarı onun iştirakı olmadan müzakirə olunmurdu. Akademik Abel Aqanbekyan 1987-ci il noyabrın ortalarında Fransanın Erməni İnstitutu və Erməni Veteranları Assosiasiyasının onun şərəfinə təşkil etdiyi qəbul zamanı, bildirmişdi ki, o, Qarabağın ermənilərdə olması barədə rəyləri öyrənmək arzusundadır. O demişdi: "Mən bir iqtisadçı kimi, hesab edirəm ki, o, Azərbaycandan çox, Ermənistanla böyük əlaqədədir". Dağlıq Qarabağ hadisələrinin müqəddiməsi də elə A.G.Aqanbekyanın Parisdəki bu çıxışı olmuşdur. Şəxsiyyətinə böyük hörmət bəslədiyim professor Çapay Sultanov həmin çıxış barədə özünün "İblis damğası ilə" kitabında yazır: **"...Moskvada geniş miqyasda şaiyə gəzirdi ki, Aqanbekyan özünün Qorbaçovla söhbətinə istinad edib. Söhbətdə Sov.İKP MK-nın qüdrətli Baş Katibi, guya, deyib ki, Qarabağ Ermənistana veriləcək. Qəribədir, bu fövqəl möhkəm şaiyəyə baxmayaraq, Qorbaçov nə o vaxt, nə sonra, hətta Qarabağ müharibəsinin qızğın vaxtında da nə birbaşa, nə də dolayısı ilə bunu təkzib etmədi."** Hamı bilir ki, Qorbaçov onun adına xələl gətirəcək hər şeydən imtina edir və bu zaman utanmadan milyonların qarşısında yalan danışmaqdan belə çəkinmirdi. 9 aprel 1989-cu il tarixdə Sovet ordusunun Tiflisdə törətdiyi vəhşiliyin SSRİ deputatlar Sovetinin növbəti qurultayında müzakirəsini, ordu generalı Rodionov və digər qurultay iştirakçılarının çıxışlarını,

yəqin, çoxları Mərkəzi televiziyadan izləyiblər. Həmin müzakirə zamanı Qorbaçovun cilddən-cildə girməsi, milyonların gözü qarşısında yalan danışması, hadisələrdən xəbərsiz olmasını deməsi onun nələrə qadir olduğunu göstərdi. Bu artistliyini o, demokrat imicini qorumaq üçün edirdi. Onun adından Aqanbekyanın danışmasına heç vaxt yol verməzdi.

Bundan əlavə, heç kim üçün sirr deyildi ki, Aqanbekyan rəhbərliyin xoşuna gəlməyəcək, daha dəqiq desək, rəhbərliklə öncədən razılaşdırmadan heç bir ifadə işlətməz və heç bir şaiyə buraxmazdı. Qorbaçovun da gəzən şaiyələrə etiraz etməməsi məhz bunun bilavasitə sübutudur.

1987-ci ildən etibarən, Ermənistanın azərbaycanlılar yaşayan hər yerində - hətta dayanacaqlarda, evlərin darvazalarında belə, azərbaycanlıların həmin torpaqlardan qovulacağına dair çağırışlar səslənirdi. Ölkədə və xaricdə isə belə bir versiya yayılmışdı ki, guya, azərbaycanlıların Ermənistandan qovulması yalnız Sumqayıt hadisələrindən 8 ay keçəndən sonra başlanıb. Həqiqət isə tamam başqa cür idi.

Hələ 1985-ci ildə Qazax rayonu ərazisində 3 respublikanın dostluğunu tərənnüm edən böyük abidə partladılır. Partlayışı törədən hadisə yerində yaralandığından, onun şəxsiyyəti müəyyən edilir. Bu, "Eçmiədzin"in (erməni katolik kilsəsi-A.İ.) keşişi Stepan ata olur. "Eçmiədzin"in bütün bu hadisələrdə rolu xüsusi araşdırılmalı olduğundan, mən ona ümumiyyətlə, toxunmayacam.

1986-cı ildə "Qarabağ məsələsi" hələ qeyri-rəsmi şəkildə qaldırılandan dərhal sonra və növbəti ildə əsasən Ermənistanın Qafan və Mehri rayonlarından olan qaçqınlar Azərbaycana gəlir. Azərbaycan hökuməti Sumqayıtda və onun ətrafında məskunlaşmış həmin qaçqınlar haqqında 1986 və 1987-ci illərdə xüsusi qərarlar qəbul edir, lakin "xalqlar dostluğu" ideyası naminə, bu məsələni o qədər də nəzərə çarpdırmır. Qeyd edim ki, bu, Azərbaycan rəhbərliyinin ən böyük xətası olur. Qarabağın Azərbaycandan ayrılması prosesinə çoxdan start verilməsinə baxmayaraq, ölkə rəhbərliyi hələ də "xalqlar dostluğu"na xələl yetirmək istəmir, problemin "güclü Mərkəz" tərəfindən həll ediləcəyinə böyük ümid bəsləyir.

Lakin heç də hər şey Azərbaycan rəhbərliyinin ümid etdiyi kimi olmur. 1988-ci il yanvarın 25-də, fevralın 18 və 23-də azərbaycanlı qaçqınların növbəti dəstəsi Ermənistandan Azərbaycana köç edir. Onların sayı 4 min nəfərə çatır. Politoloq, 1987-1990-cı illərdə azərbaycanlıların Ermənistan SSR-dən qovulması tarixini tədqiq etmiş Arif Yunus göstərir ki, 1987-ci il noyabrın 20-si günlərində şəxsən o, Qafan rayonundan gələn qaçqınlarla dolu dörd avtobusu qarşılayıb. Qafan rayon partiya komitəsinin ikinci katibi Armais Babayan Britaniyalı jurnalist Tomas de Vaala verdiyi müsahibəsində 1987-ci ilin noyabrında azərbaycanlıların Qafan rayonundan

köçüb getməsi faktını inkar etmir, bildirir ki, guya, onlara qarşı hər hansı zorakılıq halları olmayıb, azərbaycanlılar isə nədənsə qorxduqları üçün köçüb gediblər.

Heç bir normal düşüncəyə malik insan iddia edə bilməz ki, minlərlə insan heç bir ciddi səbəb olmadan eyni vaxtda böyüyüb boya-başa çatdığı dədə-baba yurdundan bir çöp götürmədən, çıxıb gedə bilər. Bu, qeyri-mümkündür.

Bundan başqa, həmin anları qeydə alan videoyazılara dəfələrlə rast gəlmişəm, ancaq heyf ki, biz bu mübahisəsiz halı da dünyaya çatdıra bilməmişik. Azərbaycan SSR DTK-nın sabiq sədri general-mayor V.A.Hüseynov da “Moskovskiy Komsomolets” qəzetinin 06 fevral 2004-cü il tarixli nömrəsində dərc edilmiş müsahibəsində göstərib ki, artıq 1988-ci ilin fevral ayının əvvəllərində Azərbaycan SSR-də Ermənistan SSR-dən bir neçə min qaçqın vardı.

Ə. F. Daşdəmirov (1988 - 1991-ci illərdə Azərbaycan KP MK-nın katibi) göstərir: “Ermənistanda vahimə şəraitinin qızışdırılması və zorakılıq hərəkətləri nəticəsində oranı tərk etməyə məcbur olmuş azərbaycanlıların sayı 1988-ci il fevralın 18-nə qədər dörd min nəfəri keçmişdi” (Vestnik Analitiki, №3, 2005).

Ermənistandan olan azərbaycanlı qaçqınların söylədiklərindən bakılı jurnalistlərin qeydə aldıqları bir neçə nümunəni də nəzərinizə çatdırıram:

Masis rayonunun “Ararat” sovxozundan olan Hüseyn Qəmbərov: “1988-ci il fevralın 19-dan sonra biz bir gecə də yatmamışıq. Qonşu kəndlərdən olan azərbaycanlılar bizim qəsəbəyə - Masis rayonunun Kalinin adına qəsəbəsinə toplaşmışdılar. Qəsəbəni sərhəd hissələri qoruyur. Oradakı Azərbaycan məktəbini bağlayıblar. Sakinlər öz təhlükəsizliyini təmin etmək üçün gecələr kəndin və ya qəsəbənin mərkəzində tonqal ətrafında toplaşır, 10-20 nəfər kişi evləri qoruyurdu. Buna baxmayaraq, elə gecə olmur ki, bizim evlərdən biri yandırılmasın. Qocalar, qadınlar, uşaqlar paltarlı, hətta ayaqqabılı yatırlar ki, lazım gəlsə, durub qaça bilsinlər”.

Ararat rayonunun Kiçik Vedi kəndindən olan Qəmbərovun bacısı Püstə əlavə edir: “Bizim kənddə azərbaycanlı evlərinin hamısının bütün pəncərələrini sındırdılar, meyvə ağaclarını kəsdilər, istixanaları dağıtdılar. Azərbaycan məktəbi fevralda bağlanmışdı...” (Vestnik Analitiki, №3, 2005).

Kolxozçu Hümbət Abbasov: “Biz Masis rayonunun Artaşat kəndindənik. Bizim kənddə 3 evi yandırdılar – U.Abdullayevin, A.Sadıqovun və Nizaminin evini. 1988-ci il fevralın 19-dan bizi bazarlara buraxmırlar, zəhmətlə yetişdirdiyimiz məhsul zay olur. Fevralın 19-dan sonra Ermənistanın xəstəxanalarında, poliklinikalarında, tibb məntəqələrində aparılan qeydiyyatlarda bir azərbaycanlı soyadı tapa bilməzsiniz. Hərçənd,

orada 200 min azərbaycanlı yaşayır. Bizə çörək və ərzaq satmırlar. Bizi şəhər nəqliyyatına buraxmırlar. Fevralın 19-dan bəri azərbaycanlıları heç bir səbəb olmadan kütləvi şəkildə işdən qovmağa başlayıblar. Onlar sözün əsl mənasında bizim üzümüzə tüpürürdülər və qışqıraraq - "Türklər, erməni torpağından rədd olun!"- deyirdilər". (Vestnik Analitiki, №3, 2005).

İndi isə nəzərinizə milliyyətcə yəhudi olan, Azərbaycan jurnalistikasında xüsusi çəkiyə malik **Saveliy Peretsin** 2001-ci ildə Təl-əvivdə çap olunan həftəlik "Meridian" jurnalında silsilə şəkildə getmiş "Odlara qalanmış yurd yeri" sənədli povestindən bir hissəsini nümunə gətirmək istərdim. Xatırladım ki, **Saveliy Perets** Azərbaycan SSR-yə rəhbərlik edənlərin çıxışlarını hazırlayan, son dövrlər isə Ə. Vəzirovun köməkçisi olan və onun qırıcı təyyarədə Azərbaycandan Moskvaya qaçmasından sonra Bakıda həyatına təhlükə yaranması səbəbiylə İsrailə mühacirət edən şəxs olub. O, qeyd etdiyim sənədli povestində yazır:

"...Bu isə Cermuk şəhərinin 2 saylı məktəbinin artıq keçmiş müəllimi Nazəni Gəncəliyevadır:

- Fevralın 25-i Cermukda nümayiş keçirilirdi. Dərs vaxtı biz kütlənin uğultusunu eşitdik. Uşaqların – bizdə 166 azərbaycanlı oğlan və qız oxuyurdu – sifətləri ağappaq olmuşdu. Mən pəncərəni açıb erməni dilində səsləndim: "Bura nəyə gəlmisiniz? Çıxın gedin, bura müqəddəsdi! Siz bizdən, uşaqlarımızdan nə istəyirsiniz?" Cavabında məni nalayiq sözlərlə təhqir etdilər və daşladılar, məni də, mənim ailəmi də məhv edəcəklərini qışqırdılar."

Həmin gün Ermənistanın hər yerində, avtobus dayanacaqlarında, azərbaycanlılar yaşayan evlərin darvazalarında və qapılarında vərəqələr, plakatlar asılmışdı. "Müraciətnamə"lərdən birində bu sözlər yazılmışdı:

***Ermənistan xalqı!***

***1915-ci ilin qanlı günlərini heç vaxt unutma, Tələt paşa, Ənvər paşa, Camal paşa tərəfindən sənin başına gətirilmiş dəhşətli müsibətləri unutma! Yaşa və unutma!***

***Erməni adını daşıyan hər kəs!***
***Türkü öz torpağından qov!***
***Onu erməni bulaqlarından su içməyə qoyma!***
***Onu erməni qadınının bişirdiyi çörəyi yeməyə qoyma!***
***Türklər, bizim şəhərdən rədd olun!"***

Bir məqamı da qeyd etməyi özümə borc bilirəm. Belə ki, erməni millətçiləri çox vaxt deputat mandatları, siyasi dəstəklər və ya sadə bəxşişlər xatirinə muzdlu nökərlərə çevrilmiş şəxslərin səsləndirdikləri fikirlərə istinad edərək, dünya ictimaiyyətini aldatmağa çalışırlar. Ancaq yuxarıda

oxuduğunuz fikirlərin müəllifi olan Saveliy Perets heç də həmin "muzdlu nökərlər"dən deyil, əksinə, tarix qarşısında məsuliyyətini dərk edən, haqlı tənqiddən heç bir zaman çəkinməyən və məhz bu xüsusiyyətinə görə Azərbaycanda yaşadığı son günlərdə təzyiqlərə məruz qalaraq Azərbaycanı tərk etmək məcburiyyətində qalan birisidir.

Oxuduqlarınızdan görürsünüz ki, azərbaycanlıların Ermənistan SSRİ-dən qovulması prosesinə Qarabağ münaqişəsindən və Sumqayıt hadisələrindən xeyli əvvəl start verilmiş, Sumqayıt hadisələrinə bir neçə gün qalmış isə bu proses xüsusi vüsət almışdır.

Ardıcıllığı pozmadan, artıq Qarabağın işğalı planının kuliminasiya nöqtəsi olan 1988-ci ilə gəlib çatmışıq. Son nöqtəni qoymaq üçün azərbaycanlıları dünyaya "vəhşi millət" kimi tanıtmaq lazım idi. Bunun üçünsə tam münbit şərait yaradılmışdı. Ermənistan üçün bu ildən sonra artıq Qarabağı hissə-hissə işğal etmək mərhələsi başlayacaqdı. Dünyanın etirazına səbəb olmadan, Qarabağın işğalına əsaslı zəmin hazırlanmışdı.

Lakin burada dayanıb çox mühüm bir məqamı nəzərinizə çatdırmaq istəyirəm. Bu gün bütün arxiv materiallarını, memuarları, tarixi xronologiyanı araşdırdıqca, Stavropolda şahidi olduğum bir çox epizodlar yadıma düşür. Zelençukdan tanıdığım yüksək rütbəli şəxslərlə çoxsaylı təmaslarım olurdu. Bu görüşlərdə mən həm də çoxlu maraqlı insanlarla tanış olur və həddindən artıq maraqlı da söhbətlər eşidirdim. Məhz belə söhbətlərdən biri 1986-cı ilin payız aylarında baş verdi. Qeyd edim ki, yazdığı kitablardan biri də hələ Azərbaycan dilinə tərcümə olunmayan, lakin Azərbaycan tarixi üçün çoxsaylı araşdırmaların, əsərlərin müəllifi olan, məşhur professor Çapay Sultanov da bu epizod barədə özünün "Сквозь призму шахмат" kitabında yazıb.

Belə ki, 1986-cı ilin məhsul yığımı zamanı, artıq sizə tanış olan Stavropol Pedaqoji İnstitutunun rektoru Smirnov Boris Valentinoviç mənə zəng vuraraq, Yessentukiyə - Kirov adına KP MK-nın sanatoriyasına – onun yanına gəlməyimi xahiş etdi. Mən qonaqlığa gəlib çatdım. Smirnovun yanında onun Pribaltikadan olan iki dostu vardı. Bir müddətdən sonra onun dostları getdi və yaxşı əhval-ruhiyyədə olan Smirnov onunla birlikdə Zelenokumsk şəhərinin Sovetskiy rayonuna, rayon partiya komitəsinin Birinci katibi, dostu, ona qədər tanımadığım Georgiy Savelyeviç Xurvatovun yanına getməyi təklif etdi. Xurvatov bizi rayon partiya komitəsinin Birinci katibinin qonaq evində qəbul etdi. Qonaqlıq zamanı başa düşdüm ki, Xurvatov da Qorbaçovun yaxınlarından olub. Eyni zamanda, anladım ki, həmsöhbətlərimin altmışdan artıq yaşlarının olmasına baxmayaraq, hər ikisi SSRİ-də, ən azı, nazir vəzifəsi tutmaq arzusu ilə yaşayırlar. Bu söhbətdə Smirnov çox tez-tez Qorbaçovun onun xidmətlərini, yaxşılıqlarını,

Qorbaçovu irəli çəkməsini unutduğundan gileylənirdi. Xurvatov onu bu fikirdən daşındırmağa çalışsa da, özü də bəzən Qorbaçovdan narazılıq edirdi. Aydın sezilirdi ki, Xurvatov bu çəkişmənin mənim yanımda baş verməsini istəmir. Söhbət əsnasında Smirnov daha da aqressivləşirdi və artıq qeyri-etik ifadələr işlətməyə başlamışdı. Sonda artıq Xurvatov dözməyib Smirnova mənim üçün çox gözlənilməz ifadə işlətdi: **“Borya, Mişa hələ bunun yerlisi Heydər Əliyevlə məşğuldur. Onunla problemi həll etdikdən sonra öz yaxınlarına kömək edəcək. İndi ondan ötrü əsas məsələ Heydər Əliyevdir.”** O vaxtlar bu söhbəti mən ciddi saymadım. İndi görürəm ki, həqiqətən də Qorbaçovun ermənilərə yarınmaqda əsas problemi Heydər Əliyev olub. Sadə xronologiyaya diqqət yetirsəniz, siz də bunu açıq şəkildə görə bilərsiniz:

1982-ci ilə qədər Heydər Əliyev Bakıda olur və Azərbaycana rəhbərlik edir. Erməni xalqının heç bir nümayəndəsi tərəfindən separatçı ruhlu addımlar atılmır. Heydər Əliyev Bakını tərk edib Moskvaya getdikdən 1 il sonra Zori Balayanın “Ocaq” kitabı dərc olunur və təbliğat başlayır. Lakin yenə də bütün bunlar qeyri-rəsmi şəkildə, belə demək mümkünsə, əlaltından görülür. Heydər Əliyevi 1987-ci ilin oktyabrında hakimiyyətdən uzaqlaşdırdıqdan dərhal sonra, 1987-ci ilin noyabrında təbliğat maşını tam gücü ilə işə düşür, Aqanbekyan ilk dəfə Fransada ermənilərə rəsmi şəkildə müraciət edir. Bu gün də ermənilər Heydər Əliyevi Dağlıq Qarabağı Ermənistandan hər vəchlə aralamağa çalışmaqda ittiham edirlər. Mən əminəm ki, Heydər Əliyevin Bakıda qalması Azərbaycandakı siyasi durumu köklü şəkildə dəyişərdi. Lakin bu məsələni siyasi polemika mövzusuna çevirməmək, daha dəqiqi, yanlış anlaşılmaması üçün genişləndirmirəm. Ən əsası isə, hesab edirəm ki, bu məsələnin araşdırılması hakimiyyətə yarınmaq üçün heç nəyə yaramayan qalaq-qalaq kitablar yazan tarixçilərin işidir. H. Əliyev hakimiyyətə gələnə qədər imperiya tərəfindən Azərbaycanın paytaxtı olan Bakı şəhərinin əhalisinin neçə faizinin azərbaycanlı, neçə faizinin qeyri azərbaycanlı olmasını təmin etdiyini, onun hakimiyyəti dövründə bu rəqəmlərin hansı yolla, necə dəyişdiyini müəyyən etsələr pis olmazdı. Əgər onlar bu və digər sahələri araşdırsalar, hamı üçün daha faydalı olar.

Beləliklə, 1988-ci ilin fevral ayı hadisələrin ən kəskin nöqtəsi olur. DQMV Xalq Deputatları Sessiyası tərəfindən rəsmi sənəd qəbul olunur. Bir daha Saveliy Peretsin sənədli povestindən fraqmentləri qeyd edirəm: “SİTA-nın və “Azərinform”un Dağlıq Qarabağ üzrə xüsusi müxbiri Saşa Qriqoryan xəbər verib ki, bu gün, 1988-ci il fevralın 20-də Dağlıq Qarabağ Muxtar Vilayəti İcraiyyə Komitəsinin iclas salonunda DQMV Xalq Deputatları Sovetinin növbədənkənar sessiyası olub. Qriqoryanın verdiyi xəbərdə deyilir: “Sessiya “DQMV-nın Azərbaycan SSR tərkibindən Ermənistan SSR

tərkibinə verilməsi haqqında Azərbaycan SSR Ali Soveti və Ermənistan SSR Ali Soveti qarşısında vəsatət qaldırılması barədə" məsələni müzakirə edib. Müzakirələrdə 30-a yaxın deputatın çıxışı olub. Sessiya müzakirə edilən məsələyə dair aşağıdakı qərarı yekdilliklə qəbul edib:

***DQMV-nin Azərbaycan SSR-in tərkibindən Ermənistan SSR-in tərkibinə verilməsi haqqında Azərbaycan SSR Ali Soveti və Ermənistan SSR Ali Soveti qarşısında vəsatət qaldırılsın.***

***Dağlıq Qarabağ Muxtar Vilayəti Xalq Deputatları Sovetinin növbədənkənar sessiyası vilayət Xalq Deputatları Sovetinin deputatlarının çıxışlarını dinləyib müzakirə edərək qərara aldı: "DQMV zəhmətkeşlərinin arzularını nəzərə alaraq, Azərbaycan SSR Ali Sovetinə və Ermənistan SSR Ali Sovetinə müraciətlə, Dağlıq Qarabağın erməni əhalisinin istəklərinə dərin hörmətlə yanaşdıqlarını nümayiş etdirmələri və DQMV-nın Azərbaycan SSR-in tərkibindən Ermənistan SSR-in tərkibinə verilməsi məsələsini həll etmələri xahiş edilsin, eyni zamanda, SSRİ Ali Soveti qarşısında DQMV-nin Azərbaycan SSR-in tərkibindən Ermənistan SSR-in tərkibinə verilməsi məsələsinin müsbət həll edilməsi haqqında vəsatət qaldırılsın.***

Məlumat üçün: Azərbaycanlı deputatlar sessiyanın işində iştirak etməmişlər"."

Həmin sessiya barədə ilk məlumat isə 21.02.1988-ci ildə "Sovetskiy Karabax", eləcə də bu qəzetin erməni dilində variantı olan "Sovetakan Karabax" qəzetində "XX çağırış DQMV Xalq Deputatları Sovetinin növbədənkənar qurultayı" başlığı ilə dərc edilib. Məlumat üçün qeyd edirəm ki, Azərbaycan ictimaiyyəti bu barədə hələ də xəbərsiz idi, DQMV-də baş verənlərə dair heç bir məlumatları yox idi. Beləliklə, "Sovetskiy Karabax" qəzetində verilən məlumatda deyilir:

"***Dünən, fevralın 20-də vilayət sovetinin icraiyyə komitəsinin iclas salonunda DQMV xalq deputatlarının növbədənkənar sessiyası olmuşdur. Sessiyanı 109 №-li seçki dairəsindən olan deputat S.A.Danielyan açmışdır. O bildirmişdir ki, Dağlıq Qarabağ Muxtar Vilayəti haqqında Azərbaycan SSR Qanununun 39-cu maddəsinə müvafiq olaraq vilayət sovetinin 87 deputatı DQMV Xalq Deputatları Sovetinə müraciətlə növbədənkənar sessiya çağırılmasını xahiş etmişdir. Vilayət sovetinin mandat komissiyası göstərilən sayda deputatların səlahiyyətlərini yoxlamış və onları etibarlı hesab etmişdir.***

***Sessiya "DQMV-nin Azərbaycan SSR tərkibindən Ermənistan SSR tərkibinə verilməsi haqqında Azərbaycan SSR və Ermənistan SSR Ali Sovetləri qarşısında vəsatət qaldırılması haqqında" məsələ müzakirə etmişdir".***

Ardınca da müzakirə edilən məsələ barədə çıxış etmiş 23 deputatın siyahısı verilir. Onlar əhalinin, demək olar ki, bütün kateqoriyalarını – fəhlələri, kolxozçuları, sənaye müəssisələrinin, təsərrüfatların rəhbərlərini, yerli ziyalıları, müharibə və əmək veteranlarını təmsil edir. Sessiya haqqında məlumat bu cür rəsmi xəbərlər üçün ənənəvi olsa da, indiki halda çoxmənalı səslənən bir fraza ilə bitir: "Sessiya müzakirə edilən məsələyə dair müvafiq qərarı yekdilliklə qəbul etmişdir". Məhz belə də yazır - "qərar qəbul etmişdir". Adətən, tətbiq edilən standart qaydada isə "Sessiya qərara almışdır..." yazılır.

Qəzetdə yuxarıda göstərilən məlumatdan sonra "DQMV-nin Azərbaycan SSR tərkibindən Ermənistan SSR tərkibinə verilməsi haqqında Azərbaycan SSR və Ermənistan SSR Ali Sovetləri qarşısında vəsatət qaldırılması haqqında" qərarın mətni səhifələnmişdir ki, onunla da siz daha əvvəl tanış oldunuz.

Göründüyü kimi, ilk rəsmi addım atılır. Azərbaycan SSR rəhbərliyi isə hələ də bundan "xəbərsizdi".

Növbədənkənar sessiya keçirilməsi tələbi ilə, özü də həmin dövrdə deyildiyi kimi, "antipartiya ruhlu gündəliyi olan" bir yığıncaq üçün 87 nəfərin imzasını bir gün, bir həftə, bir ay müddətində toplamaq mümkün deyil. Bunun üçün uzun müddət təbliğat və təşkilati iş aparılmalı, məsələyə dair həmfikirlər qrupu yaradılmalı, həmin həmfikirlər qrupu belə bir aksiyanın işlənib hazırlanması və həyata keçirilməsi taktikasını öz üzərlərinə götürməli idilər və s. Həmçinin, belə bir aksiya o qədər mükəmməl hazırlanmalı idi ki, imzaları toplayacaq, tədbiri təşkil edəcək, bir sözlə, bu aksiyaya cəlb olunacaq şəxslər hazırladıqları tədbirin nəticələrinə tamamilə inanmış olsunlar və aksiyaya qoşulmaqdan çəkinməsinlər.

Bu həmfikirlərin hazırladığı aksiyanın, yəni, sessiya iştirakçılarının hərəkətlərinin uzlaşdırılması, onların həmrəyliyi və nəhayət, sessiyanın qəbul etdiyi sənədlərin hərtərəfli düşünülmüş olması aşkarca nəzərə çarpır. Sessiya erməni əhalisinin, demək olar ki, bütün sosial qruplarını təmsil edən, lazımi sayda natiqlərlə təmin olunub. Hadisələr o qədər dərindən və planlı şəkildə hazırlanıb ki, hətta rus familiyalı bir deputatın –T.V.Sobolyovun çıxışı da nəzərdə tutulub. Axı müzakirələrə obyektivlik, ümumxalq-beynəlmiləl xarakter verən birisi də lazım idi. Bir sözlə, bu aksiya protokol təfərrüatlarına qədər düşünülmüş və o qədər mükəmməl keçirilmişdi ki, onun Dağlıq Qarabağ vilayət rəhbərliyi tərəfindən keçirilməsinə dair heç kimdə şübhə yaratmırdı.

DQMV-nin 20 fevral 1988-ci il tarixli sessiyasının mətnini rəsmi sənədlərdən deyil S.Peretsin povesti vasitəsilə göstərməkdə məqsədim, həm də onun buna şərhini göstərməyimlə bağlıdır.

O zaman, necə olur ki, mətbəxdə belə kimin nəyi müzakirə etməsindən xəbər tutan SSRİ DTK-sı separatçı təbliğatın aparılmasından, 87 imzanın toplanmasından, sessiyanın yığıncağının çağrılmasından, onun keçirilməsindən yalnız mətbuatda rəsmi məlumat getdikdən sonra xəbər tutur? İnandırıcı səslənmir, deyilmi?!

Məhz həmin vaxtlarda - 1988-ci il fevralın 22-də azərbaycanlı və erməni əhali arasında yaranmış münaqişə kütləvi iğtişaşlar formasına keçir və ilk qurbanlar verilir. Erməni-azərbaycanlı münaqişəsində ilk qurbanlar da məhz Azərbaycan tərəfdən olur - iki nəfər öldürülür; onlardan biri tarlada işləyən kəndli – 33 yaşlı Əli Hacıyev, digəri isə 16 yaşlı Bəxtiyar Quliyev olur. Baş vermiş iğtişaşda 19 nəfər yaralanır. Həmin vaxt azərbaycanlı Sosialist Əməyi Qəhrəmanı Xuraman Abbasova bu faciənin daha geniş miqyas almasına mane olmaq üçün öz baş örtüyünü Ağdamdan gələn qəzəblənmiş kütlənin ayaqları altına atır, rəhbərlikdə təmsil olunan vəzifəli şəxs isə onların qarşısında diz çöküb yalvarır. Elə bu yaylıq da qəzəblənmiş kütlənin onu ayaqlayıb Stepanakertə getməsinin və həqiqi mənada faciənin baş verməsinin qarşısını alır. Azərbaycan qadınının bu hərəkəti, bəlkə də bütün dünyada çox böyük təəccübə səbəb ola bilər: necə yəni, bir başörtüyü qırğının qarşısını alsın? Ancaq məhz bu epizod azərbaycanlıların, sözün həqiqi mənasında, milli adət-ənənələrə bağlı, bütün ağrı və acılara baxmayaraq, özünü cilovlayıb böyük qırğınların qarşısını ala bilmək qabiliyyətinə malik bir xalq olmasını sübut edir. Bu gün də həmin addımı lənətləyənlərin sayı az deyil və onları başa düşmək olar. Düşmənin bütün cəbhə boyu top-tüfənglə hücüm etdiyi vaxt Azərbaycan xalqının haqlı etirazını, torpaqlarını qorumaqda qətiyyətini başa düşən DQMV-nin əhalisi artıq Ermənistana köç etməyə hazırlaşır və əgər həmin hərəkət olmasaydı – Azərbaycanda nüfuz sahibi olan bir məmur diz üstə çöküb yalvararaq, Stepanekertə gedən azərbaycanlıların qarşısını almasaydı, bəlkə də bu gün Qarabağ problemi yox idi.

Ancaq yenə inanmıram. Çünki 20 yanvar 1990-cı ildə də eyni ssenari təkrarlandı. Belə ki, yanvarın 13-dən – artıq sonuncu erməninin AXC fəalları və sıravi azərbaycanlılar tərəfindən Bakıdan dinc şəkildə köçürülməsindən bir həftə sonra, qırğın törətməkdə israrlı olan Qorbaçov, guya, erməniləri xilas etmək adı ilə Sovet ordusunun bütün qoşun növlərini Bakıya yeridərək, Azərbaycanı qan içində boğdu.

O günlərdə verilən qurbanlara baxmayaraq, Azərbaycan tərəfinin öndə gedən söz sahibləri ehtirasları yatırmağa, qırğının qarşısını almağa nə qədər çalışırdılarsa, Ermənistan tərəfi aranı bir o qədər qızışdırmaqla məşğul idi. Belə ki, həmin vaxt Yerevanda keçirilən mitinqlərdə Ermənistan EA müxbir üzvü R.Kazaryan bütün dünyaya car çəkərək deyirdi: “Onilliklər

boyu ilk dəfə bizə Ermənistanı təmizləmək imkanı verilib”. Ermənistan EA akademiki Ambartsumyan da onun sözünə qüvvət verərək - “Ermənistanda türklər, yəni azərbaycanlılar qalmamalıdır”- deyə, hayqırırdı.

O dövrlər Sov.İKP MK Siyasi Bürosunun üzvü Aleksandr Yakovlevin köməkçisi, Mikoyanın ailəsində tərbiyə almış Kuznetsov idi. 1988-ci ildə o, erməni yazıçısı Zori Balayan və erməni şairəsi Silva Kaputikyanın Yakovlev tərəfindən qəbul olunmasını təşkil edir. Bu cütlük Yakovlevə bəyan edir ki, Dağlıq Qarabağda erməniləri hər vasitə ilə alçaldırlar, buna görə də həmin regionu Azərbaycandan ayırıb Ermənistana vermək lazımdır. Yakovlev isə fevralın 24-də onları Qorbaçovun yanına aparır...

Bu görüşə toxunan professor Çapay Sultanov yazır: “Antiazərbaycan kampaniyasına startı M.Qorbaçov verdi. Öz memuarlarında görün, o, nə yazır: “Həmin günlər mənim şairə Silva Kaputikyan və jurnalist Zori Balayanla görüşüm baş verdi. Söhbətdə Q. Şahnazarov da iştirak edirdi. Söhbət uzun çəkdi. Mən məsələnin başlanmasını müfəssəl şərh etmələri üçün həmsöhbətlərimə imkan verdim… Hə, bundan sonra söz aldım və mən də müfəssəl surətdə rəhbərliyin mövqeyini şərh etdim. Onun məğzi bundan ibarət idi ki, DQMV ermənilərinin qanuni və ədalətli arzuları təmin olunmalıdır, lakin bu, ölkədə zəncirvari reaksiya yaranmasına, qan tökülməsinin başlanğıcına səbəb ola biləcək milli-ərazi bölgüsünün yenidən biçilməsi olmadan edilməlidir...”

Bu görüşlə bağlı Sov.İKP MK-nın şöbə müdiri olmuş Brutens isə öz xatirələrində bu cür yazır: “24 fevralda A.N.Yakovlevin yanına getmişdim. O danışdı ki, Qorbaçov bir neçə saat bundan qabaq şairə S.Kaputikyanı və yazıçı Z.Balayanı qəbul etdi (mən belə başa düşdüm ki, onun proteksiyası ilə). Onun sözlərinə görə, söhbət Mixail Sergeyeviçdə təəssürat yaratmışdı, o, ilk dəfə olaraq Arsax (Dağlıq Qarabağın qədim adı) problemini dərk etmiş və ona acımışdır. Zənnimcə, Yakovlevin özü də belə münasibəti bölüşürdü. Sonra mənimlə sağollaşdı...”

Bundan daha aydın demək olmazdı! Qorbaçov və Yakovlev hakimiyyətdə olduqları bütün müddətdə məhz bu mövqeni saxlamışdılar. Bu gün həmin görüş barədə yazılan memuarları oxuduqda, aydın görünür ki, həmin görüş sonrakı hadisələri qabaqcadan təyin edir. Güclü erməni təbliğatı praktik olaraq dünyanın hər yerinə çatırdı. Qorbaçovla bu görüşlərdən sonra yubanmadan Stepanakertdəki mitinqlərdə “Lenin-partiya-Qorbaçov. Hitler-Stalin-Liqaçov” şüarı səsləndi, Yerevanda isə çoxminli mitinqdə Sov.İKP MK katibi Yakovlev Stepanakertin separatizmini “xalq azadlıq hərəkatı” adlandırdı.

SSRİ hökuməti hamılıqla, Qarabağ separatçılarını “dilə gətirməyə” başladı: Nazirlər Sovetinin xüsusi məsələlər üzrə bürosunun sədr müavini,

Dövlət plan komitəsi sədrinin birinci müavini V.M.Serov, nazirlər A.Q.Anfimov, A.A.Yejovski, S.F.Voyenuşkin, V.A.Durasov, V.M.Lukyanenko, N.A.Puqin, M.S.Şkabardiya, müavinlər A.F.Kazakov, E.İ.Razumeyev... Dağlıq Qarabağa gələn hər kəs nümayişkaranə şəkildə Yerevandan keçir və eyni sözləri deyirdilər: “Ah, burada vəziyyət necə də pisdir!” və hər biri də, bir növ, kömək edəcəklərinə söz verirdi. Proses artıq başladığından bütün məsələlər, əlbəttə ki, Bakıdan yan ötərək həll olunurdu. Əslində, Qarabağda həyat Azərbaycanın başqa regionlarındakından xeyli dərəcədə yaxşı idi. Lakin erməni əhalisinin narazılığını üzdə göstərmək lazım idi. Narazılığın geniş vüsət alması və qar topası kimi arta-arta getməsi üçün isə bir bəhanə gərəkdi. Bəhanə olaraq da, ermənilərin sosial vəziyyəti göstərilirdi. Əslində, bunun bəhanə olduğunu hamı bilirdi. Lakin ermənilərin bu bəhanəsini elə öz həmyerliləri ifşa edir.

Belə ki, Saveliy Perets sənədli povestində yazır: “Növbəti müsahibənin “qəhrəmanı” “Azərittifaq”ın (Respublika İstehlak Cəmiyyətləri İttifaqının) sədr müavini Nurvart Vladimirovna Qabrielyandır:

- Mən DQMV-dən təzəcə qayıtmışam, dünən. Qətiyyətlə deyə bilərəm ki, orada ciddi iqtisadi çətinliklər yoxdur.

- Sizin sistemdə?

- O cümlədən bizim sistemdə də. Baxın: 1988-ci il üçün əmtəə dövriyyəsi planı 137,4 milyon rubldur. Keçən ilin göstəricisi ilə müqayisədə faktiki artım 113,5 faiz olmuşdur. Hazırda DQMV üzrə pərakəndə ticarət müəssisələri ilə təminat göstəricisi hər 10 min sakin üçün 40, respublika üzrə müvafiq orta göstərici isə cəmi 28-dir. Həmin müəssisələrdə ticarət sahələri DQMV üzrə orta hesabla 1932 kvadratmetr, respublika üzrə müvafiq orta göstərici isə cəmi 1293 kvadratmetrdir. İaşə müəssisələri üzrə müvafiq rəqəmlər 18 və 16 vahid, həmin müəssisələrdə müştəri yerlərinin sayı 805 və 731-dir...

- Gözləyin...

- Mane olmayın, mən hələ qurtarmamışam, - o, gözlərini öz kağızlarından çəkmədən sözünə davam edirdi, – DQMV-də il ərzində göstərilən məişət xidmətlərinin dəyəri adambaşına 41 rubl 37 qəpik, respublika üzrə orta göstərici adambaşına 30 rubl 25 qəpik, o cümlədən rabitə xidmətləri, müvafiq surətdə adambaşına 11 rubl 37 qəpik və 7 rubl 43 qəpik, məktəbəqədər müəssisələrdə uşaqların saxlanması ilə bağlı xidmətlərin orta göstəricisi 1 rubl 93 qəpik və 1 rubl 17 qəpik olmuşdur, nəhayət, DQMV-də adambaşına ət, pendir, konserv, bitki yağı istehlakı respublika üzrə müvafiq orta göstəricilərdən çoxdur...”

Bir az iqtisadiyyatdan xəbərdar olan şəxs üçün bəlli olur ki, həqiqətdə erməni millətçilərinin, SSRİ-nin rəhbər vəzifəli şəxslərinin

dediyinin tam əksinə olaraq, DQMV-də bütün iqtisadi göstəricilər ümümrespublika üzrə göstəricilərdən qat-qat yaxşı olur.

Fikir verirsinizsə, erməni millətçiləri var qüvvələri ilə hamıya necə məzlum, əzabkeş, əzilən millət olduqlarını göstərməyə çalışırlar və bununla da qızışdırıcı mövqelərindən əl çəkmirlər. Lakin diqqətinizə bir daha çatdırıram: hələ ki, döyülən, söyülən, təhqir olunan, şərlənən, təklənən, öldürülən və qovulan yalnız azərbaycanlılardır! Erməni əhaliyə hələ heç kim, heç bir etiraz bildirməyib! Ancaq bu, daha çox davam edə bilməzdi. Bakıya və ölkənin digər regionlarına kütləvi şəkildə Ermənistandan gələn qaçqınların axını başlayır. Evsiz-eşiksiz qalmış insanlar küçələrə tökülüb haqlarını tələb etməyə başlayırdı. Ehtiraslar artıq pik həddə çatmışdı. Mərkəzin istədiyi şərait yetişmişdi. Məhz bu günlərdə kütlə arasındakı mənbəyi bəlli olmayan qızışdırıcılar peyda olmağa başlayır. Ermənistanın azərbaycanlılar yaşayan ərazilərdən gəlmiş insanların başlarına gətirilənləri, baş vermiş talanları danışmaları isə hadisələri kuliminasiyaya yaxınlaşdırırdı. Məhz bu məqamda Qorbaçovla görüşündən sonra dərhal Ermənistana qayıdıb televiziya ilə çıxış edən Silva Kaputikyan növbəti provokasiyaya əl ataraq, kütlənin idarəolunmaz hala gəlməsinə səbəb oldu. Həmin çıxışında Silva Kaputikyan Qorbaçovla görüş haqqında təəssüratlarını bölüşərək, dedi: **“Söhbət dörd saata yaxın davam etdi. Yoldaş Qorbaçov bizim “Dağlıq Qarabağ” sözlərini tez-tez təkrarladığımızı hiss edərək dedi: “Məncə bu, “Arsax” deməkdir...”**

Mərkəzə və erməni millətçilərinə erməni əhalisinin qırğını ilə müşaiyət olunacaq qarşıdurma lazım idi. Bu qarşıdurma Azərbaycanın istənilən regionunda baş verə bilərdi. Növbəti bölümlərdə mən bu cəhdlərin olduğunu da təfərrüatı ilə diqqətinizə çatdıracam. Bu qarşıdurmanın məhz Sumqayıtda baş verməsinin səbəbi isə bu şəhərin statusu ilə bağlı idi. Belə ki, Sumqayıtda çoxlu sayda peşə məktəbləri vardı və respublikanın müxtəlif regionlarından gəlmiş on min gənc həmin texniki peşə məktəblərində təhsil alırdı. Təbii olaraq, onlar valideyn nəzarətindən də kənarda qalmışdılar. Bundan əlavə, Sumqayıt həm də sənaye şəhəri idi, ora hamı iş tapmaq üçün gəlirdi. Lakin şəhərin ora iş üçün gəlib yerləşmiş insanları yaşayış sahəsi ilə təmin etmək problemi vardı. Belə ki, on yeddi min ailə mənzil növbəsi gözləyirdi. İyirmi min adam isə, sözün həqiqi mənasında, gecəqondu statusunda olan evlərdə yaşayırdılar. Şəhərin kriminogen durumu da ürəkaçan deyildi. Sumqayıt əhalisinin bir hissəsi “xüsusi kontingent”, yəni, cəzasını çəkib qurtarmış insanlar idi. Bundan əlavə, Sumqayıt mühitində şərti olaraq cəzadan vaxtından əvvəl azad edilmiş və kimya sənayesi müəssisələrində işləməyə göndərilmiş şəxslər də nisbətdə daha çox idi, çünki Sumqayıtda əsas sənaye potensialını məhz kimya zavodları təşkil

edirdi. Daha da artıq, on minə yaxın islah işlərinə məhkum edilmiş şəxs də həmin şəhərdə yaşayırdı. Bir sözlə, Sumqayıtın demoqrafik tərkibi bu təxribatlara dərhal reaksiya verəcəkdi.

Bu gün tam məsuliyyəti ilə demək olar ki, Sumqayıtda kütlənin özünü necə aparacağı riyazi dəqiqliklə hesablanıb proqnozlaşdırılmışdı. Çünki SSRİ DTK-sı bu problemlə həmişə xüsusi maraqlanırdı.

Bu hadisələrin modelləşdirilməsində isə başqa spesifik hallar da nəzərə alınmışdı. Belə ki, “ Kütlənin psixologiyası” kitabında psixoloq-alim Tard yazır: “Kütlə bir-biri ilə tanış olmayan müxtəlif elementlərin toplusudur. Ehtirasları coşdurmaq üçün bircə qığılcım kifayətdir: həmin qığılcım bu yöndəmsiz kütlənin bir elementindən digərinə keçərək, onu elektrikləşdirir və sonuncu qəflətən, öz-özünə təşkilatlanır. Pərakəndəlik rabitəyə, hay-küylü kütlə isə öz məqsədinə nail olmaq üçün qarşısıalınmaz israrla irəliyə can atan yırtıcıya çevrilir. Adamların çoxu buraya sadəcə maraq xatirinə gəlmişdir, lakin bir neçə nəfəri əhatə edən həyəcanlı ehtiras qəflətən hamının qəlbinə hakim kəsilir və hamı qarşısına nə çıxsa, vurub dağıtmağa çalışır. Günahsız bir insanın ölümünə mane olmaq niyyəti ilə qaçıb özünü çatdırmış insan az sonra birincilər sırasında adamları öldürmək istəyinə yoluxur və ən təəccüblüsü odur ki, bu hərəkətlər həmin insanı əsla təəccübləndirmir”. Buraya onu da əlavə edək ki, həmin kütlə arasında Ermənistanda cəhənnəm əzabından keçmiş insanlar da vardır! Və bu kütlə üçün qığılcım rolunu həm də Silva Kaputikyanın Ermənistan televiziyası ilə məlum çıxışı oynadı.

Bəli, deyə bilərsiniz ki, bəlkə S.Kaputikyan blef edirdi? O zaman elədirsə, M.Qorbaçovun 1988-ci il fevralın 29-da Sov.İKP MK Siyasi Bürosunun iclasında dediyi bu sözləri necə başa düşək: “Qarabağda ermənilərlə azərbaycanlılar arasında münaqişə baş vermiş, iki nəfər azərbaycanlı həlak olmuşdur. Yerevanda bu məzmunda vərəqələr yayılmışdır: “Ermənilər, mitinqlərə son qoyun, əlinizə silah götürüb, türkləri qırın”. Sovet ordusunun qərargahına uzaq məsafədən atəş açılmışdır. Lakin deməliyəm ki, hətta Yerevan küçələrində yarım milyon insan olduğu vaxtda da ermənilərin intizamı yüksək səviyyədə olmuşdur. Sən demə, Stepanakert şəhər partiya komitəsinin katibi 14 ildə bir dəfə də Ermənistanda olmamışdır, hərçənd, axı Dağlıq Qarabağ erməni muxtariyyətidir. Hətta Ermənistana gedən yollar da baxımsız qalmışdır. Bu, bilərəkdən belə edilmişdir. Dağlıq Qarabağda Türkiyə televiziyasının verilişləri qəbul edilir, amma Ermənistan televiziyasının verilişləri qəbul edilmir. Axı bunlar insanların heysiyyatına toxunur. Dünən Vazgenlə söhbət etmişəm (söhbət bütün ermənilərə müraciəti ilə “məşhurlaşmış” katolikosdan gedir –A.İ.). O dedi ki, real problemlər var, hadisələr boş yerdə yaranmamışdır. Bu zaman o, öz təcrübəsindən bir

nümunəyə istinad etdi. Deyir, mən Bakıda H.Əliyevin qəbulunda olmuşam. Bakıda erməni kilsəsi var. Bu şəhərdə 200 minə yaxın erməni yaşayır. Vazgen həmin kilsədə ibadət etmək istəmişdir, artıq 12 ildir ki, dəvət gözləyir, lakin hələ də dəvət almamışdır. Görünür, o, arzuedilməz şəxsdir, onun orada görünməsini istəmirlər. Bütün bunlar isə insanın hissiyyatına təsir edir, onu qızışdırır. Vilayətdə onilliklər boyu xeyli çətinliklər və problemlər yığılıb qalmışdır. Azərbaycan rəhbərliyinin Qarabağ əhalisinə münasibəti Leninizmdən, bəzən isə ümumiyyətlə insaniyyətdən uzaq ruhda yanaşma olmuşdur”.

Göründüyü kimi Lenin babasından sonralar imtina etmiş Baş katib Qorbaçov bütün erməniləri azərbaycanlıları qırmaq üçün silahlanmağa çağıranları, ordu qərargahına atəş açanları cəzalandırmaq, sərt tədbirlər görmək əvəzinə, üstüörtülü şəkildə erməniləri təbliğ etməklə məşğul olur. Onların necə də intizamlı olduğunu utanmadan dilə gətirir, H. Əliyevin Vazgeni Bakıya dəvət etməməsini qınayır.

Qorbaçovun bu çıxışını təhlil etdikdə H.Əliyevin baş keşişi Bakıya niyə dəvət etməməsinin səbəbi aydın olur: H. Əliyev Vazgenin araqızışdıran olduğunu dəqiq bilirdi. Və əgər Baş katib ermənilərin necə də məzlum xalq olduğunu bu cür canıyananlıqla ifadə edirdisə, həmin araqızışdıran Vazgenin Bakıya gələcəyi təqdirdə, “erməni etnosunun müstəsnalığı haqqında fəlsəfəsi”ni Azərbaycan erməniləri arasında təbliğ edərək, onları millətlərarası ayrıseçkiliyə necə təhrik edəcəyini də gözəl anlayırdı.

Bəs yaxşı, əgər Qorbaçov taleyin erməniləri bu qədər incitdiyini ürək yanğısı ilə danışırsa, o zaman niyə Sumqayıt qırğınının qarşısını almırdı?! Təkzibolunmaz faktdır ki, fevralın 28-i və 29-u Sumqayıtda baş verənlərə nə ordu, nə milis (o dövr polis “milis” adlanırdı-A.İ.) tərəfindən heç bir müdaxilə olunmayıb. İctimai asayişi qorumaqla mükəlləfiyyətli strukturlar kənarda tamaşaçı kimi baş verənləri seyr ediblər. Axı həmin 32 nəfər yarım saatın içində öldürülmədi. Bu, hardasa 2 gün davam etdi. Qanunla danışsaq, biz bu hərəkətsizlikdə yerli güc strukturlarını günahlandıra bilmərik. Çünki xatırladıram ki, bu hadisələr 1988-ci ilin fevral ayında baş verirdi və onda hələ müstəqil Azərbaycan dövləti yox idi, Kreml isə hələ çox güclüydü. Sovet Azərbaycanının hakim dairələrinin sərəncamında ordu yox idi, Azərbaycan milisi isə bütünlüklə Moskvaya tabe idi.

Bu məsələylə əlaqədar ABŞ-dakı Con Hopkins Universitetinin Mərkəzi Asiya və Qafqaz Tədqiqatları İnstitutunun baş direktoru Svante Kornell yazır: “Sumqayıtda sovet ordusu hissələrinin və daxili qoşunların olması heç nəyi dəyişmirdi; adama elə gəlirdi ki, ordu kənarda dayanıb talanları sakitcə müşahidə edirmiş, Sovet hakim dairələri nəinki qan tökülməsinin qarşısını almaq niyyətində deyildi, hətta iki etnik icma

arasında münaqişə yaratmağa çalışırdı”.

Sonralar güc strukturlarının rəhbərləri hərəkətsizliklərinin səbəbi kimi ali rəislər tərəfindən əmrin verilməməsini göstərirdilər. Qorbaçovun isə bir neçə ay sonra gətirdiyi “əgər qoşunlar üç saat gecikməsəydi, faciənin qarşısını almaq olardı” bəhanəsinin ikiüzlülüyün son həddi olmasını nəzərinizə çatdırmaq üçün Sov.İKP MK Siyasi Bürosunun 29 fevral 1988-ci il tarixli iclasının stenoqramına diqqət yetirməyinizi xahiş edirəm:

SSRİ müdafiə naziri Dmitri Yazov: “Sumqayıtda istəsəniz, bəlkə də adını düz demirəm, hərbi vəziyyət tətbiq etmək lazımdır... Mixail Sergeyeviç, vəziyyətin daha da mürəkkəbləşməməsi üçün bu xətti qətiyyətlə həyata keçirmək lazımdır. Oraya qoşun yeritmək və qayda yaratmaq lazımdır”...

M.Qorbaçov: “Əsas məsələ budur ki, indi dərhal fəhlə sinfini, adi insanları, drujinaçıları ictimai asayişi pozanlara qarşı mübarizəyə cəlb etmək lazımdır. Deyə bilərəm ki, bu yolla hər cür xuliqanların və ekstremistlərin qarşısını almaq olar... Hərbçilər insanları qəzəbləndirir”.

Beləliklə, Müdafiə naziri dövlət başçısını “qayda yaratmağa” çağırır. İnsan haqlarından bolluca boşboğazlıq edən,“yeni təfəkkür” təşəbbüsünün müəllifi isə Sumqayıtın ikinci gün iğtişaşlara bürünməsinə baxmayaraq, “xuliqanların və ekstremistlərin qarşısını ala biləcək drujinaçılar”dan danışır. Bu, bir daha Qorbaçovun ikiüzlülüyünü və özünü axmaq yerinə qoymasını sübut edir. Yalnız fevralın 29-da, günün sonunda qoşunlara əmr verilir ki, iğtişaşlara son qoyulsun. Bir neçə saat ərzində iğtişaşlara son qoyulur.

Sumqayıt hadisələrindən sonra SSRİ Ali Sovetində keçirilən məlum müşavirədə azərbaycanlı deputatın “Sumqayıt hadisələri məlum qüvvələr tərəfindən təşkil edilməmişdimi?” – sualına isə Qorbaçov əsəbi tərzdə belə cavab vermişdi: “Heç kəs heç nə təşkil etməmişdi, sadəcə olaraq qoşunlar bir neçə saat gecikmişdir, vəssalam!”. Bu da özünü axmaq yerinə qoymağın bariz nümunəsidi. Qorbaçova heç kəs xatırlatmadı ki, axı xeyli miqdarda rusiyalı hərbi qulluqçuların yerləşdirilmiş olduğu Bakıdan Sumqayıta maşınla iyirmi dəqiqəlik, Nasosnı məntəqəsindəki ən yaxın hərbi bazadan Sumqayıta isə 5-7 dəqiqəlik yoldur. Buna görə də “bir neçə saat gecikmək” barədə bəhanə gətirməyin mənası aydın deyil və yaxud, həddindən artıq aydındır, çünki qoşunun dərhal müdaxiləsi qan tökülməsinin qarşısını alardı. Mərkəzə isə Qarabağ problemini yaratmaq üçün məhz qan tökmək lazım idi.

Qorbaçov, erməni millətçiləri və onların tərəfdarları bu qanlı siyasi kombinasiyanı əvvəlcədən işləyib hazırlamış və bütün rolları qabaqcadan bölüşdürmüşdülər. Artıq qeyd etdiyim kimi, ilk qaçqınlar Qafandan olan azərbaycanlılar idi. Ermənistanda törədilən qanunsuzluqlar barədə informasiyanın yayılmasına imkan verilmirdi, Moskva bunu qadağan

etdiyinə görə isə qaçqınları DQMV-də və Bakıda yerləşdirməyə cürət etmirdilər və onlar əsasən, Sumqayıt və başqa rayonlarda yerləşdirilmişdilər. Evsiz-eşiksiz, işsiz qalmış bu insanlar hakim dairələrin məsuliyyətsiz hərəkətləri nəticəsində, sözün həqiqi mənasında, dəhşətli vəziyyətə düşmüşdülər. Beləliklə, Ermənistandan olan qaçqınlar Sumqayıtda çətinliklə idarə edilə bilən, partlayış təhlükəli kütləyə çevrilmişdi. Üstəlik, Sumqayıtın özünün o qədər də ürəkaçan olmayan demoqrafik vəziyyəti, həqiqətən, şəhərdə bomba effekti yaratmışdı. M.Qorbaçov və erməni millətçiləri məhz buna ümid bəsləyirdilər.

Nəzərinizə başqa bir maraqlı faktı da çatdırım ki, bu hadisələr baş verən ərəfədə Sumqayıt, demək olar ki, başsız qalmışdı. Belə ki, fevralın sonuna yaxın şəhərin milis rəisi tutduğu vəzifədən azad edilir, şəhər DTK-sının sədri başqa yerə köçürülür. Bundan əlavə, fevralın sonunda şəhər rəhbərliyi Moskvaya ezamiyyətə göndərilir. O cümlədən Sumqayıt şəhər KP-nin birinci katibi Cahangir Müslümzadə də Moskvaya çağrılır. Nəzərinizə çatdırım ki, bu mövzunun ətrafında irəlidəki bölümlərdə təfərrüatı ilə bəhs edəcəm. Lakin qısaca olaraq bildirmək istəyirəm ki, Cahangir Müslümzadəyə Moskvada Azərbaycanın Mərkəzi Komitəsinin birinci katibi postu vəd edilir və “İzvestiya” qəzetinin baş redaktoru Laptevin otağından gələcək birinci katib imici və etibarı qazanmaq üçün Cahangir Müslümzadə tərəfindən elə həmin qəzetə müsahibə verilir. Onu da qeyd edim ki, həmin dövr Moskvadakı rəhbər dairələr tərəfindən Azərbaycan rəhbərliyində təmsil olunan, ən azı, dörd nəfərə birinci katib postu vəd edilmişdi. Və bu vədə inanan hər bir vəzifəli şəxs həmin post uğrunda ciddi “mübarizəyə” qoşulmuşdu. Bunun özü də bütövlükdə Azərbaycanı başsız qoymaq məqsədilə düşünülərək atılmış addım idi. Sumqayıt hadisələri azərbaycanlıları “vandalizmdə” günahlandırmaq və haradan ələ keçirilməsi məlum olmayan silahların köməyi ilə azərbaycanlıları Ermənistandan və Qarabağdan misli görünməmiş miqyasda qovmaq əməliyyatını daha da tezləşdirməli idi.

Hadisələrin hansı peşəkarlıqla təşkil edildiyini və təyinatının da nə olduğunu bildiyim üçün kütləvi informasiya vasitələrinin bu fakta bu dərəcədə operativ münasibət bildirməsi məndə o qədər də təəccüb hissi doğurmur. Belə ki, Sovet hakimiyyəti dövründə SSRİ-də akkreditə edilmiş xarici jurnalistlərin hamısı Moskvada olurdu, Sumqayıt hadisələri zamanı isə onlar, sanki, sehirli çubuğun işarəsi ilə Sumqayıtda toplaşmışdı və artıq ertəsi gün bütün xarici televiziya şirkətləri qondarma “vəhşiliklər” haqqında verilişlər yaymağa başlamışdılar.

Daha bir maraqlı faktı qeyd etmək istəyirəm. Bütün bu dəhşətli hadisələr zamanı Artaşes Qabrielyan adlı bir erməni öz videokamerası ilə bərabər, Sumqayıtda sərbəst gəzişir, şəhərdə baş verənləri sakitcə kameraya

çəkirdi. Çəkdiyi filmə isə "Bizi xilas edin" adı verir. Bu film xarici ölkələrdə fəaliyyət göstərən ermənilər üçün nəzərdə tutulmuşdu. Həmin filmə baxan hər kəs görür ki, erməni xalqının "vəhşi" azərbaycanlılarla yaşaması qeyri-mümkündür və bu bəladan qurtulmağın yeganə yolu Dağlıq Qarabağın Azərbaycandan ayrılıb Ermənistana verilməsidi. Bundan sonra qısa müddət ərzində Stepanakertdə Sumqayıt hadisələrinin qurbanlarına abidə ucaldıldı, Yerevanda isə təcili şəkildə "Sumqayıt – soyqırım – aşkarlıq " adlı kitab dərc olundu və bütün Rusiyada yayıldı. Bununla da genişmiqyaslı təbliğat kampaniyası başlandı.

Sumqayıt hadisələrinin provokasiya xarakteri daşımasına şübhə edənlərə SSRİ Baş Prokurorluğunun bu hadisələri araşdırmış istintaq qrupunun müstəntiqi Q.Kotenkonun aşağıdakı sözlərini xatırlatmaq yerinə düşərdi:

"Sumqayıt hadisələrindən əvvəl idarə və təşkilatlarda yerli əhalinin Qarabağ probleminə münasibəti barədə məlumatlar günaşırı Qarabağa, oradan isə Yerevana daxil olurdu. Bu informasiyanı kim çatdırırdı? Əlbəttə, ermənilər, daha dəqiq desək, erməni qızları. Onlara Stella adlı bir qadın başçılıq edirdi. Bütün informasiya ona çatdırılır, o da öz növbəsində rabitə şöbələrində işləyən ermənilər vasitəsilə bu informasiyanı Stepanakertə və Yerevana ötürürdü".

Erməni millətçiləri, ilk növbədə diasporun informasiya imkanları hesabına, Sumqayıt provokasiyasını əməlli-başlı işləyib hazırlamışdılar. Yerevanda dərc olunan "Kommunist" qəzetində dərhal "Suayırıcı" sərlövhəli məqalə dərc edilmişdi. Burada göstərilirdi ki, qonşu "türklər" zərrə qədər də dəyişməmişdir, Sumqayıt hadisələri "1915-ci il soyqırımı"nın davamıdır və indi ermənilərin azərbaycanlıların hakimiyyəti altında yaşaya biləcəyini fikirləşən hər kəs satqındır." Azərbaycanlıların Ermənistandan qovulması yeni qüvvə ilə başlanmışdı. İndi onlardan, yetmiş il əvvəl törədilmiş "soyqırıma" deyil, lap təzə hadisələrə - Sumqayıtda törədilənlərə görə qisas alırdılar, bu talanları əslində kimin təşkil etmiş olması barədə isə danışmamağı üstün tuturdular. Qəzetlər xüsusi cidd-cəhdlə "icad edilmiş" dəhşətli xəbərlər yayırdı. Hadisələrin qurbanlarının sayı həndəsi silsilə üzrə artmaqda idi və heç kəs bircə kəlmə də demirdi ki, Sumqayıt ermənilərinin əksəriyyəti öz azərbaycanlı dostlarının və qonşularının mənzillərində sığınacaq tapmışdı və əgər bu cür kollektiv həmrəylik olmasaydı, qurbanların sayı qat-qat çox ola bilərdi. Bunu izah etmək, sadəcə olaraq, qadağan idi. Çünki tələb belə idi ki, azərbaycanlılar "ikiayaqlı vəhşilər", "barbarlar" kimi təqdim olunmalıdırlar, onları məhv etməkdən başqa çarə yoxdur.

Dünya kütləvi informasiya vasitələrində bir söz səslənirdi: Sumqayıt, Sumqayıt, Sumqayıt! Dahi fizik Albert Eynşteynin vaxtilə söylədiyi məşhur

fikirdə deyilir: "Atomu parçalamaq qərarlaşmış stereotipi dəyişməkdən asandır". Bəli, Bakı artıq neçə illərdir ki, Sumqayıt hadisələri barədə qərarlaşmış bu stereotipi dəyişə bilmir. Hərçənd, etiraf etmək lazımdır ki, Bakı bu istiqamətdə xüsusi səy də göstərmir. Lakin ən acınacaqlısı odur ki, bu faktlar hələ o vaxt məlum idi və o vaxt informasiya blokadasını aradan qaldırmağa imkan da vardı: xarici kütləvi informasiya vasitələrinin Moskvadakı müxbirləri Bakıda çıxan qəzetlərin (əsasən rusdilli qəzetlərin) redaksiyalarına fasiləsiz zəng vururdular. Bakıda bəziləri bu müxbirləri "başdan etməyə" çalışır, digərləri isə Moskvanın icazəsi olmadan danışmağa cəsarət etmirdi. S.Peretsin sənədli povesti və digər materiallarla tanış olduqda, Azərbaycana rəhbərlik edənlərin hərəkəti ikrah hissi doğurur. Erməni diasporu isə kütləvi informasiya vasitələrinin bütün növlərindən və imkanlarından məharətlə istifadə edirdilər.

Bütün bunların ardınca, sonradan əks-kəşfiyyat generalı olmuş Vladimir Semyonoviç Qalkinin SSRİ Prokurorluğunun Sumqayıt hadisələri üzrə istintaq qrupuna başçılıq etməsi də insanda təəccüb hissi doğurmur. İstintaqa kim tərəfindən rəhbərlik edildiyini daha da aydınlaşdırmaq üçün Qalkin haqqında Çapay Sultanovun "İmperiyanın son zərbəsi" kitabında yazdıqlarını nəzərinizə çatdırıram: "Vladimir Qalkinin iştirakı ilə baş vermiş bir hadisə barədə "Agentira.ru" saytında aşağıdakı məlumat verilmişdi:

**"Sabiq xarici kəşfiyyat əməkdaşı Qalkin ABŞ-da həbs edilmişdir".**

"SSRİ xarici kəşfiyyatının (DTK PQU) sabiq əməkdaşı Vladimir Qalkin oktyabrın 29-da Nyu-Yorkda FTB əməkdaşları tərəfindən həbs edilmişdir. O, PQU-nun "T" (elmi-texniki kəşfiyyat) idarəsində işləyirdi. Xatırladaq ki, Vladimir Qalkin ABŞ-a Rusiya milisinin nümayəndə heyətinin tərkibində polis üçün texniki-avadanlıq almağa gəlmişdir. Bu hadisədən beş il əvvəl istefaya çıxmış və həmin vaxt "Noulic Ekspress" firmasının baş direktoru olan cənab Qalkin viza almaq üçün sənədlərini təqdim edərkən, 1992-ci ilə qədər xarici kəşfiyyat xidmətinə mənsub olmasını gizlətməmişdir. O, əvvəllər Amerikada olmamışdı. Onu 1991-ci ildə Kiprdə keçirilmiş elmi simpoziumda Amerikanın strateji müdafiə təşəbbüsü haqqında informasiya əldə etməyə cəhd göstərməkdə təqsirləndirirdilər. Məhkəmə sənədlərinə görə, cənab Qalkin ulduz müharibələri haqqında üç məruzənin mətni müqabilində "Deyta ceneral korporeyşn" şirkətinin əməkdaşına 30 min dollar təklif etmişdir.

İttihamın məhkəməyə təqdim etdiyi sənədlərdə Qalkin ABŞ-ın strateji müdafiə təşəbbüsü haqqında informasiya toplamaqda təqsirləndirilir. Guya, bu məqsədlə o, üçüncü ölkənin ərazisində keçirilən elmi konfrans zamanı özü də ulduz müharibələri proqramına maraq göstərən Aluru Prasad

adlı bir Hindistan vətəndaşı ilə sövdələşməyə çalışmışdır. Prasad artıq həbs edilmiş və mühakimə olunmuşdur. Lakin 1995-ci ilin yayında, prosessual mürəkkəbləşmələr yaranması üzündən, məhkəmə prosesi yarımçıq qalmışdır.

Dekabrın 15-də Vladimir Qalkin həbsdən azad edilmişdir. Moskvada iddia edirdilər ki, FTB Klinton administrasiyasını kobud şəkildə təhrikçiliyə sövq etmişdir, yalnız Çernomırdin və Qorun bu məsələyə müdaxilə etməsi amerikalıların "abrını saxlamasına" imkan vermişdi. Lakin ABŞ Ədliyyə Nazirliyi bəyan etmişdir ki, hökumət Qalkinə qarşı ittihamların məhkəmədən geri çağırılması haqqında qərar qəbul edərkən ölkənin milli mənafelərini əsas tutmuşdur.

Bununla bərabər, Qalkin həbs edilən andan Xarici Kəşfiyyat Xidməti onlara qarşı cavab tədbirləri görüləcəyi ilə hədələyirdi, Federal Təhlükəsizlik Xidmətinin direktoru Nikolay Kovalyov özü isə dünən söyləmişdir ki, o, gələcəkdə həbs ediləcək şəxslərin siyahısını hazırlamaq barədə sərəncam vermiş və həmin sərəncamı FTB-nin və MKİ-nin Moskvadakı rəsmi nümayəndələrinə nümayiş etdirmişdir. Bundan əlavə, Xarici Kəşfiyyat Xidməti Amerikanın xüsusi xidmətlərini centlmenlərə yaraşmayan hərəkət etməkdə günahlandırmışdır. Belə çıxır ki, Qalkinə tələ qurulması casusların peşə etikasına ziddir, Xarici İşlər Nazirliyi isə həbs edilmiş şəxsin dərhal və qeyd-şərtsiz azad olunmasını tələb etmişdir. Nəhayət, Moskva bəyan etmişdir ki, əgər məhkəmə Qalkinə bəraət verməsə, onun işi ikitərəfli münasibətlərə zərər vuracaqdır. Vladimir Qalkin özü azad ediləndən dərhal sonra jurnalistlərə söyləmişdir ki, FTB əməkdaşları onu satqınlığa meyl etdirməyə çalışmış, lakin qəti rədd cavabı almışlar."

Bəli, bu, həmin Qalkindir ki, əvvəlcə artıq unudulmuş XIX Partiya Konfransında, sonra isə xalq deputatları qurultayında başlanmış qalmaqallardan sonra "idarə edilə bilməyən" Qdlyanın əvəzinə, Orta Asiyada pambıqla bağlı korrupsiya fırıldaqlarında "Kreml izi" barədə istintaqa rəhbər təyin edilmişdi. Çünki Özbəkistanda kənd təsərrüfatında baş vermiş məşhur oğurluqlar zamanı Qorbaçov SSRİ KP MK-nin kənd təsərrüfatı üzrə katibi və məhz o sahəyə rəhbərlik edən şəxs idi. Baş vermiş oğurluqların obyektiv istintaqı birbaşa Qorbaçovun həbsinə aparan yol idi. Moskva Sumqayıt hadisələri üzrə istintaq qrupuna rəhbərliyi heç də təsadüfən V.Qalkinə tapşırmamışdı. Çünki Qalkin nəyi axtarmaq və xüsusən tapmaq lazım olmadığını lap yaxşı bilirdi.

Nəzərinizə çatdırım ki, iş təkcə kitabın birinci hissəsində qeyd etdiyim, "Qriqoryan işi"ndə adı keçən qara plaşlılarla bitmirdi. Onlarla bahəm, talanların fəal iştirakçıları olan Aleksandr Draçev, Vadim Muravyov, İqor Ağayev, Aleksandr Vorobyov və başqaları sadəcə olaraq

cinayət məsuliyyətindən yaxa qurtarmışdı. ***İstintaq yalnız azərbaycanlıları axtarırdı***.

Əslində isə nələrin baş verdiyi hamıya bəllidir. İstintaqa rəhbər təyin olunmuş şəxsin Prokurorluq adı altında kimin maraqlarını güdməsi də artıq aydındır. Burada istintaq materiallarının saxtalaşdırılacağına, təmizlənəcəyinə və azərbaycanlıların "vəhşi" kimi təqdim olunacağına heç kimin şübhəsi olmasın. Digər tərəfdən, Azərbaycana müdhiş informasiya zərbəsi vurulmuşdu. Sumqayıt hadisələri haqqında dəhşətli film ermənilərin Sumqayıt hadisələri haqqında təbliğatının özəyi kimi, Avropa və Amerikanın bütün ölkələrində göstərilmişdi. Bakıya vurulan bu informasiya zərbəsinin gücünü təsəvvür etmək çətin deyil. Həmin filmdə insan təxəyyülünü vahiməyə salan təsvirlər onu dəhşətə gətirən səslərlə tamamlanır. Məsələn, filmin qəhrəmanlarından biri – hadisələrin şahidi Qabrielyan öz dostu Mişanın və onun arvadının qətlə yetirilməsi səhnəsini İsveç televiziyasının ekranından isveçlilərə bu hadisənin şahidi kimi təsvir edərək, demişdir: "30 nəfər azərbaycanlı Mişanın və arvadının başını kəsəndən sonra onların gənc qızının üstünə atılmışlar. Onlar qızı növbə ilə zorladıqdan sonra tikə-tikə doğramış, sonra manqalda od qalamış, insan ətindən kabab bişirmiş və onu ləzzətlə yemişlər. Orada bizim bu vəhşilərin əlindən necə zülm çəkdiyimizi təsəvvür edə bilməzsiniz!"

Çox dəhşətli səslənir deyilmi?! Ancaq bu dəhşət həqiqətimi əks etdirir?!...

Əlimə 28 yanvar 2005-ci il tarixli "Vışka" qəzetində "Exo Sumqayıta" sənədli filmin müəlliflərindən biri olan Eyruz Məmmədovun müsahibəsi keçir. O müsahibə mənim fikirlərimin aydınlaşmağına bir daha yardımçı oldu. Belə ki, jurnalistə həmin filmin çəkilişindən, onları bu filmi çəkməyə vadar edən səbəblərdən danışarkən E. Məmmədov qeyd edir: "...Sumqayıt hadisələrindən dərhal sonra azərbaycanlıların "vəhşilikləri" haqqında film Fransada nümayiş etdirildi. Sonralar Fransa televiziyasının arxivlərində saxlanılan lenti bizə verməkdən imtina etdilər və bunun səbəbini açıq dedilər: istənilən mütəxəssis həmin filmin montaj olmasını asanlıqla müəyyən edə bilər. Demək olar ki, eyni vaxtda Yerevanda "Sumqayıt, soyqırım, aşkarlıq" adlı kitab çapdan çıxmış və şanlı SSRİ komsomolunun növbəti qurultayında rəhbərliyin, Qorbaçov uşaqlarının xeyir-duası ilə minlərlə gəncə təqdim etmişdilər. 1989-cu ildə isə Latviyada çıxan "Yurmala" qəzetinin on altı səhifəlik xüsusi nömrəsi bütünlüklə Ermənistana və Sumqayıt hadisələrinə həsr edilmişdi. Tarixçi Xanzadyan və şairə Silva Kaputikyan həmin xüsusi nömrənin başdan-ayağa qədər yalan və Azərbaycan xalqının nifrət zəhəri ilə dolu səhifələrində çıxış etmişdi. Həmin xüsusi nömrədə şərh edilən faktların həqiqətə uyğun olub-olmaması barədə

mühakimə yürütmək üçün Sumqayıt hadisələrinin qurbanlarının sayı barədə rəqəmlərə diqqət yetirmək kifayətdir. Bu qurbanların sayı məqalə müəllifinin istəyindən asılı olaraq, 300 nəfərdən 1000 nəfərə qədər dəyişir... Bir qədər irəli gedərək deyim ki, İngiltərədə çıxan "Sandi tayms" qəzeti hətta 2001-ci ildə Qarabağ probleminə toxunaraq yazmışdır ki, azərbaycanlılar ermənilərdən heç də zəif deyil, lakin informasiya müharibəsində onlar ermənilərdən zəif və köməksizdir..."

Daha sonra Eyruz Məmmədov "Exo Sumqayıta – 2" filmindən danışır: "...1994-cü ilin iyulunda həmin film AzTV-1 kanalında nümayiş etdirildi. Bu lentə Sov.İKP MK Siyasi Bürosunun üzvləri, SSRİ müdafiə naziri D.Yazov, SSRİ Ali Sovetinin sədri A.Lukyanov, Sov.İKP MK katibləri A.Yakovlev və Y.Liqaçov, SSRİ DTK-nın sədri V.Kryuçkov, RLDP-nin lideri V.Jirinovski və başqaları ilə müsahibələr daxil edilmişdir. Təəccüblü deyil ki, DTK-nın kəşfiyyat orqanları həmin filmlə maraqlanmış, çəkilmiş materialı müsadirə etməyə cəhd göstərmişdilər..." Həmin filmin çəkilişləri zamanı indi dünyasını dəyişmiş Davud İmanov, operator Elçin Quliyev və Eyruz Məmmədov həqiqətən çox böyük çətinliklərlə əldə etdikləri materialları Moskvadan Bakıya gətirə bilirlər. Qarabağ müharibəsinin 1983-cü ildən bugünkü günümüzə qədər necə dəqiqliyi ilə planlaşdırıldığını həmin film bir daha dönə-dönə sübut edir. Filmin materiallarına əsaslanan və müsahibədə yer alan bu hissəni diqqətlə oxumağınızı xahiş edirəm:

"V.Kryuçkov hələ 1993-cü ilin əvvəlində Dağlıq Qarabağ vilayəti haqqında belə bir fikir söyləmişdi: "Sizin Qarabağ faciəniz hələ qabaqdadır. Azərbaycan torpaqlarının müəyyən faizi işğal ediləcək, sonra isə siyasi spekulyasiya başlanacaqdır".

Boris Yeltsinin komandasının üzvü, Rusiyanın keçmiş dövlət katibi Q.Burbulis də 1993-cü ilin aprelində bizə verdiyi müsahibədən sonra qeyri-rəsmi söhbət zamanı birmənalı olaraq eyni fikri söyləmişdi. O, həmin vaxt ermənilər tərəfindən işğal edilmiş Kəlbəcərin ümumiyyətlə Qarabağa aid olmaması barədə suala belə cavab vermişdi: "Siz həddən artıq sadəlövhsünüz. Tezliklə bütün Qarabağ və Ağdam rayonu işğal ediləcəkdir. İri dövlətlər arasında Qafqazda nüfuz dairəsi bölgüsü gedir və mənbəyi neft olan münaqişəyə yalnız həmin dövlətlər razılığa gəldikdən sonra son qoyulacaqdır. O vaxta qədər isə müharibə davam edəcəkdir".

Bizim söhbət etdiyimiz adamların bu və digər fikirlərinə əsasən, Qarabağ münaqişəsindən əvvəlki hadisələr zəncirini izləmək çətin deyil. 1987-ci ilin oktyabr ayında SSRİ Nazirlər Soveti sədrinin birinci müavini Heydər Əliyevi tutduğu vəzifədən azad edərək, Siyasi Büronun tərkibindən çıxarırlar. Bir ay sonra akademik A.Aqanbekyan Parisdə erməni diasporu

qarşısında çıxışında Qarabağı Ermənistanla birləşdirməyin zəruri olmasını bəyan edir. A.Yakovlev bizə müsahibə verərkən bu barədə demişdi: “Aqanbekyan Parisdə öz təşəbbüsü ilə çıxış etməmişdir, o, M.Qorbaçovun dəstəyinə əmin idi”.

Fevralın əvvəlində Bakıda iğtişaşlar başlandı. Sov.İKP MK-nın katibləri P.Demiçev, N.Dolqix və Y.Razumovski ictimai rəyi öyrənmək məqsədilə Stepanakertə, Yerevana və Bakıya gedirlər. Məlum olur ki, Azərbaycan xalqı Qarabağın Ermənistana birləşdirilməsinin qəti əleyhinədir. Onda Sumqayıtı bu iyrənc işğalçılıq oyununda qumar kartına çevirirlər. 1988-ci il fevralın 28-29-da burada dünya ictimaiyyətinin nəzərində azərbaycanlıların “vəhşi barbarlar” obrazını yaratmaq məqsədi güdən hadisələr təşkil edilir. Belə çıxır ki, azərbaycanlılarla dinc, yanaşı yaşamaq mümkün deyil. O vaxtdan etibarən, erməni təbliğat maşını tam gücü ilə işləməyə başlayır.”

Hadisələr məhz müsahibədə verilən tendensiya ilə inkişaf edirdi. Sumqayıt hadisələrindən sonra və növbəti 2-3 ildə Moskvadakı Vaqankovo qəbiristanlığının yanındakı erməni kilsəsinin qarşısında fasiləsiz mitinqlər gedirdi. Moskvanın hakim dairələri bu mitinqlərin keçirilməsi üçün hər cür şərait yaratmışdı. Mitinqlərin keçirilməsi üçün təşkilatçılara müddətsiz sanksiya verilmişdi – buna oxşar hal SSRİ praktikasında heç vaxt olmamışdı. Moskva milisi mitinqlərin iştirakçılarını “azərbaycanlıların provokasiyalarından” qoruyurdu. O vaxt Moskva milisinin rəhbəri olan general-mayor Pyotr Boqdanov da meriyanın tapşırığı ilə tez-tez oraya gəlir, mitinq keçirənlərin bir problemi olub-olmadığını yoxlayırdı. Moskva ziyalıları və xarici səfirliklərin nümayəndələri mitinqlərə dəvət edilirdi. Fransa səfirliyinin nümayəndələri vaxtlarının çoxunu bu mitinqlərdə keçirirdi. Odlu-alovlu nitqlər səslənir, Azərbaycan xalqını “faşist” adlandırırdılar. Mitinqdə çıxış edən Nuykin demişdi: “Bu cəllad xalqın nümayəndələri Rusiyadan sürgün edilməlidir”. Starovoytova Azərbaycan dəmir yollarının idarə edilməsi üçün xüsusi forma tətbiq olunmasını, Çerniçenko isə DQMV-də birbaşa prezident üsul-idarəsi tətbiq olunmasını təklif etmişdi və s. Mitinqlərin birində çıxış edən MDU-nun fəlsəfə professoru, əslən DQMV-dən olan Qrant Yepiskoposov Sumqayıt hadisələrini kəskin pisləyərək sözünə belə davam etmişdir: “Azərbaycanlılar Sumqayıt hadisələrinə görə üzr istəməlidirlər, bu halda biz, qan tökülməsinə son qoymaq üçün onlarla dialoqa gedə bilərik”. Professoru fitə basmışlar, yekəpər cavanlardan biri isə professoru tribunadan zorla sürüyüb yerə salmış, bundan sonra professor bayılmışdır. Mitinq iştirakçılarının bir tələbi vardı: “Qana qan!”. Həmin mitinqdə siyasi və ictimai xadimlər, alimlər, yazıçılar, məşhur artistlər – Voznesenski, Yevtuşenko, Bıkov, Okucava, Fazil İskəndər, Əsədov, Çilin-

qarov, Kvaşa və bir çox başqaları iştirak və çıxış etmişdir. Dünyanın aparıcı telekanalları həmin mitinqdən geniş fraqmentlər göstərirdi. Bir neçə il davam etmiş bu piar-mitinqlər Bakıya güclü informasiya zərbəsi vurmuşdur.

SSRİ-nin rəsmi orqanları da kənarda qalmamışdır. SSRİ Prokurorluğunun işçiləri Karakozov, Qdlyan və İvanov Leninqrad televiziyasında bir saatdan çox davam edən veriliş təşkil etmiş, həmin verilişdə Sumqayıt hadisələrindən bəhs edən dəhşətli səhnələr təqdim olunmuşdur. Azərbaycan xalqı haqqında təhqiramiz ifadələr işlətməkdən də çəkinməmişdilər. Hələ məhkəmə olmamışdı, onlar isə bir səslə "güllələmə" maddəsindən danışırdılar. V.Qalkinlə eyni vaxtda SSRİ prokurorluğunda eyni idarədə (onlar hamısı SSRİ prokurorluğunun Ağır Cinayətlərə dair Baş idarənin işçiləri idi) çalışanlar E.Qriqoryandan xəbərsiz olmazdılar, lakin bu barədə heç vaxt bir kəlmə belə dillərinə gətirməmişdilər. Ə.Əhmədov güllələnəndə "ura" deyənlər E.Qriqoryan layiqli cəzasından kənarda qalanda "cınqırlarını" belə çıxartmadılar. Bundan əlavə, həmin hadisələrə dair istintaqın gedişi zamanı birinci ay minə yaxın insan şübhəli şəxs qismində saxlanılmış, beş yüz adam həbs olunmuş, doxsana yaxın adam isə məhkum olunmuşdur ki, onların arasında, bayaq da qeyd etdiyim kimi, ən ağır cəza alanları da olmuşdur. **Lakin 216 azərbaycanlının xüsusi amansızlıqla öldürülməsi, minlərlə insanın müxtəlif dərəcəli bədən xəsarətləri alması, talan edilməsi və onların Ermənistandan və Dağlıq Qarabağdan deportasiyası faktına dair heç bir araşdırma aparılmamış və heç bir erməni cinayət məsuliyyətinə cəlb olunmamışdır.**

Əvvəllər adı bir neçə dəfə çəkilmiş "Sumqayıt. Soyqırım. Aşkarlıq" konfransına qayıtmaq istəyirəm. Həmin konfrans materiallarına fikir versəniz, bir halı aydın sezərsiniz: çıxışçılar Sumqayıt hadisələrini qabartmağı orada həlak olanlara acıdıqlarından deyil, ancaq bir məqsədlə edirdilər – Qarabağ Ermənistana verilməlidir! Onların fikrini publisist Şahmuradyan belə ifadə edir: "Fevralın ortalarında Qarabağın vilayət mərkəzi Stepanakertdə rayon mərkəzində və kəndlərdə DQMV-nin Ermənistan SSR ilə birləşdirilməsi və buna müsbət qərar verilməsi üçün mitinq və yığıncaqlar keçirilməyə başladı. Əmək kollektivləri tərəfindən ölkə rəhbərliyinin ünvanına minlərlə teleqram, məktub və müraciətlər göndərilirdi. Orada qeyd edilirdi ki, söhbət millətin konstitusion hüququ olan "öz müqəddəratını təyinetmə"dən, tarixi səhvin düzəldilməsindən, həmçinin ondan gedir ki, qarabağlıların Azərbaycan xalqına qarşı heç bir iddiası yoxdur". Bəli, erməni millətçiləri belə hesab edirlər. Növbəti dəfə azərbaycanlıların torpağını qoparmaq, onlarin aləmlərində, heç nəyə iddia etmək deyil...

Yenə publisistin çıxışından: "Hal-hazırda mən faktlar barədə danışmayacağam. Əsas olanı yada salmaq istəyirəm. Sumqayıt Qarabağ proble-

mini bağlamaq və susdurmaq məqsədi ilə təşkil edilmişdir. Ermənilərə qarşı çıxışlar dalğası 1988-ci ildə bütün Azərbaycanı bürüməyə başladı, ancaq əsas zərbənin Sumqayıt ermənilərinə vurulması nəzərdə tutulmuşdu. Belə ki, onlar daha köməksiz vəziyyətdəydilər”. Əgər azərbaycanlılar Qarabağa görə qan tökmək istəsəydilər, daha Sumqayıtda yaşayan, Qarabağa heç bir aidiyyatı olmayan zavallı dinc ermənilər nələrinə lazım idi? Belə istək olsaydı, bundan ötrü həm qanunsuzluqla və həyasızlıqla sessiya keçirən, həm də heç bir günahı olmayan 2 azərbaycanlını qətlə yetirən DQMV-də yaşayan ermənilərin qanını tökərdilər və bu problemi də birdəfəlik həll edərdilər. Lakin Şahmuradyanın çox “ədalətli” iradı da var. Deməli, ermənilər torpaqları ala, Yerevanda, Stepanakertdə Azərbaycanın əleyhinə mitinqlər keçirə, ərazisini parçalaya bilərlər, ancaq bu həyasızlığa qarşı azərbaycanlılar səslərini də çıxartmamalıdırlar. Necə də Qorbaçovun Azərbaycan rəhbərliyinə olan iradlarına oxşayır.

Konfransda çıxış edən pedaqoq Ulubabyan bildirir ki, Qafandan cavan oğlanları, guya, Bakıya toya çağırıblarmış, “yolda isə onları Azərbaycan rəhbərliyi öyrədib, Sumqayıtda iğtişaş törətməyə cəlb edirmiş”. Sizcə, ağıllı adam 4 min nəfərin birdən toya dəvət edilməsini arqument kimi gətirə bilərmi? Ümumiyyətlə, konfransdakı uydurmalardan, fitnəkarlıqlardan insanın damarlarında qanı donur. Bu konfransın cəfəng materiallarına bu qədər diqqət yetirməyim azərbaycanlıların “xalqlar dostluğu”ndan danışdığı bir vaxtda, oradakı fikirlərin müxtəlif dillərə tərcümə olunaraq dünyaya sırınması ilə bağlıdır. Həmin konfransın sənədlərinin tam mətni ilə tanış olan birisi kimi, qəti deyirəm ki, tədbirin keçirilməsi 3 əsas məqsədə xidmət edirdi:

1. DQMV-nin Azərbaycan SSR-dən alıb, Ermənistan SSR-ə verilməsi;

2. Sumqayıt hadisələrinin soyqırım kimi tanınması; Baxmayaraq ki, konfrans iştirakçılarının hamısı bir ağızdan Sumqayıt hadisələrinin Moskva tərəfindən təşkil olunduğunu vurğulayır, hətta çarizm dövründəki millətlərarası münaqişələrin də bu qəbildən olduğunu nümunə kimi göstərirlər. Lakin həmin hadisələrin təşkilatçılarının cəzalandırılması məsələsinə gəldikdə, onların heç biri nə Qorboçovu, nə də onun ətrafını bu hadisələrdə günahkar saymırlar. Çünki anlayırlar ki, bu halda, beynəlxalq hüququn normaları buna icazə vermədiyindən, onların istədiyi soyqırım alınmayacaq. Məhz bu səbəbdən onlar konfrans boyu təşkilatçı kimi Mərkəzin adını hallandırsalar da, Sumqayıta görə yalnız Azərbaycan rəhbərliyinin cəzalandırılmasını tələb edirlər.

3. Özlərinin DQMV-də və Ermənistanda Dağlıq Qarabağın Azərbaycandan alınıb Ermənistana verilməsi tələbi ilə keçirdikləri aksiyalara

qanuni don geyindirərək, Azərbaycanda bu tələblərə etiraz əlaməti olaraq keçirilən mitinqlərin Mərkəz tərəfindən qanunsuz sayılmasına və dağıdılmasına nail olunması; Göründüyü kimi, erməni millətçiləri hesab edirdilər ki, onlar Mərkəz qarşısında tələblərlə çıxış etdikləri halda, azərbaycanlılara belə hüquq verilməməlidir.

Keçmiş DTK generalı, sonradan Qərbə qaçmış O.Qordiyevski Sumqayıt əməliyyatına oxşar əməliyyatların təfərrüatını açıqlayaraq yazır: “1959-cu ilin yanvarında Şelepin PQU-da “D” xidməti (sonradan “A” xidməti) adlanan yeni dezinformasiya şöbəsi yaratmışdı. Bu şöbədə əvvəlcə 50 nəfərdən bir qədər çox əməkdaş işləyirdi. Həmin şöbə yaradılandan ta ömrünün sonuna (1968-ci ilə) qədər, ona general İvan İvanoviç Aqayants başçılıq etmişdir. O, 1941-ci ildən 1943-cü ilə qədər Tehranda, 1946-cı ildən 1949-cu ilə qədər Parisdə (“Avalov” təxəllüsü ilə) rezident kimi işləmiş, sonra Dövlət Təhlükəsizliyi Nazirliyi və Dövlət Təhlükəsizliyi Komitəsinin Qərbi Avropa şöbəsinə rəhbərlik etmişdi. İ.Aqayantsın şöbə rəisi təyin edilməsində onun hazırladığı bir sıra saxta memuarların və ədəbi işlərin, o cümlədən general Vlasovun imzası ilə “Mən dar ağacını seçirəm” və İvan Krılovun imzası ilə “Mənim Sovet Ali Komandanlığında karyeram” adlı eyni dərəcədə saxta memuarların, Stalinlə Titonun yazışmaları kimi qələmə verilmiş, Titonun, guya, trotskiçilərə rəğbət bəslədiyini etiraf etdiyi bildirilən və “Karfur” adlı həftəlik nəşrdə dərc edilmiş uydurma yazıların uğurlu alınması mühüm rol oynamışdır.

1959-cu ildə Aqayantsın “D” şöbəsinin rəhbəri kimi ilk fəaliyyət obyektlərindən biri Qərbi Almaniya olmuşdur. DTK bu ölkənin neonasistlər tərəfindən idarə olunması barədə təsəvvür yaratmaq istəyirdi. Aqayants Almaniyada həyata keçirilməsi nəzərdə tutulan fəal tədbirlərdən birini sınaqdan keçirmək üçün öz əməkdaşlarının bir qrupunu Moskvadan, təxminən, 50 kilometr məsafədə yerləşən bir kəndə göndərmiş, onlara svastika şəkilləri çəkmək, antisemit şüarlar yazmaq və qaranlıq düşəndən sonra qəbristandakı məzar daşlarını aşırmaq barədə göstəriş vermişdi. DTK informatorları məruzə etmişdilər ki, bu insident sakinlərin çox hissəsini həyəcanlandırsa da, onların kiçik bir qrupunu DTK-nın provokasiyalarını təqlid etməyə, özlərinin təşəbbüsü ilə antisemit hərəkətlər etməyə ruhlandırmışdı. 1959-1960-cı illərin qışında Aqayants həmin fəndləri AFR-də böyük uğurla tətbiq etmişdi. Şərqi almaniyalı agentlər Qərbə göndərilmiş, onlara yəhudilərin memoriallarını, sinaqoqlarını və mağazalarını murdarlamaq və dağıtmaq, antisemit məzmunlu şüarlar yazmaq barədə göstəriş verilmişdi. Az sonra yerli xuliqanlar və neonasistlər DTK-nın bu kampaniyasına qoşuldular. 1959-cu ilin soçelnik (Milad ərəfəsində bayram axşamı ) mərasimindən 1960-cı il fevralın ortalarına qədər AFR-in hökumət orqanları

antisemit hərəkətləri qeydə almışdı. Sonra birdən-birə bu kampaniyaya son qoyuldu, lakin AFR-in beynəlxalq reputasiyasına ciddi ziyan vurulmuşdu. Qərbi Almaniya siyasətçiləri və dini liderlər xalq qarşısında xəcalət təri tökməyə məcbur oldular. "Nyu-York herald tribun" qəzeti xarici mətbuatın çox hissəsinin bu faktlara münasibətini ümumiləşdirərək "Bonn nasizm zəhərindən xilas ola bilmir" sərlövhəsi altında dərc etmişdi."

Bu gün tam əminliklə deyə bilərik ki, Sumqayıt Qarabağın işğalı üçün Aqayantsın davamçıları olan SSRİ DTK-sının hazırladığı bir əməliyyat idi. Bu əməliyyatın təyinatı azərbaycanlıları bütün dünyanın gözündə bir daha heç vaxt üzərlərindən yuya bilməyəcəkləri çirkabla ləkələmək idi. Nəticələrə nəzər yetirsək, əməliyyatın uğurla yekunlaşdığını deyə bilərik. Hətta Azərbaycandakı bütün hakimiyyət strukturları saat mexanizmi kimi dəqiq işləsəydi belə, buna oxşar hadisə Sumqayıtda olmasa da, Azərbaycanın başqa bir yerində törədilməliydi, çünki hədəf bəlli idi. Bütün dünya bilməli idi ki, guya, ermənilərə münasibətdə törədilmiş vəhşiliklərin təşkilatçıları da, icraçıları da azərbaycanlılar olmuşdular. Sivil dünya isə erməniləri dəstəkləməyə başlamalıydı. Bu gün artıq heç kəs üçün sirr deyil ki, həmin hadisələr müharibəni qaçılmaz etdi. Ona görə də Sumqayıt, bu hadisələri təşkil edənlərin maraqlarına tamamilə cavab verirdi. Çünki Ermənistan bu müharibəyə intensiv hazırlaşırdı.

İndi isə mən bəzi suallara dəqiq cavab vermək istəyirəm: Sumqayıt hadisələrində tərəflər kim oldu?! Bu hadisələrdə təşkilatçı və zərərçəkənlər kimlər idi?!

Tam məsuliyyəti ilə deyirəm ki, bu hadisələrdə zərərçəkən tərəf azərbaycanlılar oldu. Niyə?! Çünki istənilən müstəntiq cinayət işini araşdırmağa başlayarkən, ilk olaraq bu sualın cavabını axtarmağa çalışır: "bu cinayət kimə sərf edir?". Çünki bu sualın cavabı müstəntiqi bilavasitə cinayətkarın kimliyini tapmağa doğru aparır.

Bəs, Sumqayıt hadisələri kimə sərf edirdi?! Erməni millətçilərinə və özünü dahi hesab edən, indi artıq səksən yaşında olmasına baxmayaraq, az qala qadın alt paltarlarının reklamı ilə də məşğul olan Qorbaçova! Erməni millətçiləri bütün erməni xalqının beyninə yeritdikləri "Böyük Ermənistan" ideyasının bir hissəsinin həyata keçirilməsində növbəti addımlarını atdılar. Ermənistan ərazisini qeyri-millətlərdən tamamilə təmizlədi və monoetnik Ermənistan dövləti qurdu, Dağlıq Qarabağı və 6 rayonu Azərbaycandan alıb oranın ərazisində də ikinci monoetnik erməni dövləti yaratdı, bütün dünya isə bu xalqı məzlum, əzilən millət kimi tanıyıb özünü "bərpa etməsi" üçün ona əlindən gələn dəstəyi əsirgəmədi.

Bu yerdə bir məqamı nəzərinizə çatdırmaq istəyirəm ki, təbiət etibarı ilə "pis millət yoxdur, pis insanlar vardır" ideyasına səmimi inanan insanam.

Lakin tarixçi peşəsinə iddialı birisi deyiləm. Cənubi Qafqaz xalqlarının tarixi, coğrafi, mədəni, sosial və s. yaxınlıqlarına baxmayaraq, nə üçün daim bu bölgədə problemlərin olması sualı məni çox maraqlandırıb. Kimlər bunda maraqlıdırlar? Yəqin ki, bu sualın birmənalı cavabı yoxdur. Ancaq hələ 20-ci əsrin əvvəllərində müstəqil dövlətlərini qurmuş Azərbaycan və Gürcüstan Respublikalarının müstəqilliyinin itirilməsində üçüncü mustəqil Ermənistan Respublikasının və S. Şaumyan kimi "dahi" siyasi xadimlərin xidmətləri danılmazdır. Bu bölgədə yerləşən və yenicə müstəqilliyini bərpa etmiş 3 ölkədən hansı digərlərinə problem yaradır? Azərbaycanla Gürcüstan bütün böyük dövlətlərin basqılarına baxmayaraq, müstəqilliyin qorunmasında bir-birinin yanındadırlar, bütün qlobal iqtisadi proyektləri birgə həyata keçirirlər. Gürcüstanla Azərbaycan SSRİ imperiyası çökdükdən sonra aralarındakı problemləri sivil qaydada həll edirlər, bir-birlərinə qarşı torpaq iddiaları yoxdur. Ermənistan isə hər iki qonşusuna qarşı - Azərbaycanda Qarabağa, Gürcüstanda Cavaxetiyaya iddialıdır. Ələlxüsus, Rusiya ilə Gürcüstan arasında olan 2008-ci ilin avqust hadisələrində bu hal özünü bariz şəkildə biruzə verdi. Bütün basqılara baxmayaraq, Azərbaycan hakimiyyəti və xalqı Gürcüstanın ərazi bütövlüyünü dəstəklədi. Gürcüstan torpaqları isə məhz Ermənistan ərazisindən bombalanırdı. Məhz bu anda Cavaxetiya ermənilərinin separatçı hərəkəti yenidən canlandı. Bu yerdə 1996-cı ildə Budapeşt şəhərində oxuduğum günlərdəki müzakirələr yadıma düşür. Həmin vaxt Soros fondunun təşkil etdiyi insan haqlarının qorunmasına həsr edilmiş 3 aylıq hazırlıq kurslarında Azərbaycandan mən, Ermənistandan adını yadımdan çıxardığım, təxminən, 50 yaşında bir kişi, Gürcüstandan isə 24 nəfər iştirak edirdi ki, onların əksəriyyəti ayrı-ayrı vaxtlarda Gürcüstanın ən ali rəhbərliyində təmsil olundular və bəziləri olunmaqda davam edirlər. Biz Mərkəzi Avropa Universitetinin yataqxanasında qalırdıq və dərslərdən sonra bir yerdə olur, müzakirələr aparırdıq. Həmin müzakirələrin əksəriyyəti yuxarıda qeyd etdiyim problemlə bağlı olurdu. Demək olar ki, aramızda bu mövzuda fikir ayrılığı yaranmırdı. Yalnız Ermənistandan olan kurs yoldaşımız bu müzakirəyə qatılmırdı. Həmin müzakirələrdə sonralar Gürcüstanın Milli Təhlükəsizlik naziri olmuş V. Xaburdzaniya daim qeyd edirdi, əgər biz bir-birimizə problem yaratmasaq, kimlərinsə diqtəsi ilə oturub durmasaq, Cənubi Qafqaz cənnətə dönər və hamımız bundan udarıq. Mən bu gün də bu fikirdəyəm.

Həyatımda baş vermiş bir epizodu da xatırlayıram. 2003-cü ildə beynəlxalq qurumların təşkil etdiyi illik insan haqları ilə bağlı ali kursların birində Polşa Xarici İşlər nazirinin müavini mühazirə oxuyurdu. Mühazirəçi beynəlxalq hüququn dərin bilicisi olduğundan, Qarabağ probleminin həllində "dövlətlərin ərazi bütövlüyü", yoxsa "xalqların öz müqəddəratını

təyinetmə" prinsipindən hansının əsas götürülməsinin vacibliyini soruşdum. Üstəlik, onu da nəzərə çatdırdım ki, artıq erməni xalqı öz müqəddəratını həll etmək hüququndan istifadə edərək, Ermənistan dövlətini yaradıb. Bu sual kursdakı erməni dinləyicilərin ciddi narazılığına səbəb oldu. Bundan bir neçə gün sonra Varşavada qədim Polşa abidələri ilə tanış olarkən, həmin kurs yoldaşlarımdan biriylə rastlaşdıq. Bir yerdə nahar etməyə qərarlaşdıq. Naharda da həmin mövzuda söhbətləşdik. Bu zaman həmin yoldaş dedi ki, Ermənistanda bir çoxları Qarabağ probleminin onları Qafqazda və dünyada bir çox qlobal proyektlərdən kənarda qoyduğunu, sadə vətəndaşlara isə bədbəxtçilikdən başqa heç nə gətirmədiyini anlayırlar, sadəcə bu barədə danışa bilmirlər, çünki millətçilər dərhal onlara "düşmən" damğası vururlar. Bir də qeyd etdi ki, Ermənistan parlamentində baş verən gülləborandan sonra daha çox qorxurlar.

Yenidən Sumqayıt hadisələrinin araşdırılmasına qayıdaraq, maraqlı tərəfləri sonadək müəyyənləşdirmək istəyirəm. Beləliklə, artıq gördünüz ki, Ermənistan bu məsələdən nə kimi uduşla çıxdı.

Bəs Qorbaçov və SSRİ DTK-sı?! Bu hadisələr onlara da sərf edəcəkdi. Çünki professor Ç. Sultanovun "Arası kəsilmiş uçuş. İkinci cəhd" kitabında adlandırdığı kimi, ölkədəki idarəolunan xaos Qorbaçova "dostları" Liqaçovu, Razumovskini və digər yenidənqurma tərəfdaşlarını partnomenklatura adı ilə siyasi səhnədən silməyə imkan verəcəkdi. Digər tərəfdən, ermənilərin mənafeyini təmin edəcəyi təqdirdə, dünyada çox böyük güc mərkəzi hesab edilən erməni diasporunun dəstəyini qazanacaqdı. Məhz belə də olmuşdu. Dünyanın gözündə Qorbaçovun nüfuzu yüksəlməkdə davam edirdi və bu köməklik sonda onu Nobel mükafatına aparacaqdı. SSRİ DTK-sı isə öz gücünü Tbilisidə, Bakıda,Vilnyüsdə və digər bölgələrdə istədiyi kimi nümayiş etdirmək fürsəti qazandı**.**

Adıçəkilən kitabda pofessor Ç.Sultanov yazır: "Qlobal mənada Qorbaçovun postsovet "bespredeli"ni 1917-ci ilin ideologiyasını xatırladan siyasi xaos adlandırmaq olar. Mandelştamın "biz ayaqlarımızın altında ölkəni hiss etmədən yaşayırıq" ifadəsi məhz bu ana çox yaraşır. Ancaq erməni maraqları baxımından bu, idarəolunan xaos idi: bu xaotik siyasi sistemin hər bir elementində erməni xadimlərinin səyi nəticəsində onların maraqları qorunurdu və bunda onlara haqq vermək lazımdır. Bu Qorbaçov və postsovet "bespredeli" Azərbaycan xalqına çoxlu iztirablar gətirdi. Bundan erməni xalqı uddumu? – bu, böyük sualdır."

Mən isə əminəm ki, birinci növbədə erməni millətçilərinin xəstə "Böyük Ermənistan" ideyasına mübtəla olmuş erməni xalqı uduzdu. Çox bəsit də olsa, izah edim.

Sadəcə bir fakt üzərində dayanıram: artıq köçmək məsələm

reallaşanda, Stavropol diyarındakı 5 otaqlı mənzilimi Bakıya dəyişmək üçün o vaxtkı qaydalara uyğun olaraq, elan verdim. Ermənistandan azərbaycanlıların deportasiya edilməsi ilə bağlı Bakıda yaşayan ermənilər özlərini çox narahat hiss edir və evlərini Ermənistana yox, Rusiyaya dəyişmək üçün variant axtarırdılar. Az zaman kəsiyində, Bakıda yaşayan ermənilər tərəfindən yüzlərlə təklif aldım. Təklif olunan mənzillərin hamısı Bakının mərkəzində - Səbail, Nəsimi, Nərimanov rayonlarında, əsasən parklar ətrafında mənzərəli sahələrdə yerləşirdi. Mənimlə kiçik qardaşım da yaşadığından, Nərimanov rayonunda parkın yaxınlığında yerləşən, fəhlə S.Mizoyana məxsus iki və üçotaqlı mənzilləri seçdim. Tək bu proses zamanı Bakının mərkəzində yerləşən daş mənzillərdə əsasən ermənilərin yaşadıqlarının şahidi oldum. Azərbaycanlı professor-alimlər isə Əhmədlidə, Yeni Günəşlidə beton mənzillərdə yaşayır, Ermənistanda yaşayan azərbaycanlılar isə mal-qara saxlamaqla, əkinçiliklə məşğul olub bir parça çörək uğrunda çarpışırdılar.

Bundan başqa, hamı bilir ki, müstəqillik əldə edilən kimi bütün keçmiş SSRİ respublikalarında olduğu kimi, Azərbaycanda da özəlləşmə məhz kiçik məişət, iaşə obyektlərindən başladı. Azərbaycanda isə onlar erməni milliyyətindən olan insanlara məxsus idi. Özəlləşmə üçün lazım olan nəğd pul kütləsi də məhz onlarda idi. Təsəvvür edin, əgər həmin başıbəlalı proseslər baş verməsəydi, faktiki olaraq, Azərbaycan iqtisadiyyatının əhəmiyyətli hissəsinin sahibi ermənilər olacaqdı. Məhz göstərdiyim səbəbdən Ermənistanın Cənubi Qafqazdan keçən bütün qlobal proyektlərdən kənarda qalmasını da nəzərə alsaq, bu ağılsız “Böyük Ermənistan” ideyasının sıravi erməni vətəndaşlarına nəyin bahasına başa gəldiyini təsəvvür etmək çətin deyil.

Qorbaçovun bu fitnəkar əməlindən çox respublikalar, o cümlədən qonşu Gürcüstan da eyni ziyanı çəkdi. Əminəm ki, əgər bu ədalətsizlik davam edərsə, yaxın zamanlarda, biz arzu etməsək də, bir balaca zəifləyən kimi, bu gün Ermənistana dəstək olan Rusiya da bu problemlərlə üzləşəcək. Artıq buna zəmin hazırlanıb. Mən 1975-ci ildən Krasnodarda yaşamağa başladım. O vaxtlar da Krasnodar, Stavropol diyarlarında, Rostov vilayətində ermənilər yaşayırdı, ancaq indiki sayda deyildilər. Bu günlər onlar artıq həmin məkanların ən səfalı yerlərini həm sayca, həm də iqtisadi cəhətdən tam ələ keçiriblər. Ümumilikdə, bu gün bütün Rusiya iqtisadiyyatı, demək olar ki, ermənilərin əlindədr. Sadəcə, bir faktı nəzərinizə çatdırım: bu gün iqtisadiyyatın özəyi olan Rusiya Banklar Assosiasiyasının Prezidenti milliyətcə erməni olan Tosunyan Qaregin Aşotoviçdir. Əgər nəzərə alsaq ki, bu ərazilər erməni millətçilərinin tərtib etdiyi “Böyük Ermənistan” xəritəsində öz əksini tapıbdır, şərhə ehtiyac qalmır.

Qorbaçovun bu hadisələrdən payını axıradək almasına isə bir səbəb

mane oldu: Azərbaycanda xalq hərəkatının başlaması və milyonlarla insanın "Azadlıq" meydanına axışması... Qorbaçov bunu hesaba almamışdı, onun gözündə Azərbaycan xalqı daim təmasda olduğu, öz haqqını belə tələb etməkdən qorxan "dovşan məmurlar" kimi idi. Bu dəfə belə olmadı, Azərbaycan xalqı haqqını qorumağa qadir olduğunu göstərdi və bu, Qorbaçovun məğlubiyyətinə gətirib çıxardı.

Bu hadisələr Qarabağda baş verənlərə milli azadlıq donu geyindirməyə çalışan mafioz, oğru qruplara sərf etdi. Onlardan bir qismi - Aqanbekyan, Poqosyan kimiləri bu hadisələrdən bolluca yararlanıb, sonra da gözdən itdilər. Bu gün Qarabağla bağlı onların heç birinin "çınqırı" belə, eşidilmir. Digərləri - Köçəryan, Sarkisyan və başqaları bu dalğada əvvəl DQMV-də, sonra isə Ermənistanda hakimiyyəti zəbt etdilər və bu yolda parlamenti gülləboran etməkdən belə çəkinmədilər. Köçəryan Azərbaycanın Ağdam və digər bölgələrində quldurluq yolu ilə əldə etdiklərini leqallaşdırdıqdan sonra hakimiyyəti sələfi Sarkisyana dədə malı kimi təhvil verib, böyük biznesə girişdi. Köçəryanın quldurluğu barədə bir çox mənbələr xəbər verir. Vaşinqtonun Con Hopkins universitetinin professoru Svante Kornellanın "Dağlıq Qarabağda konflikt: dinamikası və gələcəkdə həlli" araşdırmasında yazır: "Ağdamın mülki vətəndaşları öz evlərini tərk etməyə məcbur olub, şəhər isə yandırılıb və talan olunub". Bu fikri parlamentdə öldürülmüş Ermənistanın Baş naziri Vazgen Sarkisyanın qardaşı, "Respublika" partiyasının lideri Aram Sarkisyan da təsdiqləyir. O, Köçəryanı Ağdamı talan etməkdə günahlandıraraq, deyir: "Ona elə gəlir ki, Ağdamı taladığı kimi, bizim vətəni də talamaq olar". Hal-hazırda Prezident olan Sarkisyan isə hakimiyyəti itirəcəkləri təqdirdə, törətdikləri cinayətlərə görə dünya qarşısında cavab verəcəklərini bildiyindən, "Böyük Ermənistan" xəstəliyinə düçar olmuş xalqı uçuruma doğru aparmaqda davam edir.

Birmənalı şəkildə bu hadisələr Azərbaycana sərf etmirdi. Çünki məhz bu hadisələr 200 mindən artıq azərbaycanlıların dədə-baba yuvalarından qovulmasına, onlara qarşı misli görünməmiş vəhşiliklər törədilməsinə, torpağının 20%-nin itirilməsinə, bir milyon insanının qaçqın olmasına, beynəlxalq aləmdə günahkar vəziyyətə düşməsinə gətirib çıxardı. Azərbaycan bu hadisələrdən heç nə əldə etmədi!

Ümid edirəm ki, Sumqayıtdan sonra Qarabağla bağlı baş verən bütün hadisələr mütəxəssislər tərəfindən, ən azı, "Sumqayıt prosesi" bu kitabda araşdırıldığı kimi, xronoloji qaydada incələnəcək ki, bizdən sonrakı nəsillər millətçi ermənilərin saxta uydurmaları qarşısında aciz qalmasınlar.

# FƏRQLİ İNSANLARDAN YEKDİL RƏY VƏ YAXUD SUMQAYIT HADİSƏLƏRİ KİMİN VİCDANINDA QALDI?!

Düşünürəm ki, indiyə qədər oxuduqlarınız tək Sumqayıtda deyil, ümumiyyətlə, həmin illərdə baş verən hadisələrin kökü - əsl səbəbləri ilə bağlı sizlərdə aydın təsəvvür yaradıb. Deyilənləri, yazılanları, artıq beyninizdə formalaşan həmin təsəvvürü daha da möhkəmləndirmək, yarana biləcək şübhələri tamamilə dağıtmaq üçün qərara gəldim ki, ayrı-ayrı şəxslərin o illərə dair xatirələrindən, müsahibələrindən, həmçinin müxtəlif əsərlərdə gedən fikirlərdən, informasiya vasitələrində nümayiş və dərc olunan məlumatlardan ibarət ayrıca bir bölüm də hazırlayım.

Ümid edirəm ki, müxtəlif millətlərin və əqidələrin, fərqli dünya-görüş və siyasi cinahların təmsilçiləri olan insanların bu bölümdə yer alan fikirləri hadisələrin məğzini obyektiv şəkildə çatdırmaq istəyimi bir daha təsdiqləyəcək. Gələcəkdə bu hissənin həm də tarixçilər tərəfindən genişlənməsinə, zənginləşməsinə böyük ehtiyac olduğu düşüncəsindəyəm.

Beləliklə, öncə, kitabın əvvəlki bölümlərində dəfələrlə istinad etdiyim **Saveliy Peretsin** sənədli povestindən - onun Sumqayıt hadisələri üzrə cinayət işində istintaq qrupunun rəhbərlərindən biri olmuş **Vladimir Kaliniçenko** ilə söhbətinə dair xatirələrini nəzərinizə çatdırmaq istəyirəm:

“...SSRİ Prokurorluğunun xüsusilə mühüm işlər üzrə müstəntiqi Volodya Kaliniçenko da Alik Zərbəliyevın “İçərişəhər”də, öz qohumu İzanın “Karvansara” restoranında qayğıkeşliklə təşkil etdiyi nahar zamanı bu barədə nə isə danışırdı. Perets alnını qırışdıraraq nə isə yada salmağa çalışırdı... Kaliniçenko çopur basmış üzünü mənə tərəf çevirərək soruşdu:

- Sən necə bilirsən, Sumqayıt barədə proseslər nəyə görə ört-basdır edildi? - sonra su kimi şəffaf gözlərini tez-tez qırparaq öz sualına özü cavab verdi:

- Zərərçəkənlər məhkəmədə Qriqoryanın erməni olduğunu biləndə, onlar hamısı - başa düşürsənmi, hamısı! – öz ifadələrindən imtina etdilər. Sən deyirsən videofilm var. Düzdür, var. **Yeri gəlmişkən, Qriqoryan təkcə videoda altı nəfəri qətlə yetirmişdir...** amma sən məni

bağışla, məhkəmə üçün video boş şeydir... Cinayət Məcəlləsinə tamamilə uyğun olaraq... bu, sübut deyil... Düzdür, ona 14 il iş verdilər, amma nə olsun... Mən bu 14 (burada səhv olaraq 12 yerinə 14 göstərilmişdir. A.İ.) ili azaltmayacaqlarına çox şübhə edirəm. Amma Əhmədovu bircə nəfəri öldürdüyünə görə, güllələdilər... Ona görə də daha belə davam edə bilməz...

Kaliniçenko mənim burnumun qabağında barmağını silkələdi:

– Cınqırını da çıxartma... bir də, ümumiyyətlə, sən necə fikirləşirsən, evlərin damlarındakı operatorlar haradan gəlmişdilər? Məgər onlar marşrutu bilirdilər? Bəs sən nə bilirdin?...

Ümumiyyətlə, Perets elə fikirləşirdi ki, fevralın 25, 26-da Qafandan qovulmuş azərbaycanlıların Sumqayıta gəlməsi tamamilə təbiidir, çünki onların uşaqları və nəvələri uzun illər boyu burada məskunlaşmışdı. Sumqayıtın “ac” zavod və tikintilərində işlək əllərə və başlara həmişə ehtiyac vardı, karyera üçün imkanlar yaranmışdı, yaşayış binalarının sayı göbələk kimi artırdı. “Sumqayıt Kommunisti” qəzetinin redaktoru Mark Voroşilovski sonralar Jurnalistlər İttifaqının plenumunda Peretsə etiraf etmişdi ki, fevralın 27-də və 28-də keçirilən mitinqlər əvvəlcə normal gedirdi. Onun sözlərinə görə, ayın 28-də günortaya yaxın mitinqin çox tezliklə və mülayim tərzdə talanlara çevrilməsini özü də hiss etməmişdi. Kaliniçenko deməsə də, Perets bilirdi ki, Sumqayıt işi üzrə məhkum edilmiş 63 nəfər arasında, o cümlədən güllələnmiş Əhmədov da daxil olmaqla kütləni idarə edən yalnız Qriqoryan kimi 3-4 nəfər qatı cinayətkar vardı və indi onlar hamısı cəzadan azad edilmişdilər (güllələnmə hökmü dərhal icra edilmiş Əhmədovdan başqa).

Onun xəyalında başqa fenomenlər də canlanırdı. Məsələn, Sumqayıtda milliyyətcə erməni olan məsul işçilərə, orqan əməkdaşlarına, şəxsi sex sahiblərinə məxsus mənzillərin heç biri talan edilməmişdi. Halbuki, onların bəziləri zərərçəkmiş həmtayfaları ilə eyni binanın eyni blokunda yaşayırdılar. Yaxınlıqdakı “Üçtəpə” və “Nasosnaya” bazalarında yerləşən qoşunlar da buraya gələrkən əsla tələsməmişdi, onlara çox qəribə və qəti əmr verilmişdi: “Siz işə qarışmayın!”

Kaliniçenko belə hesab edirdi ki, məhkəmənin açıq-aşkar keçirilməsi çox vacibdir. Lakin onun ağzını yumdular...”

Yenə Peretsin həmin povestindən 1988-ci ilin iyun – avqust aylarına dair xatirələrindən sizin nəzərinizə bəzi fraqmentləri çatdırmaq istəyirəm:

“...Şənbə günü - iyunun 11-də axşam və bazar günü - iyunun 12-də milliyyətcə erməni olan, partiya, sovet və təsərrüfat aparatında yüksək vəzifələr tutan onlarca məmur, alim, incəsənət xadimi, yazıçı və şair, eləcə də məxsusi bu məqsədlə təyyarəyə minib paytaxta uçan katolikos Vazgen gözlənilmədən, qeyri-rəsmi qaydada partiya və ölkə rəhbərlərinin bağ evlərinə gəldilər. Onlar bir səslə tələb edirdilər ki, Vəzirova təsir göstərilsin və mitinqlərə, Azərbaycan Ali Sovetinin Rəyasət Heyətinin iclasının keçirilməsinə icazə verilməsin. Onlar deyirdilər: “Bu, təkcə SSRİ-də deyil, bütün dünyada ermənilərin narazılığına səbəb olacaq, yenidənqurmaya çox böyük ziyan vuracaqdır”. Bəli, onların özləri Yerevanın “Teatralnıy” meydanından insanların dağılmasının qarşısını alır, hər vasitəylə onları qızışdırır, əvəzində həyasızcasına azərbaycanlıların etirazını boğmaq üçün Mərkəzdən, başda Qorbaçov olmaqla, güc tətbiq olunmasını tələb edirdilər...”.

Daha sonra Perets SSRİ Xalq Deputatları Qurultayında fasilə zamanı şahidi olduğu dialoqu xatırlayaraq yazır:

“Arutunyan Yerevan Universitetinin rektoru Ambartsumyanın təkidi ilə asta səslə soruşdu:

- Biz nə edək, Mixail Sergeyeviç? Xalqa nə deyək?

- Elə-belə də de! Necə varsa, elə!

Bu dəfə Petrosyan söhbətə qarışdı:

- Amma, Mixail Sergeyeviç, Siz də razılaşın ki, hər halda soyqırım faktı olub.

Qorbaçovun gözləri qəzəblə parladı:

- Başın sağ olsun, doğma diyar! Guya, başqa problemlərimiz yox imiş! Azərbaycanlılar arasında öldürülənlər daha çox olub! Bax, hərbçilər mənə məruzə ediblər... Göstərimmi?

Arutunyan: - Bağışlayın, - deyib yoldaşları ilə birlikdə kənara çəkildi. Orada Ermənistan nümayəndələri və Qorbaçovun köməkçisi Georgi Xristoforiviç Şahnazarov qaşqabaqlı halda dayanmışdılar.”

Bu məqamda mən, 18 iyul 1988-ci Ali Sovetin iclasında Qorbaçovla erməni deputat Ambartsumyanın arasında baş tutan çox maraqlı dialoqu nəzərinizə çatdırmaq istəyirəm:

«**Qorbaçov:** Əsrin əvvəlində Yerevanda neçə azərbaycanlı yaşayırdı?

**Ambartsumyan:** Deməyə çətinlik çəkərəm.

**Qorbaçov:** Mən xatırladaram. Əsrin əvvəlində Yerevanda azərbaycanlılar bütün əhalinin 43%-ni təşkil edirdilər. Bəs indi nə qədərdirlər?

**Ambartsumyan:** İndi onlar çox azdırlar, yəqin ki, 1%-ə yaxındırlar.

**Qorbaçov:** Bunu xatırladaraq mən erməniləri günahlandırmaq istəmirəm, amma görünür ki, ermənilər azərbaycanlıları sıxışdırıblar...»

Göründüyü kimi, bəzi məqamlarda Qorbaçov özünün, guya, ədalətli, qərəzsiz bir rəhbər olması təəssüratını yaratmaq istəyir. Lakin bu dialoqlar bir daha onun nə dərəcədə ikiüzlü, riyakar olduğunu sübut edir.

Qısa statistik məlumatı diqqətinizə çatdırmaq istəyirəm: 1990-cı ilin əvvəlində Ermənistanda artıq heç bir nəfər də azərbaycanlı qalmamış, Ermənistanın ərazisi tamamilə azərbaycanlılardan təmizlənmişdi. Lakin neçə illərin ədavətinə və erməni millətçilərinin azərbaycanlılara qarşı törətdikləri qəddarlıqlara, torpaqlarının işğalına, insanlarının qaçqın vəziyyətinə düşməsinə baxmayaraq, bu gün də Azərbaycanda otuz min erməni yaşayır. Elə təkcə mənim qaldığım binanın bir blokunda - Bakı şəhəri, Həsənoğlu küçəsi, 21 ünvanda 3 erməni xanımı yaşayır. Bir dəfə də onlara ögey münasibəti görməmişəm. Bu faktın özü kimin kimə qarşı ədavətli, qərəzli və qəddar olmasını açıq şəkildə göstərir.

Sumqayıtdakı hadisələr zamanı mənbəyi və gəliş nədəni bəlli olmayan operatorlar barədə Bakıda anadan olmuş, hal-hazırda İsraildə yaşayan məşhur jurnalist-yazıçı **Pyotr Lyukimson** özünün **“Sumqayıt yəhudinin gözü ilə”** adlı kitabında yazır: “...Sumqayıt hadisələrini, talanların ilk dəqiqələrindən başlayaraq soyuqqanlılıqla lentə çəkmiş operatorların kimlikləri elə gizli də qaldı. Hadisələrdən bir neçə gün sonra Avropanın bütün telekanalları həmin lent yazılarını göstərirdi”.

Sumqayıt hadisələri barədə ilk sensasiyalı etirafı isə yenidənqurmanın ideoloqu **A.Yakovlev** edib. O hələ 1992-ci ildə “Moskovskiye novosti” qəzetində bəyan etmişdi ki, “***Dnestryanı bölgədə və Sumqayıtda baş vermiş hadisələri SSRİ DTK-sı təşkil edib”.***

A.Yakovlev həmin fikri 1993-cü ilin mart ayında Azərbaycan televiziyası ilə də təsdiqləyib. O, “Sumqayıtın əks-sədası” verilişində deyib: **“Sumqayıt hadisələrini SSRİ hərbi-sənaye kompleksi və SSRİ DTK-sı təşkil etmişdi”.**

On ildən sonra o, həmin fikri eynilə yenə də təkrarlayıb:

“Xruşşovun dövründə xüsusi xidmətlərin nüfuzu bir qədər azalsa da, təbii ki, onlar əllərini qoyunlarına qoyub oturmamışdılar. Rejim yenidən (təxminən, Xruşşovun hakimiyyətdə olduğu dövrün ikinci yarısından başlayaraq) güc strukturlarını möhkəmlətməkdən başqa çarə tapmırdı. Hər hansı etiraz təzahürləri amansızcasına boğulurdu. Cəza orqanları dirçələrək, özləri üçün yeni imkanlar icad etmişdi. Onlar, özlərinin gərəkli olmasını sübut etmək üçün özləri iğtişaşlar və münaqişəli vəziyyətlər yaradır, əhalini buna təhrik edirdilər. Xruşşovun dövründə Novoçerkasskda belə olmuşdu. Yenidənqurma dövründə isə ***Sumqayıtda, Vilnyüsdə, Riqada belə olmuşdu***”.

Yenidənqurmanın əsas ideoloqunun, Dağlıq Qarabağdakı separatçıların əsas himayədarlarından birinin, həmçinin həmin illərdə ermənilərin mövqelərinə haqq qazandırmaq üçün Sumqayıt hadisələrindən dəfələrlə istifadə etmiş şəxsin bu sensasiyalı etirafı Sumqayıt hadisələri barədə çox məsələyə aydınlıq gətirir. Gec də olsa, səslənmiş bu etiraf çox əlamətdardır.

Lakin Sumqayıt hadisələrinin təqsirini yalnız SSRİ DTK-da görən Yakovlev özünü təmizə çıxarmaq üçün asan, ancaq heç də sadəlövh olmayan yolla gedir. Əgər Yakovlev, özünün də dəfələrlə etiraf etdiyi kimi, İkinci Dünya müharibəsində onun həyatını xilas etmiş milliyətcə erməni olan həkimin borcunu minlərlə azərbaycanlının qanı hesabına ödəmək istəməsəydi, Sumqayıt hadisələrinin və ona oxşar hadisələrin müəlliflərinin hamısını – doğma Sov. İKP MK-dan başlamış SSRİ DTK-ya qədər - açıqlasaydı, bu, daha məntiqli və daha dəqiq olardı. İnanıram ki, bu kitabı oxuyan hər kəsdə Sumqayıtda SSRİ xüsusi xidmətlərinin fəaliyyət göstərməsinə dair əsla şübhə yaranmayacaq.

Ancaq hər şeyi SSRİ DTK-nın üzərinə yıxıb, digərlərini bu cinayətdən sığortalamaq da doğru deyil. Çünki Qorbaçov və onun komandasının hadisələrin qarşısını almaq üçün hərəkətsizlik faktı ortadadır. Şübhə yoxdur ki, hadisə başlanandan bir neçə saat sonra Qorbaçova hər şey məlum idi. Özü də o, informasiyanı müxtəlif kanallar

vasitəsilə alırdı. Belə olan halda isə bir sual ortaya çıxır: niyə qoşunlar sonralar Bakıda olduğu kimi, hərəkətsiz qalmışdılar? Axı onlar SSRİ DTK-sına tabe deyildilər! Deməli, günahı təkcə SSRİ DTK-sında yox, bütövlükdə o vaxtkı rəhbərlikdə axtarmaq lazımdır.

SSRİ Dövlət Təhlükəsizlik Komitəsinin sədrinin müavini **Filipp Denisoviç Bobkov** həmin dövr hadisələrinə şərh verərək öz xatirələrində yazır:

"Kimin – ermənilərin, yoxsa azərbaycanlıların birinci başlaması, kimin daha çox təqsirkar olması və özünü necə aparması barədə mübahisə etmək olar, lakin fakt faktlığında qalır ki, birinci qurban verənlər azərbaycanlılar olub: 1988-ci il fevralın 20-də Əsgəran rayonunda iki nəfər azərbaycanlı öldürülüb – üzümlükdə işləyən kəndli və erməni yaraqlısına şübhəli görünən gənc".

Bundan əlavə, Bobkov həm də Sumqayıt hadisələrinin başlanğıcını təsvir edərək, göstərir: "Azərbaycanda başqa şəhərlərdə ehtirasları cilovlamaq və adamların küçələrə çıxmasına yol verməmək mümkün olsa da, Sumqayıtda, şəhər partiya komitəsinin qarşısında azı beş min sakin toplaşmışdı. Qafan rayonundan qaçmış azərbaycanlılar meydana gəlib, Ermənistanın əsasən azərbaycanlılar yaşayan rayonlarında törədilən talanlar barədə danışdıqca, gərginlik kulminasiya həddinə çatdı. Şairə Silviya Kaputikyanın Moskvada M.S.Qorbaçovla görüşü barədə Ermənistan televiziyası ilə çıxışı isə, sanki, odun üstünə yağ tökdü".

Xatırladım ki, həm həmin görüş, həmçinin Silva Kaputikyanın televiziyadakı məlum çıxışı barədə əvvəlki bölümlərdə ətraflı məlumat vermişəm. Yuxarıdakı sətirlərin müəllifinə gəldikdə isə, bu, həmin Bobkovdur ki, 1985-1990-cı illərdə Azərbaycan KP MK-nın Partiya Komissiyasının sədri olmuş R.Axundov Stepanakertdə onunla söhbətini şəxsən mənə danışarkən, demişdi:

"Stepanakertdə baş vermiş hadisələr barədə adi darıxdırıcı söhbət zamanı Bobkov gözlənilmədən mənə belə bir sual verdi: "Ermənilərin bundan sonrakı hərəkətlərini siz necə proqnozlaşdırırsınız?". Mən bir qədər fikirləşəndən sonra cavab verdim: "Mənim fikrimcə, onlar Azərbaycan şəhərlərinin birində hər hansı provokasiya təşkil edəcəklər". Bobkov məni sorğu-suala tutmaqda davam edirdi: "Hansı şəhərdə?". Mən Azərbaycan şəhərlərindən birinin adını çəkdim. Sumqayıt ağlıma gəlməmişdi, çünki bu şəhər həmişə mənim komsomolda keçmiş gənclik

illərimlə bağlı assosiasiyalar yaradırdı. Bobkov fikrə getdi və mənim cavabımı şərh etmədi. Daha bu mövzuya qayıtmadı.”

Qorbaçovun köməkçisi **K.Brutens** öz memuarlarında yazır:

“...Sumqayıt hadisələri Qarabağ probleminə ***yeni çalarlar*** vermiş oldu. Bu hadisələr Qarabağ problemini kəskin münaqişə dərəcəsinə çatdırdı. Tərəflər həddən artıq qəddarlaşırdı, problemin həlli üçün zorakı metodlara əl atmaq meyli get-gedə artırdı. Bu şəraitdə ***münaqişənin inkişafının növbəti məntiqi mərhələsi müharibə ola bilərdi*** *və o,* yaxınlaşırdı. Mərkəzi hakimiyyət isə heyrətamiz, hətta deyərdim ki, ümidsiz bir inadkarlıqla mövqeyindən dönmürdü, ola bilsin ki, o, öz xəttinin perspektivsiz olmasını artıq anlayırdı”.

Qarabağ separatçılarına qarşı xüsusi münasibəti ilə seçilən birisinin bu mühüm etirafı yeni suallar doğurur: ***Müharibə kimə lazım idi? Onilliklər boyu müharibəyə hazırlaşan kimlər idi? Qonşularının torpaqlarına kim göz dikmişdi? Hətta Sovet dövründə də qonşu xalqlara qarşı nifrət hissini kim təbliğ edirdi?***

***Birmənalı şəkildə deyə bilərəm ki, bunların heç biri Azərbaycana, sadəcə olaraq, lazım deyildi!***

Analitik əsərləri ilə məşhur olan yazıçı **İqor Lvoviç Buniç** də öz əsərlərində Sumqayıt hadisələrinə toxunur. İlk əvvəl, qısaca olaraq Buniç haqqında məlumat vermək istəyirəm: o, hərbi-dəniz aviasiyası məktəbində təhsil almış mütəxəssis kimi, müxtəlif idarələrdə fərqli vəzifələr tutub, 1974-cü ildən 1984-cü ilədək Leninqrad Hərbi-Dəniz Akademiyasında çalışıb, arxiv materiallarını araşdırmaq və akademiyanın rəhbərliyi üçün analitik icmallar tərtib etməklə məşğul olub. 70-ci illərin ortalarından isə fərqli imzalarla hərb tarixi barədə ixtisaslaşmış xarici ədəbiyyatın tərcüməsi sahəsində fəaliyyət göstərib, həmçinin öz əsərlərinin dostları arasında yayılmasına çalışıb. Məhz bu fəaliyyəti ilə əlaqədar iki dəfə - 1982-ci ildə “iftira xarakterli” və “sirr əhəmiyyətinə yaxın” materialları, 1984-cü ildə isə ikinci dəfə “Donskoy işi” ilə bağlı “antisovet ədəbiyyatını yaydığına görə», Leninqrad DTK-sı tərəfindən rəsmi xəbərdarlıq alıb. 1984-cü ildə ştatların ixtisarı bəhanəsi ilə işdən azad edilib. O, bir neçə analitik xarakterli, xüsusilə “Partiyanın qızılı”, “Prezidentin qılıncı”, “Tufan əməliyyatı” və s. əsərləri ilə postsovet miqyasında məşhurlaşan yazıçı olub.

Buniç öz əsərlərində Sumqayıtda və Bakıda baş verənləri müxtəlif

dövrlərdə SSRİ-də baş verən, hələ də sirri açılmayan əsas tarixi hadisələr sırasına aid edir. Həmin hadisələr bunlardır:

1. Bolşevikləri hakimiyyətə kim və nə üçün gətirmişdi?
2. Çar ailəsinin aqibəti necə olmuşdur?
3. 1924-cü ilin yanvarında Leninin başına nələr gəlmişdi?
4. Kirov kimin əmri ilə öldürülmüşdü?
5. 1941-ci il 22 iyun fəlakəti necə baş vermişdi?
6. 1953-cü ilin fevralında Stalinin özünün başına nələr gəlmişdi?
7. Bir il sonra Lavrenti Beriyanın başına nələr gəlmişdi?
8. "SMERŞ" ("Смерть шпионам!" - "Casuslara ölüm!" şüarının ixtisar edilmiş forması) tərəfindən məhv edilmiş "casuslar" arasında nə qədər günahsız qurban vardı?
9. "Novorossiysk" xətt gəmisini kim partlatmışdı?
10. Soljenitsının kitablarını xaricdə kim çap etdirmiş və SSRİ-də yaymışdı?
11. Vilnüs qırğını kimin provokasiyasının nəticəsi idi? Bəs Sumqayıt qırğını? Bəs Bakı qırğını? Bəs Tiflis qırğını?
12. Partiyanın pullarının xaricə axması kanallarını kim təşkil etmişdi?
13. Çeçenistan müharibəsini kim başlamış və bu düyünü kim açmışdı?
14. İndiki Zyüqanovların "qənaətcil" seçkiqabağı kampaniyalarını kim maliyyələşdirir?

Şübhəsiz ki, İ. Buniç kimi bir yazıçı-publisist SSRİ adlı imperiyanın mahiyyətini anlamaq üçün açılması çox vacib olan hadisələrin sırasına Sumqayıt və Bakı qırğınlarını elə-belə salmayıb.

Həmin illərdə Azərbaycana rəhbərlik etmiş, taleyi gözlənilən olsa da, acı təəssüf doğuran **Ayaz Mütəllibov**un o dövrkü hadisələrlə bağlı gəldiyi qənaət isə belədir: "Azərbaycanın yaxşı planlaşdırılmış qəsd nəticəsində düşdüyü dəhşətli haqsızlıqlar son illərdə məni düşündürürdü: doğrudanmı, hamı üçün heç bir şeyin fərqi yoxdur, doğrudanmı, heç kim (mən respublikaları nəzərdə tuturam) baş verənlərlə maraqlanmayacaq? Axı bu minvalla istənilən xalqın axırına çıxmaq olar və bu halda başqaları, sadəcə müşahidə edəcəklər. Azərbaycana münasibət bizim İttifaqın iç üzünü tam açıqladı. Axı biz bu gün də təkik."

SSRİ DTK-sının keçmiş sədri **Vladimir Kryuçkov**un ölümü ilə əlaqədar Britaniyanın **"The Times"** qəzeti 30 noyabr 2007-ci il tarixdə öz saytında yazır: "...Kryuçkov və digər DTK əməkdaşları Kremlin gücünü və nüfuzunu zəiflətmək üçün bu "təhlükəli elementlərə" diqqət yetirirdilər. Onlar insanların yerlərdəki narazılığını əsas gətirərək, SSRİ-nin Sumqayıt və Bakı (Azərbaycan), Tiflis (Gürcüstan), Vilnyüs (Litva) və Riqa (Latviya) kimi şəhərlərində təxribat aksiyaları təşkil etdilər..."

İndi isə nəzərinizə hər zaman səs-küy doğuran və nə qədər paradoksal səslənsə də, çox zaman reallıqları ehtiva edən fikirləri ilə tanınan, xüsusi xidmət orqanları ilə sıcaq münasibətləri heç kimdə şübhə doğurmayan, Azərbaycan xalqının qatı düşməni Rusiya Liberal Demokrat Partiyasının başçısı **Vladimir Jirinovskinin** Rusiya Dövlət Dumasındakı müzakirələr zamanı səsləndirdiyi növbəti həqiqəti əks etdirən fikrini çatdırmaq istəyirəm. Xatırladım ki, 2010-cu ilin mart ayında bütün telekanalların nümayiş etdirdiyi müzakirələrdə Jirinovskinin iştirakı ilə qalmaqal baş verdi. Belə ki, Liberal-demokratların başçısı RF Cinayət Məcəlləsindən milli, irqi və dini düşmənçiliyin qızışdırılmasına görə cəza nəzərdə tutan 282-ci maddənin çıxarılmasını təklif etdi. V.Jirinovski bu təklifi onunla əsaslandırdı ki, həmin maddə "antirus xarakteri" daşıyır. Bəzi deputatlar, o cümlədən "Spravedlivaya Rossiya" Partiyasının nümayəndəsi, etnik erməni Semyon Baqdasarov V.Jirinovskiyə etiraz etdi. S.Baqdasarov RLDP-nin təşəbbüsünü "provokasiya" adlandıraraq, Vladimir Jirinovskinin hərəkətini milli hissləri təhqir edən davranış kimi Dumanın Şurasında müzakirə olunmasını tələb etdi. V.Jirinovski isə buna etiraz edərək dedi: "Söz azadlığı hamı üçündür, təkcə baqdasarovlar, baqdasaryanlar və digərləri üçün yox. Siz Sumqayıtda necə qırğın törətmişdiniz?! Qoy Mironov bir partiyasında kimlərin olduğunu araşdırsın".

Siyasi elmlər doktoru, Beynəlxalq Avrasiya Hərəkatının lideri, Moskva Dövlət Universitetinin Beynəlxalq Münasibətlərin Sosiologiyası kafedrasının müdiri, Rusiyanın tanınmış filosofu **Aleksandr Duqin** 1990-cı ilin Qara Yanvar hadisələrini Vesti.az saytının müxbiri üçün şərh edərək deyib:

"Mən hesab edirəm ki, həmin dövrdə Azərbaycanda baş vermiş faciə təkcə Azərbaycan xalqının yox, bütün Sovet xalqının faciəsidir. Təəssüf ki, Qorbaçovun cinayətkar siyasətinin dəhşətli nəticələri hələ də

özünü göstərir. Qarşıda bizi daha böyük bəlalar, minlərlə insanın qanının axıdılması gözləyir. Bunlar Mixail Qorbaçovun cinayətkar siyasətinin nəticələridir. Qarabağın Azərbaycandan qoparılması bu murdarın siyasətinin və onun islahatlarının nəticəsidir. 1990-cı ilin yanvarında azərbaycanlıların qırılması o vaxtkı Sovet rəhbərliyinin cinayətkar əməllərinin bir elementidir”.

A.Duqin deyir: “Başa düşə bilmirəm, bu murdar, bu alçaq nə üçün indiyə qədər yaşayır? Mən Azərbaycan hökumətinin Qorbaçovu məhkəməyə vermək qərarını tamamilə dəstəkləyirəm. Onu həmin dövrdə törətdiyi bütün cinayətlərə görə, məsuliyyətə cəlb etmək lazımdır. Mən Azərbaycanla birlikdə ədalətə nail olmağa hazıram. Onun qanlı əməlləri pislənməsə, hər bir siyasətçi bu cür hərəkətləri edə bilər”.

A.Duqinin fikrincə, ən dəhşətlisi odur ki, Qorbaçov hələ də cinayətlərinə - Sovet İttifaqı xalqları arasında səpdiyi düşmənçiliyə görə, öz peşmançılığını bildirməyib.

Mənə elə gəlir ki, Sumqayıt hadisələrinin kimlərin vicdanında qaldığını söyləmək üçün bu faktlar da oxuculara yetərlidir.

## AZƏRBAYCAN RƏHBƏRLİYİNİN QƏTİYYƏTSİZLİYİ

Mənim nəzərimdə, dövlət iki amilin mövcudluğu səbəbindən öz-özünə sarsıla bilər – bir cəmiyyətin keyfiyyətsizliyindən, bir də həmin dövlətin rəhbərliyində olanlar tutduqları vəzifənin öhdəsindən gələ bilmədikdə. 1988-ci ilin oktyabr mitinqlərində, bütün fitnəkarlıqlara baxmayaraq, əhalinin ən müxtəlif təbəqələrinin yumruq kimi birləşməsi, vahid mövqedən çıxış etməsi göstərdi ki, Azərbaycan cəmiyyəti keyfiyyət problemi yaşamır və sonrakı uğursuzluqların səbəbini də onda axtarmaq doğru deyil. Əksinə, o dövrdə analoji proseslərin baş verdiyi ölkələrlə müqayisədə Azərbaycan cəmiyyətinin daha enerjili, fəal və mobil olduğu, sadəcə prosesi uğurla yönləndirməyə, ağıllı məcrada inkişaf etdirməyə layiqli siyasi rəhbərliyinin olmadığı aydınca görünür.

Tam məsuliyyətlə iddia edirəm ki, bütövlükdə Qarabağ münaqişəsinin və xüsusən də Sumqayıt hadisələrinin bəlli nəticələrində məhz Azərbaycan rəhbərliyinin qətiyyətsizliyi müstəsna yer tutur. Ona görə də mən bu mövzuya kitabda xüsusi bir bölüm ayırmaq qərarına gəldim. Ümid edirəm ki, bu bölümü oxuyacaq hər bir vəzifə sahibi ölkəsinin taleyüklü məqamlarında tutduğu postun, əyləşdiyi kürsünün məsuliyyətini dərk edərək, bu sayaq situasiyalarda sələflərinin buraxdıqları xətaları təkrarlamayacaq, yanlışlıqlara yol verməyəcəklər. Ümumiyyətlə, təkcə dövlət vəzifəsi tutanlar yox, həm də bu yeri tutmağa iddialılar bir həqiqəti dərk etməlidirlər ki, insan layiq olmadığı kürsüdə oturduqda, o kürsü hansısa zaman kəsiyində onun özünün ən amansız düşməninə, qəniminə, hətta qatilinə çevrilir.

“Qarabağ niyə bu vəziyyətə gəldi?”, “Sumqayıt hadisələri niyə baş verdi?”, “Hadisələrin qarşısı niyə alınmadı?” – şübhəsiz ki, bu kimi sualların cavabı barədə artıq əvvəlki bölümlərlə tanış olan hər kəsdə bir təsəvvür yaranıb. Ancaq eyni zamanda, haqlı olaraq, beyinlərdə yeni suallar da ortaya çıxıb: “Yaxşı, bu hadisələri istəyənlər kənardakılar idi. Bəs özümüzünkülər?! Bəs bu ölkənin vəzifə, səlahiyyət sahibləri?! Onlar niyə baş verənlərin qarşısını almadılar?! Niyə təhlükəni vaxtında – metastaz verməmiş görə bilmədilər?!”

Sözsüz ki, bu çoxsaylı sualların çoxsaylı da cavabları var, ancaq mən heç də bunları dəqiqliyi ilə bilən insan iddiasında deyiləm. “Niyə”lərin bir hissəsinə cavab olaraqsa, ilk öncə, Saveliy Peretsin məlum

povestindən “Azərittifaq”ın (Respublika İstehlak Cəmiyyətləri İttifaqının) sədr müavini Nurvart Vladimirovna Qabrielyanın Qarabağda iqtisadi vəziyyətin Azərbaycanın digər bölgələrindən yaxşı olması barədə əvvəlki bölümlərdə yer almış fikirlərini xatırlatmaqla yanaşı, başqa bir fraqmenti də göstərmək istəyirəm:

“...Dövlət Plan Komitəsi sədrinin Hökumət Evinin beşinci mərtəbəsində yerləşən kabineti idman zalını xatırladırdı. Kabinet sahibinin böyük, palıd ağacından hazırlanmış qara rəngli yazı masası, iclaslar keçirilməsi üçün nəzərdə tutulan, yaşıl mahud parça ilə örtülmüş stol, ağır şkaflar bu məkanı doldura bilmirdi. Yaxşıca təmizlənmiş, bəzi yerlərinə xalça materialından hazırlanmış zolaqlı payəndaz döşənmiş parket döşəmə hətta bu çiskin qış günündə də par-par parıldayırdı.

Şux qamətli, idmançı görkəmli Ayaz Mütəllibov masa arxasından qalxaraq Peretsin əllərini bərk-bərk sıxdı:

- Burada top oynamaq pis olmazdı, eləmi?

O, uzunsov çöhrəsinə nisbətən çox balaca görünən gözlərini kabinetə daxil olmuş şəxsə zilləyib, onu diqqətlə təhlil edirdi.

Perets özünü yığışdırdı.

- Mən məxsusi xahiş etmişdim ki, məhz sən gələsən. Sən materiala baxmısanmı?

- Yox, - deyə Perets cavab verdi. Material Dima Korşdadır. Narahat olmayın, o yaxşı jurnalistdir.

- Yaxşı, ya pis jurnalist olmasının heç bir əhəmiyyəti yoxdur.

- Bəs nəyin əhəmiyyəti var?

- Axı nəyə görə mən? Mən, ümumiyyətlə, bu oyunda iştirak etmək istəmirəm!

- Ayaz Niyazoviç, mən Sizi əvəz edə bilmərəm. Dövlət Plan Komitəsinin sədri mən deyiləm, Sizsiniz, buna görə də iqtisadiyyatın çiçəklənməsi barədə ilk növbədə Siz danışmalısınız...

Mütəllibov stolun yan tərəfindəki qutunu hirslə özünə tərəf çəkdi, oradan kiçik formatlı, qalın cildli bir kitabça çıxartdı. Kitabın göy rəngli kolenkorunda qızılı hərflərlə yazılmışdı: “SSRİ Dövlət Plan Komitəsinin işçilərinin telefonlarının siyahısı”. Mütəllibov barmağını kitabçanın cildinə döyəcləyərək soruşdu:

- Burada nə qədər erməni olduğunu bilirsən? Hər bir şöbədə!

- Bilmirəm.

- Çox nahaq yerə. Əgər respublika nəyəsə malik olmaq istəyirsə, mən onlarla münasibətləri korlamamalıyam.

- Siz nə təklif edirsiniz?

- Bu müsahibə İttifaqın Dövlət Plan Komitəsində bizim mövqelərimizə çox güclü təsir göstərəcəkdir.

- Yaxşı, Ayaz Niyazoviç. Söz verirəm ki, müsahibə maksimum axarlı olacaqdır.

- Elə bilirsən, bu kifayətdir?

- Bir mahnı var, yəqin Siz də bilirsiniz: "Hər şey yaxşıdır, gözəl markiza, bir boş şey müstəsna olmaqla, hər şey yaxşıdır..." Mən hətta o boş şeyi də istisna etməyə çalışacağam. "

Bütün məsuliyyəti ilə deyə bilərəm ki, bu sayaq yanaşma o dövr Azərbaycan rəhbərliyinin mütləq əksəriyyətinin mövqeyini əks etdirirdi: "Təki mən kənarda qalım", "Təki qonşularımızla münasibətimiz korlanmasın", "Təki Moskva qəzəblənməsin", "Moskva hər şeyi həll edəcək"... qısası, "güclü" və "əbədi" Mərkəzə yüksək inam, qonşuların torpaq iddiasında israrlarını görməməzliyə vurmaq, özünü hadisələrdən sığortalamaq və kənarda durmaq cəhdi, ən əsası isə, qətiyyətsizlik!!!

İndi isə məsələnin kökünə gedərək, bir çox hadisələri təfərrüatı ilə izah etmək istəyirəm.

1988-ci ilin may ayında Azərbaycan KP MK-nın Bürosunda Dağlıq Qarabağda baş verənlərlə əlaqədar DQMV-nin birinci katibi, milliyətcə erməni olan Boris Kevorkovun məsələsi müzakirəyə çıxarılır. AR Dövlət Siyasi Partiyalar və İctimai Hərəkatlar Arxivində saxlanılan Azərbaycan KP MK Bürosunun "B.S.Kevorkov yoldaşın və digər rəhbərlərin DQMV-də baş vermiş hadisələrə görə məsuliyyəti haqqında" 17 may 1988-ci il tarixli qərarında məsələ ilə əlaqədar deyilir: "... Müəyyən edilmişdir ki, vilayətdə uzun müddət ərzində qızışdırıcı xarakterli məktublar və vərəqələr, müxtəlif şayiələr və uydurmalar maneəsiz yayılmış, imzalar və pul vəsaitləri toplanmış, Moskvadakı mərkəzi orqanlara nümayəndə qrupları göndərilmişdi. Baş verən hadisələrə çoxsaylı insanlar, o cümlədən kommunistlər cəlb edilmişdi" (AR Dövlət Siyasi Partiyalar və İctimai Hərəkatlar Arxivi. F.S.83, iş 65, vərəq 7). Həmin müzakirələrdə Kevorkov bildirir ki, erməni millətçiləri tələblərini artıq açıq şəkildə təqdim etməyə başlayırlar. Bu cür tələbkarlıq və inadkarlığın səbəbini isə o, ən azı Ermənistan Mərkəzi Komitəsinə bağlı-

lıqla əlaqələndirir. Artıq tələblərin açıq şəkildə olduğunu gördükdə isə o, yuxarı partiya instansiyasına müraciət edir: “Mən bu barədə Azərbaycan KP MK-ya 14.08.1984-cü il və 10.12.1984-cü il tarixli müraciətlərimdə məruzə etməli olmuşam. Mən Z.Balayanın siyasi cəhətdən zərərli olan “Ocaq” kitabının buraxılması barədə Azərbaycan KP MK-ya məlumat vermişəm. Hələ 10.09.1985-ci il tarixli müraciətimdə bildirmişdim ki, yazıçı Xanzadyan məktubla müraciət edərək, DQMV-nin Ermənistan SSR tərkibinə verilməsini tələb etmişdir...”.

Lakin rəsmi xəbərdarlıqlar və müraciətlər Azərbaycan rəhbərliyini narahat etmir. Z.Balayanın “Ocaq” kitabı erməni millətçilərinin bayrağına çevrilir, Azərbaycan ziyalıları, tarixçiləri isə susur. Qeyd edim ki, yalnız Müsavat partiyasının indiki başqanı, o zaman AMEA-da elmi işçi olan İsa Qəmbər əlyazma şəklində buna münasibət bildirir, cavab isə görməməzliyə vurulur.

Daha sonra Kevorkov deyir: “Sovet, partiya və təsərrüfat rəhbərlərinin çoxunun nə üçün onların arasında olması məsələsi məni çox düşündürür, lakin bu suala birmənalı cavab tapa bilmirəm. Görünür, bunun çoxsaylı səbəblərindən biri də o idi ki, onlar bu məsələnin MK-da həll edilmiş olmasına qəti əmin idilər. Bu cür təhrikçiliyi kim etmişdir? Onları kim inandıra bilmişdir? – bu məsələlər sual olaraq qalır”.

Həmin tələblərin, onların yerinə yetiriləcəyinə dair inamın haradan qaynaqlandığını bilmək və bu tərz tələblərin qarşısını almaq isə Azərbaycan rəhbərliyinin birbaşa vəzifəsi idi. Şübhəsiz ki, bu məsələdən onlar Kevorkov qədər narahat olsaydılar, Kevorkovun onlardan tələb etdiyi kimi, onlar da eyni qaydada Moskvadakı rəhbərlikdən tələb etsəydilər, məsələni qızışdıranlar belə həyasızlaşmazdılar.

Həmin müzakirələrdə Kevorkov vilayətdə separatizmin baş qaldırmasının həqiqi səbəblərini üzə çıxarmağa çalışır, lakin onun sözünü nəzakətsiz tərzdə kəsirlər. O, Büro üzvlərinə açıq-aşkar göstərir ki, onlar bu davanın həqiqi təqsirkarlarına münasibətdə riyakar mövqe tuturlar. Nəzərinizə Kevorkovla Vladimir Konovalovun arasındakı qısa dialoqu təqdim etmək istəyirəm. Lakin bundan öncə söyləyim ki, Konovalov o dövr Azərbaycan KP MK-nın ikinci katibi idi. Həmçinin məlumat üçün bildirim ki, əgər Sovet dövrü respublikalarda birinci katib vəzifəsini yerli nümayəndə tuturdusa, ikinci katib mütləq mərkəzin təyin

etdiyi və yerdə mərkəzin “canişini” funksiyasını yerinə yetirən birisi olmalı idi. Konovalov da məhz həmin “canişin”lərdən sayılırdı. Beləliklə:

“B.Kevorkov: - Qiyamçıların liderinin kimliyi artıq məlumdur. Onu cəzalandırmaq lazımdır, axı bizim Cinayət Məcəlləsində milli münasibətlərin qızışdırılmasına görə məsuliyyət haqqında maddə var.

V.İ.Konovalov: - Bu, artıq başqa mövzunun söhbətidir. Bu barədə sonra danışarıq”.

Kevorkov keçmiş SSRİ-nin bütün respublikalarında, o cümlədən Azərbaycan SSR-nin Cinayət Məcəlləsində təsbit edilmiş, Sumqayıt hadisələrində təqsirləndirilənlərin hamısının ittihamında yer alan 67-ci maddədən söhbət açır. Nəzərinizə çatdırım ki, həmin norma bu gün də Rusiya Federasiyasının Cinayət Məcəlləsində milli, irqi və dini düşmənçiliyin qızışdırılmasına görə cəza nəzərdə tutan 282-ci maddə kimi mövcuddur.

Konovalovun mövqeyi aydındır, çünki o, birbaşa mərkəzi təmsil edir və onun maraqlarından çıxış edərək münasibət bildirir. Lakin indi sizin nəzərinizə başqa bir dialoqu çatdırmaq istəyirəm:

“F.Ə.Musayev (Bakı şəhər partiya komitəsinin katibi): - Poqosyan (DQMV Xalq Deputatları Sovetinin sədri) seçilərkən siz onun qatı millətçi olduğunu bilmirdiniz?

B.Kevorkov: - Əgər Kamran Məmmədoviç burada olsaydı, mən onu kimin məsləhət gördüyünü deyərdim” (söhbət Azərbaycan KP MK-nın birinci katibi Kamran Məmməd oğlu Bağırovdan gedir –A.İ.).

Daha sonra, Poqosyan haqqında fikir mübadiləsinin sonunda vilayətin keçmiş partiya rəhbəri bir məsələni də vurğulamaqdan çəkinmir: “Mən o vaxt da demişdim, indi də deyirəm, o, Yerevana oriyentasiya edirdi”.

Dialoqdan görünür ki, Kevorkov Poqosyanın təyinatı üçün Kamran Bağırovun Mərkəzdən göstəriş aldığına və məcbur edildiyinə eyham vurur. Lakin Bağırov nə onda, nə də sonralar tapşırığın kimlər tərəfindən gəldiyini açıq şəkildə söyləmədi. Niyə?! Çünki K. Bağırov da təmsil etdiyi ölkənin maraqlarını yalnız şəxsi maraqlarına təhlükə yarandığı ana qədər müdafiə edirdi. Öz şəxsi marağı və vəzifəsi təhlükə altına düşdükdə isə, ölkənin və millətin maraqları ikinci plana keçirdi. K.Bağırovun “müvəffəqiyyətləri”nə Sumqayıt hadisələri də aiddir. O,

respublikanın rəhbəri kimi hadisələrin qarşısını ala bilmədi, çünki ölkədəki vəziyyətə nəzarət etməyi bacarmırdı, yalnız «siyasətçiliklə» məşğul idi. Sumqayıtdakı hadisələr bitdikdən sonra "özü yıxılmasın" deyə, hər şeydə şəhər rəhbərliyini təqsirləndirməklə, respublikaya daha bir zərbə vurdu. Əgər birisi Aqanbekyanın çıxış etdiyi Parisdən Sumqayıt haqqında görüntü filmi sifariş etmək istəsəydi, onu, bütün texniki və bürokratik əngəllər nəzərə alınmaqla, azı, bir neçə ay keçdikdən sonra ala bilərdi. Lakin artıq hadisələrin sonrakı günü Fransa kanallarında Sumqayıt faciəsi bütün "gözəlliyi ilə" göstərilirdi. Elə təkcə bu, K.Bağırovu və onun ətrafındakıları ayıltmalı idi. Bir də ki, şübhəsiz, onlar başqa mənbələrdən də informasiyalar əldə edirdilər. Ancaq bütün bunlara baxmayaraq, kommunist marağı daha üstün gəldi, o, MK-nın Sumqayıt hadisələrindən dərhal sonra rüsvayçı bürosunu keçirdi və burada təqsiri yerli hakimiyyətin üzərinə qoydu, bununla da baş verənlərin məsuliyyətini respublikanın üzərinə götürdü. Büro üzvlərindən heç biri buna etiraz etmədi. Halbuki, orada başqa, yüngül məsələlərdə vətənpərvərlik mövzusunda pafosla çıxış etməyi sevən, qətiyyət tələb olunduğu yerdə diz çöküb yalvaran "şəxsiyyət"lər var idi. Bu hərəkət o vaxtkı Azərbaycan rəhbərliyinin xalqa qarşı törətdiyi cinayət idi, çünki bundan sonra erməni millətçiləri Sumqayıtla bağlı təşkil etdikləri bütün konfranslarda məhz bu qərarı əllərində bayraq etdilər. Həmin büro iclasında əgər qorxaqlıq nümayiş etdirilməsəydi, vəzifə davasında, Moskvaya yarınmaqda göstərilən yekdillik ümummilli maraqlarda ifadə olunsaydı və qırğınların arxasında Mərkəzin və erməni millətçilərinin durduqları bütün dünyaya car çəkilsəydi, əminəm ki, bu günki problemlər də olmazdı. Onlar isə əksini etdilər! Erməni millətçilərinin yalanlarını bizimkilər rəsmən təsdiqlədilər! Hadisələrin kimlər tərəfindən təşkil edildiyini hamı bilsə də, bircə nəfərin də cürəti çatmadı ki, həmin büro iclasında qalxıb həqiqəti desin, erməni millətçilərini və Qorbaçovu ifşa etsin! Mən bu yerdə qısa müddətdə Azərbaycan Respublikası Prezidentinin vəzifəsini icra etmiş Yaqub Məmmədov tərəfindən çox səmimi və sərrast şəkildə deyilmiş "Biz böyük siyasi oyunların kiçik "peşkaları"yıq" ifadəsinin də təsadüfi olmamasının fərqindəyəm. Bu gün Qarabağ ətrafında baş verənlər o ifadənin təsadüfi olmadığını bir daha təsdiqləyir. Bununla belə, 1988-ci ildə millətin Qarabağ məsələsindəki yekdil fikrini, onda olan ruhu ağıllı rəhbərliklə bir yerdə, hətta böyük

siyasi qüvvələrin belə yenəcəyinə inanmıram. Bir də yenilsə belə, bu gün onlar xalqın yaddaşında repressiya illərində milliliyindən dönməyib, ölümü seçənlərdən də üstün olardılar.

Başqa respublikalarda həmin illər rəhbərlikdə olan şəxslərin əksəriyyəti çoxsaylı maraqlı xatirələr yazıblar. Ancaq heç də təsadüfi deyil ki, o dövr Azərbaycana rəhbərlik edənlər həmin hadisələr haqda ümumiyyətlə, nə danışır, nə də yazırlar. Yazanları da nədən istəsən - futboldan, incəsənətdən, fəlsəfədən və s. – yazsalar da, o vaxt tutduqları vəzifə ilə bağlı iştirakçısı və ya şahidləri olduqları hadisələrə qətiyyən toxunmaq istəmirlər. Çox arzu edərdim ki, o dövrdə Azərbaycanda yüksək vəzifə tutmuş şəxslər həm də xatirələrini qələmə alsınlar. Bu, həm onları yaxından tanımağa, həm də tarixə xidmət edərdi. Əminəm ki, aralarında özünü tutduğu vəzifədə haqqa, ədalətə və ən əsası, xalqa xidmət etmiş sayanlar bundan çəkinməyəcəklər.

İstisna etmirəm ki, kitab işıq üzü görəndən sonra mənə hücum çəkənlər, irad tutanlar da olacaq və hətta bəziləri açıqca deyəcəklər: ”Sən də bunu etməzdin”. Onlar üçün indidən deyirəm: mən Sumqayıt məhkəməsində mövqeyimi bildirmişəm və bu barədə yazmaqdan, danışmaqdan heç vaxt çəkinməmişəm... Bir də həyatımda baş vermiş bəzi məqamları xatırlatmaq istəyirəm. Çünki bir insanın həyatında, yaşam tərzində, bəzən bircə epizod haqqında deyilənlərə ən tutarlı cavab olur:

1976-cı ildə Krasnodar şəhərinin kompressor zavodunda tornaçı işləyirdim. Səhər tezdən işə gələndə, işlədiyim 6-cı sexin 500-ə yaxın işçilərinin bir yerə toplaşıb nəyisə müzakirə etdiklərini gördüm. Bir azdan bəlli oldu ki, onlar o vaxt yenicə rəhmətə getmiş SSRİ müdafiə naziri A.Qreçkonun yerinə əvvəllər SSRİ KP MK-nın katibi işləmiş K.Ustinovun təyin olunmasından narazıdırlar. Onda 18 yaşım var idi və narazılığın səbəbini anlamırdım. Bir azdan sex rəisi gəlib işə başlanmamasına etiraz bildirəndə, mənə tornaçı sənətini oyrətmiş, zavodda böyük nüfuz sahibi olan Mixail Petroviç Kovalenko sərt şəkildə dedi: ” Niyə ömrünü Sovet ordusuna həsr etmiş, Sovet İttifaqı qəhrəmanı, bütün müharibəni vuruşmuş, SSRİ müdafiə naziriliyinin Baş Qərargah rəisi olan Yakubovski dura-dura sizlər “partiya siçovulu” (“partiynuyu krısu”) Ustinovu müdafiə naziri təyin etdiniz?!”.

Sözümün canı odur ki, mən bu mühitdə 3 ilə yaxın işləmişəm və bu mühitin təsiri mənə sonrakı həyatımda çoxlu problemlər yaradıb.

Krasnodar hüquq fakültəsində mənimlə birgə oxuyan və hal-hazırda prokurorluq sistemində çalışanlar o dövrümü, yəqin, yaxşı xatırlayırlar.

Ədalət naminə deyim ki, Azərbaycanda yaşadığım illərdə daim fikirlərinə hörmət etdiyim insanlardan SSRİ dövründə respublikaya rəhbərlik etmiş şəxslər barəsində soruşduqda, hamı K.Bağırovu təmiz, ədalətli, obyetkiv, bir sözlə, yaxşı insan kimi xarakterizə ediblər. Ancaq heç kim onun haqqında "qətiyyətli", "iradəli", "güclü" ifadələrini işlətməyib. Hərçənd ki, böyük siyasətə girişənlərdə məhz bu keyfiyyətlər – xarakter həlledicidir. Bəla buradadır ki, bizlər əsasən, ancaq "yaxşı insan" obrazını qeyd edir və sevirik. Hətta Azərbaycanda geniş yayılmış belə cümləyə də tez-tez rast gəlirik: "Heyf ki, "yaxşı oğlan" vəzifəsi yoxdur, olsaydı, filankəsi ora təyin edərdik". Ancaq nədənsə, heç kim o həqiqətə diqqət yetirmir ki, Azərbaycanın ərazi bütövlüyü ilə bağlı bütün bəlalar məhz həmin "yaxşı oğlanlar" dövründə baş verib...

Bir daha xatırladıram ki, Sumqayıtdakı hadisələr zamanı çəkilmiş sənədli kadrlar və Azərbaycan KP MK Bürosunun çap edilmiş qərarı ermənilərin əlində çox güclü təşviqat materialına - silaha çevrildi.

Baxın, görün, Azərbaycan KP MK katibi H. Həsənov 1990-cı il 8 yanvarda Bakıda partiya-təsərrüfat aktivində nə deyir: "Bəs biz - Azərbaycan KP MK, Azərbaycan Respublikasının Ali Soveti – buna qarşı nə etdik? Ürək ağrısı ilə, özünütənqidlə, bir daha özünütənqidlə və bir daha özünütənqidlə qeyd etməliyəm ki, biz buna qarşı gözləmə siyasətini, vaxtuzatmanı, respublikadaxili dinməzlik siyasətini, ittifaq mətbuatının şişirdilmiş aşkarlığını, qarşıdurmanın özünün inkarını, güzəştlər siyasətini, valyuntarist uydurmaları, əsaslandırılmamış razılaşma siyasətini, filantropik birtərəfli barışığı qoyduq."

"Xalq tərəfindən həm Mərkəzə, həm də bizə inamsızlıq bir-birlərinə sarınıb vəhdət təşkil etdi. Bizim hər birimizə - vəzifəli şəxsə, Mərkəzi razı salmağı xalqın hörmətindən üstün tutan adam kimi baxırlar. Bizi - vəzifəli şəxsi, tutduğu vəzifədə möhkəmlənməyi xalqın mənafeyinin müdafiəsindən üstün tutan şəxs kimi görürlər. Bizi, sözün tam mənasında, manqurt adlandırırlar"...

İfadələrə fikir verin - "təslimçilik, uydurma sülhpərvərlik və arxayınçılıq", "güzəştlər, volyuntarist uydurmalar, əsaslandırılmamış razılaşma, filantropik birtərəfli barışıq" siyasəti... Nə qədər pafoslu görünsə də, mən bütün ağlımla o zamankı siyasəti bu qədər dəqiq ifadə edə bilmə-

rəm! Sadəcə, bir həqiqəti təkrarlamaq yerinə düşər: ”Xalq heç vaxt səhv etmir”.

Bu gün artıq Sumqayıt hadisələrinin üstündən 22 ildən çox vaxt keçir. Lakin o hadisələr barəsində hələ çox mətləblər bu gün aydınlaşmaqda davam edir. Həqiqətlər bu və ya digər şəraitdən qaynaqlanan zərurətdən ortaya çıxır. Məhz yeni ortaya çıxmış həqiqətlərdən birindən indi bəhs etmək istəyirəm:

ANS telekanalından Sevinc Osmanqızı Sumqayıt hadisələrinin ildönümü ilə əlaqədar hazırladığı verilişə həmin prosesdə iştirak etmiş prokuror kimi, məni də dəvət etdi. Mən o verilişdə məmnuniyyətlə çıxış etdim, çünki artıq baş verənləri xatirələrə və yaddaşa əsaslanaraq yox, əlimdəki ittiham aktına və o dövrdə apardığım qeydlərimə əsaslanaraq, sübut etmək imkanı yaranmışdı. Veriliş çox böyük marağa və əks-sədaya səbəb oldu. Mənə çox sayda təəccüb dolu zənglər gəldi. Lakin heç kim və heç bir mətbu orqan mənim söylədiklərimə açıq münasibət və dəstəyini bildirmədi. Hərçənd ki, bundan əvvəllər də dəfələrlə öz təşəbbüsümlə müxtəlif mətbu orqanlarda, o cümlədən “Yeni Müsavat” qəzetində bu hadisələrlə bağlı böyük müsahibələrim dərc olunmuşdu.

2010-cu il mart ayının 6-da şəxsiyyətinə hörmət bəslədiyim tarixçi alim Cəmil Həsənli zəng vuraraq bir tanışının üzləşdiyi problemlə bağlı mənə müraciət etmək istəyində olduğunu bildirdi və onu qəbul etməyimi xahiş etdi. Həmin şəxs yanıma gəldi və ona problemi ilə bağlı hüquqi məsləhətlərimi verdim. Daha sonra o, “Vətəndaşlıq haqqında” Azərbaycan Respublikasınının Qanununu istədi. Əməkdaşlarıma həmin qanunun surətinin bu şəxsə verilməsini tapşırdım. O, yanımda gözlədiyi zaman Müsavat partiyasının başqanı İsa Qəmbər mənə telefon açdı və bildirdi ki, “Yeni Müsavat” qəzetindəki müsahibəmi oxuyub və buna görə təşəkkür edir. Daha sonra əlavə etdi ki, mövzunun çox əhəmiyyətli olduğunu bildiyindən, həmin gün “Mediaforum” saytında müsahibəmə müsbət münasibətini bildirib və həm ictimaiyyətin, həm də dövlətin bu məsələyə diqqət yetirməsini xahiş edib. Bu mövzuda aramızda 3-5 dəqiqəlik bir söhbət oldu. Aydındır ki, bu söhbət əsnasında mən Sumqayıt hadisələrinin, Qriqoryanın adını çəkirdim. Söhbət yekunlaşan kimi, yanımdakı şəxs mənə həmin prosesi çox yaxşı bildiyini söylədi. Mən soruşanda ki, haradan bilir, o, həmin dövr Mərkəzi Komitədə məsul vəzifədə işlədiyini və Büro üzvü olduğunu dedi (adını onun

xahişinə əsasən çəkmirəm-A.İ.) və hadisələrin gedişi haqda təfsilatı ilə hər şeyi danışdı. Onun ehtiyatlandığını nəzərə alaraq, söylədiklərindən yalnız cüzi bir hissəni diqqətinizə çatdıracağam.

Sabiq Büro üzvünün söylədiklərindən bəlli oldu ki, 1988-ci ilin fevral ayında o, Ukraynanın Yalta şəhərində istirahətdəymiş. Lakin gözlənilmədən 12 fevral 1988-ci il tarixdə həmin dövr Mərkəzi Komitənin birinci katibi Kamran Bağırov ona teleqram vuraraq, təcili Bakıya qayıtmasını tələb edib. Büro üzvü Bakıya qayıtdığı ilk gündən DTK, Daxili İşlər Nazirliyi və digər dövlət strukturlarından Respublikada baş verən hadisələr, o cümlədən Sumqayıt barədə məlumatlar alıb. Həmin dövrdə Stepanakertdə gedən mitinqlər artıq sakitləşməyə doğru istiqamətlənirmiş. Lakin mitinqləri canlandırmaq üçün Ermənistandan minə yaxın gənci avtobuslarla Stepanakertə göndərirlər. Bu xəbəri alan kimi, o, Laçın rayonunun birinci katibi Yalçın Məmmədova zəng edir və avtobusların oradan buraxılmamasını bildirir. Bundan 4-5 saat sonra isə Məmmədov hökumət telefonu ilə zəng edərək, Daxili İşlər Nazirinin müavinlərinin onunla danışmaq istədiyini bildirir.

Qonağımın dediyinə görə, həmin dövr arxiv sənədləri və yaxud mətbuat araşdırılsa məlum olacaq ki, SSRİ Daxili İşlər nazirinin bir müavini daim Azərbaycanda Gəncədə, bir müavini isə Ermənistanda - ya Yerevanda, ya da Dağlıq Qarabağda - Stepanakertdə oturexcludeurmuş.

Sabiq Büro üzvünün sözlərinə görə, Məmmədov zəng vuraraq, SSRİ Daxili İşlər nazirinin hər iki müavininin yanında olduqlarını və onunla danışmaq istədiklərini söyləyir. Daxili İşlər nazirinin Azərbaycan üzrə məsul olan müavini telefonda çox sərt şəkildə danışır və ona İttifaq əhəmiyyətli yolu bağlamağa ixtiyarının olmadığını bildirir. Cavabında isə Büro üzvü Stepanakertə yollanan min nəfər gəncin orada qan tökəcəklərini, onun bunu istəmədiyini və məhz bu səbəbdən yolu bağlatdığını söyləyir.

Qonağım Sumqayıtdan əvvəl, eyni hadisələrin Gəncədə, Naxçıvanda təşkil edilə biləcəyi haqda o vaxtı bütün rəhbər şəxslərin məlumatlı olduqlarını və cəhdlərin qarşısını aldıqlarını da vurğuladı.

Sabiq Büro üzvünün sözlərindən belə anlaşıldı ki, hələ fevral ayının 13-ü axşam radələrində "bequnok" ("xüsusi arayış") vasitəsilə Mərkəzi Komitənin birinci katibi Kamran Bağırov və Büronun bütün üzvləri Azərbaycanda qan tökülməsinin planlaşdırıldığı barədə məlu-

matlandırılıblar. Həmin "bequnok" Ümumi şöbəyə verilir, Ümumi şöbə də bütün Büro üzvlərini məlumatlandırırmış. Artıq 14-ü, 15-i, 16-sı Büro üzvlərinə və Kamran Bağırova hər gün "bequnok" adlandırılan xüsusi arayış çatdırılırmış.

Qonağım iddia etdi ki, o dövr Azərbaycanda məlum hadisələrin qarşısının alınmamasının bir səbəbi də Mərkəzi Komitənin birinci Katibi Kamran Bağırovun xəstəliyi ilə əlaqədar ölkəni idarə edə bilməməsi və bir neçə Büro üzvünə Mərkəzdən ölkədəki xaos vasitəsilə Kamran Bağırovu "devirib", onun yerinə birinci katib olacaqları vədi verilməsiydi.

Maraqlıdır ki, həmsöhbətimin mənə danışdıqlarını o dövrkü hadisələrin mərkəzində olmuş digər şəxslər də təsdiqləyirlər. Məsələn, çoxları yaxşı bilir ki, erməni millətçilərinin Azərbaycan ərazisini parçalamağa hazırlaşanda Mərkəzi Komitədə bəziləri Qromıko, Liqaçov, Razumovski, Laptev və başqaları vasitəsilə respublikanın birinci katibi olmağa hazırlaşırdılar. Ümid edirəm ki, bu kitab işıq üzü görəndən sonra Azərbaycan SSR KP MK-nin o dövrkü arxivləri açılacaq, hadisələrdə kimin hansı mövqe tutduğu da bilinəcək və qeyd olunanlar təfsilatı ilə cəmiyyətə çatdırılacaq.

Ola bilsin ki, bəziləri əsl vətəndaş mövqeyi sərgiləyiblər. Ancaq təəssüf ki, mən sənədlərdə belə bir mövqe ilə rastlaşmamışam.

İndi isə SSRİ KP MK Siyasi Bürosunun 29 fevral 1988-ci il tarixli iclasından bir məqamı nəzərinizə çatdırmaq istəyirəm:

"M.Qorbaçov:

- Bu gün Aleksandr Vladimiroviç mənə danışdı. Stepanakertdə kabab bişirirlər, orada tonqallar yanır. Ümumiyyətlə, qayda pozuntusu yoxdur, ancaq insanlar meydandan getmir. Orada min beş yüz, yaxud min insan var.

(SSRİ Daxili İşlər naziri) Vlasov:

- Mindən artıqdır.

Qorbaçov:

- Mindən artıq. Bax belə, onlar orada saxlanılırlar ki, "tonqal sönməsin". Burada açıq aşkar Ermənistandan gələn əlaqə və təlimat izi görünür.

(SSRİ Dövlət Təhlükəsizlik Komitəsinin sədri) Çebrikov:

- Yerevandan Stepanakertdə plenum keçirilməsi vəzifəsi qoyulur.

Göstəriş belədir: Yerevanda plenum keçirilib, Stepanakertdə plenum olmayıb. Burada ideya var – Stepanakertdə plenum olmayınca, dağılışmayın. Ona görə onlar hələ orada 10-gün, 15 gün duracaqlar. Elə etmək lazımdır ki, Stepanakertdə meydanda insanlar olmasın. Hər şey təşkil olunub. Kolxozlardan ərzaq gətirirlər, yeməkxanalarda meydanlarda olanlar üçün yemək bişirirlər. Bu insanların gecələmək yerləri var və vaxtaşırı bir-birini əvəz edirlər.

Qorbaçov:

- Viktor Mixayloviç, əgər insanlar qayda qanunu pozmurlarsa, onlarla siyasi cəhətdən işləmək lazımdır, hərbiçilərlə dağıtmaq lazım deyil.

Çebrikov:

- Dağıtmaq yox, bir balaca mühasirəyə almaq lazımdır.

Qorbaçov:

- Əgər insanlar özünü rahat aparırlarsa, onlarla axıra qədər siyasi cəhətdən işləmək lazımdır. Nəyə görə biz qoşun yeritməliyik?".

Buradan aydın olur ki, Qorbaçov Stepanakertdəki hadisələrin Yerevan tərəfindən təşkil olunduğunu gözəl bilir. Ancaq özü dediyi kimi, "tonqalın sönməsini" istəmir. Yerevanda bu hadisələri törədənləri nəinki xəbərdar, hətta qəbul edir, Qarabağın "Arçax" olduğunu bildirir. Qorbaçov üçün SSRİ xalqlarına və dünyaya göstərmək lazım idi ki, ermənilər Qarabağa görə gecə-gündüz yatmır, azərbaycanlılar isə bu məsələ ilə maraqlanmırlar və Qarabağ Ermənistana verilməlidir.

Əminəm ki, əgər 1988-ci ilin Meydan Hərakatı olmasaydı, N.Xruşov 1954-cü ildə SSRİ KP MK-nin Siyasi Bürosunun bir qərarı ilə Krımı Rusiyadan alıb Ukraynaya verdiyi kimi, Qorbaçov da elə bir qərarla Qarabağı Ermənistana verəcəkdi.

Təəssüf ki, bütün bunları görə-görə bizim rəhbərlik əhalinin etiraz səsini boğmağa çalışırdı. Həm özlərini, həm də əhalini inandırmaq istəyirdilər ki, Qorbaçov Qarabağ məsələsini ədalətli həll edəcək. Buna nə ad vermək olar, mən bilmirəm. Ancaq bir şeyi deyə bilərəm ki, ömrünün ahıl yaşında Lefortova türməsinə düşmüş Yazov, Kryuçkov, Varennikov kimi marşal və generallar bunu qazanmışdılar. Əgər, ən azı bizlərin gördüyümüz bu Büro iclasında Qorbaçovun onları dolamalarını başa düşməyiblərsə, onların yeri elə Lefortova türməsiymiş.

Bir də mənim üçün çox maraqlıdır, doğrudanmı böyük siyasətdə

olan Azərbaycan SSR-nin rəhbərləri SSRİ-nin dağılmasını görmürdülər? Əvvəllər qeyd etdiyim SSRİ Dövlət Plan komitəsinin idarə rəisinin çıxışından sonra bəzi məhkəmə sədrləri ilə aramızdakı müzakirələrdə SSRİ-nin çökəcəyi fikri səslənirdi. Sumqayıt, Tbilisi və SSRİ-nin başqa bölgələrində baş verənlərdən sonra mənim Rusiyada təmasda olduğum şəxslərin, demək olar ki, əksəriyyətində artıq bu fikir qərarlaşmışdı. Ancaq 1990-cı ilin Bakı qırğınlarından sonra da Azərbaycan rəhbərliyi Qorbaçovdan qorxurdu. O Qorbaçovdan ki, cangüdəni A.Korjakov tərəfindən yazılmış və 1997-ci ildə işıq üzü görən “Boris Yeltsin: Sübhdən günbatanadək” kitabında kimliyi çox gözəl təsvir edilmiş B.Yeltsin belə 300 milyonluq Sovet xalqının gözü qarşısında onu təhqir etməkdən çəkinmirdi.

1991-ci ilin avqust hadisələrində mən Kislovodsk şəhərində məzuniyyətdə idim. Artıq hamı SSRİ-nin çökməsindən fakt kimi danışırdı. Bakıya qayıtdıqdan sonra bizim rəhbərliyin hərəkəti məndə ikrah hissi doğururdu. Elə rəhbərliyin bu sayaq qorxaq hərəkətləri R.Qazıyev kimilərinin meydana çıxmasına şərait yaratdı.

Minlərlə igid Azərbaycan oğulları isə SSRİ xarabalıqları altında Vətən torpağı uğrunda qeyri-bərabər, hiyləgər savaşda can verir, qurban gedirdilər.

Elə indi də davam edən müzakirələrdə SSRİ-nin dağılması, respublikaların müstəqillik qazanması səbəbləri barədə yekdil fikir yoxdur və mən də bu mövzuya nöqtə qoyacaq cavab vermək iddiasında deyiləm. Ancaq mənim qənaətlərim budur ki, bəziləri bunun Qorbaçovun istəyi ilə həyata keçdiyini bildirsələr də və hətta Qorbaçovun özü də Rusiyadan kənarda verdiyi müsahibələrində bu prosesdə özünün xüsusi rolunu qabartsa da, bu, heç də belə deyil! Bəli, SSRİ-nin dağılması prosesində onun rolu olub - ancaq öz istəyi, ağlı, düşünülmüş fəaliyyəti ilə deyil, axmaqlığı, bacarıqsızlığı, maymaqlığı ilə! Onun SSRİ adlı ölkəni necə qorumağa çalışdığı Mərkəzi televiziya ilə yayımlanan və İttifaqın respublika rəhbərlərinin, o cümlədən A.Mütəllibovun da iştirak etdiyi tədbirdə - Moskva ətrafındakı Novo-Oqaryova prosesində Konfederasiya yaratmaq barədə müqaviləyə imza atmaq yalvarışlarından da görünürdü.

SSRİ tarixən məhvə məhkum idi. Dərin analiz etmədən, qısaca,

bəzi faktları sadalayım: SSRİ-nin dağılmasını 1970-ci illərdən başlayan iqtisadi tənəzzül labüd etdi. Çünki SSRİ-nin əsas qazancı xaricə neft, öz əhalisinə isə spirtli içki satışından idi. 80-ci illərin əvvəllərindən neftin qiyməti sürətlə ucuzlaşaraq 13 ABŞ dollarına düşdü, eyni zamanda, Qorbaçovun axmaq göstərişi ilə üzüm plantasiyaları məhv olundu, "suxoy zakon" elan edildi, alkaqol satışı kəskin azaldıldı. Onsuz da can üstündə olan büdcə ölümcül vəziyyətə düşdü. Artıq ərzaq qıtlığı hamıya toxundu. Bütün SSRİ əhalisində kəskin narazılıq yarandı. Mən bu narazılığı Rusiyada hakimlər, prokurorlar və digər vəzifə sahiblərində şəxsən görürdüm. Əgər bura Qərb ekspertlərinin müəyyən etdiyi SSRİ-nin müxtəlif respublikaları və millətləri arasındakı sərhədləri mübahisəli 79 qaynar nöqtənin olması faktını da əlavə etsək, narazılığın miqyası daha aydın görünər. "Aşkarlıq dövrü" bu prosesi daha da sürətləndirdi. Deyə bilərlər ki, "aşkarlıq" Qorbaçovun xidmətidir. Xeyr, zənnimcə, "aşkarlıq" bu prosesi bir az uzatdı. Əgər Qorbaçov, deyildiyi kimi, ağıllı rəhbər olsaydı, SSRİ-nin dağılma prosesinə sivil xarakter verə və bu prosesin gah Azərbaycana, gah Gürcüstana, gah Pribaltikaya tanklar yeritməklə müşayiət olunmasına imkan yaratmazdı. Qorbaçov isə cürbəcür axmaq, populist, özünün də başa düşmədiyi ideyaları ilə çalışırdı ki, bu proseslərdə tarixi şəxsiyyət adını, müxtəlif mükafatları alsın. Artıq bu gün SSRİ-nin dağılmasında Sumqayıt hadisələrinin, Qarabağ qarşıdurmasının əsas katalizator rol oynaması şəxsən məndə qətiyyən şübhə doğurmur.

Bu bölümü ayrıca qeyd etməkdə məqsəd o dövr hakimiyyətdə olanların məsuliyyətə cəlb olunması məsələsi deyil. Əminəm ki, onlar da Azərbaycanın maraqları üçün müəyyən işlər görüblər. Bu gün elə bir dövrdə yaşayırıq ki, bəzi məsələlərdə "susmaq qızıldır" prinsipi çox zərərlidir və mən deyərdim ki, hətta indi «susmaq millətə xəyanətdir». Bu gün Ermənistan məmurlarının, ziyalılarının saxtakarlıqla dolu xatirələri, yazıları gələcəkdə törəmələri tərəfindən tarixi arxiv materialları kimi bolluca istifadə ediləcəkdir. Bizim isə keçmiş "yoldaş", indi isə «cənab» olan kəslərimiz hansı mövzuda istəsən yazırlar, Qarabağ probleminə gəldikdə isə susmağa üstünlük verir, bununla da erməni millətçilərinin dəyirmanına su tökürlər. Bəziləri isə "digər respublikalarda xalq hərakatı olmadı, ancaq onlar da müstəqil dövlət oldular" deməklə, hamımızın qürur mənbəyinə çevrilən, 1988-ci ildə Qarabağın

Qorbaçov tərəfindən bir qərarla Ermənistana verilməsinin qarşısını alan Xalq Hərəkatını kölgə altına almaq istəyirlər. Bu isə artıq bağışlanmazdır. Ümid edirəm ki, gələcəkdə Qarabağ tarixini və hadisələri araşdıracaq gənc nəsil SSRİ rəhbərliyinin bu münaqişə ərəfəsində xalqımızın başına gətirdiyi müsibətləri başqalarının dilindən yox, məhz o dövrdə Azərbaycan rəhbərliyində təmsil olunmuş şəxslərin xatirələrində görəcəklər.

## QORBAÇOV VƏ ERMƏNİLİK

Kitabı bu bölümlə yekunlaşdırmaq qərarına gəldim. Hesab edirəm ki, bu bölüm problemin yerli, lokal deyil, daha qlobal xarakter daşıdığını oxuculara aydın şəkildə izah edəcək. Məncə, kitabı oxuyacaq istənilən şəxs görəcək ki, Azərbaycan Respublikası ideya və siyasi cəhətdən kifayət qədər hazırlıqlı və təşkilatlanmış, həm keçmiş SSRİ məkanında, həm də müasir dünyamızın aparıcı dövlətlərində - xüsusilə ABŞ və Avropada geniş maddi, mənəvi və siyasi dəstəyə malik ***erməniliklə*** üzbəüz qalmışdır. Bəli, məhz erməniliklə!

Nədir bu anlayış, bu termin? Bu anlayışın məğzində, mahiyyətində, ümumiyyətlə varlığında nə dayanır?

Dağlıq Qarabağ münaqişəsində iştirakçı tərəfləri xarakterizə edən hər kəs bu anlayışın, terminin Qarabağ uğrunda mübarizədə Azərbaycana savaş açan etnik-siyasi qüvvəyə şamil olunduğunu yaxşı bilir. Ancaq bəlkə də çoxları bilmir ki, **ermənilik bir sistem, ideoloji birlik və bağlılıqdır**. Nə "Krunk", nə də Erməni Ümumilli Hərakatı (EÜH) adlandırılan qurumlar müstəqil, təcrid olunmuş şəkildə fəaliyyət göstərən və ani situasiyada ortaya çıxan təşkilatlar olmayıblar. Münaqişənin başlama dövrünə – hələ SSRİ-nin mövcud olduğu vaxtlara qayıdanda, görürük ki, bu qurumlar öz fəaliyyətlərini koordinasiya etməklə yanaşı, ümumi məqsəd və məram ətrafında birləşiblər və bilavasitə Sov.İKP MK səviyyəsində (Brejnev dövründə şöbə müdiri işləyən, o vaxt partiya olimpini fəth etməyə çox yaxınlaşaraq, Sov.İKP MK Baş katibinin köməkçisi olan K.Şahnazarov, Sov.İKP MK-da digər şöbə müdiri K.Brutens, qocaman aparat işçisi, rəhbər dairələrə yaxınlığıyla seçilən L.Onikov kimi şəxslər timsalında – A.İ.) güclü dəstəyə, himayəyə malik olublar.

Sov.İKP MK-nın, demək olar ki, bütün şöbələrində ermənilərin öz adamları vardı. Hətta bu haqda "Azərbaycan. İkinci Respublikanın aqibəti" adlı tədqiqatın müəllifi R.Ağayev hesablama apararaq yazır ki, Sov.İKP MK-da ermənilərin sayı 20 nəfərə çatdığı halda, orada cəmisi bircə nəfər azərbaycanlı olub - ideoloji şöbənin təlimatçısı R. Hüseynov.

Eyni zamanda, SSRİ Nazirlər Soveti aparatında, İttifaq nazirliklərində də ermənilərdən ibarət çox güclü qruplaşmalar yaranmışdı.

Yəni, Azərbaycandan və digər müsəlman respublikalarından

fərqli olaraq, Ermənistan bu baxımdan, İttifaqın yuxarı dairələrində həmişə güclü mövqeyə malik olub. Durğunluq illərində, xüsusən yəhudi millətinə mənsub olanlar məqsədyönlü şəkildə sıxışdırıldığı, köçüb İsrailə, Qərb ölkələrinə getdikləri vaxt ermənilərin Moskvaya - partiya-dövlət strukturlarına sürətli axını başlamışdı. Rusiyada çoxşaxəli və qədim əlaqələrə malik zirək ermənilər idarəetmə orqanlarında, elmi müəssisələrdə (SSRİ Elmlər Akademiyasının akademikləri və müxbir üzvləri arasında onlarla erməni vardı – A.İ.), mədəniyyət müəssisələrində və ən vacibi – kütləvi informasiya vasitələrində yaranmış boşluğu hiss olunmadan doldururdular. SİTA-da, «Xəbərlər» Mətbuat Agentliyində (XMA), Ümumittifaq Radio və Televiziyasında onların mövqeləri xeyli güclənmiş, uzun müddət bu qurumlarda rəhbər vəzifələr tutmuşdular. Məsələn, onların ən məşhurlarından biri XMA-nın sədr müavini Karen Xaçaturyan idi.

Maraqlıdır ki, rusların tarixən erməniləri geniş miqyasda diplomatik işə cəlb etmə prosesi Sovet dövründə daha da genişlənmiş və ənənə halını almışdı. SSRİ-nin erməni mənşəli səfirlərinin sayı da müxtəlif illərdə 15 nəfərdən artıq olmuşdu. Aşağı rütbəli diplomatik işçilər arasında isə bu rəqəm nəzərəçarpacaq dərəcədə çoxluq təşkil edirdi. SSRİ-nin Azərbaycan mənşəli yeganə səfiri isə Ə.Vəzirov idi.

Bu məqamda, hər hansı şərh vermədən, milli sərvətimiz sayılan professorlarımızdan Şirməmməd Hüseynovun 23 aprel 2010-cu il tarixdə “Azərbaycan” qəzetində təkrar çap etdirdiyi və vaxtilə Tiflisdə gürcülərin rus dilində buraxdıqları gündəlik ədəbi-siyasi "Vozrojdenie" qəzetinin (redaktor-naşiri: E.D.Qordeladze) 1918-ci ilin yanvar sayında getmiş "Ermənilərin yeni fəlakətli xətası" sərlövhəli məqalədən bir hissəni nəzərinizə çatdırmaq istəyirəm.

"Vozrojdenie" qəzeti “Ermənilərin yeni fəlakətli xətası” başlıqlı məqalədə yazır (Bu məqalə «Açıq söz» qəzetinin 1918-ci ilin 7 yanvarında, 648-ci sayında da tərcümə edilərək, çap olunub və o dövrkü üslüb saxlanılıb – A.İ.):

*” Avropa müharibəsi ibtidasında hələ Rusiya dövləti Türkiyə ilə hali-hərbidə olmayan zaman, erməni millətinin başçıları bir fəlakətli xəta işlədilər. Qraf Vorontsov-Daşkov ilə vəzir Sazanovun şirin nitqlərinə və vədlərinə aldanaraq, onlar Türkiyəyə elani-hərb etdilər və erməni könüllüləri Türkiyə torpağına soxuldular.*

*O vaxt biz bir sıra məqalələrmizdə erməniləri belə xətalı iqdamətdən sakındırmaya çalışaraq, xırda bir millət üçün böylə təcavüzkaranə hərəkətin fəlakətli olduğunu isbat, bir qədər durbin olmalarını tövsiyə etdik və milli təəssüb alovlandıran başçılar əleyhinə çıxdıq. Fəqət tövsiyələrimiz hədər olub daha da bizdən acıqlandılar və erməni qəzetlərində üzümüzə "haya gerel" («erməni yeyən») ləqəbi qazandıq. Bizim ən müqəddəs hissimiz təhqir edildi. Zira səmimiyyətimizə ədavət təlqin edildi və xeyirxahlığımız bütün məzlum erməni milləti haqqında provokasiya kibi göstərildi...*

*Lehistan, Litva, Belarusiya dəxi dava meydanı olaraq Qafqasiya səfəri kibi degil, daha müdhiş vuruşmalar oldu. Fəqət Lehistan, Litva və Belarusiya səlamət qaldılar. Bəs nə üçün Ermənistan məhv oldu?*

*Hamının etiraf etdiyi üzrə, dava edən millətlərdən heç birisi türk əsgərləri qədər alicənabanə dava etmiyor. Bununla bərabər, Ermənistan məhv oldusa, səbəbi budur ki, süni surətdə gilyotin («boyun vuran makina») altına salınmışdı. Polyaklar nə Rusiyaya xəyanət etdilər, nə Almaniyaya. Onlar heç dövlətə elani-hərb etməyərək gücsüzlügünü etirafla mümkün olan qədər bitərəf qaldılar. Fəqət kiçik Ermənistan təcavüzkaranə siyasət yürüdərək hərbi bir dövlət kimi müttəfiqlər sırasına girdi. Bizə məlumdur ki, Türkiyə erməniləri öz vətənləri olan Türkiyəyə əsla xəyanət etməyib bitərəf qalmaq istiyorlardı.*

***Fəqət Rusiya erməniləri onların əvəzinə dövlətlərinə xəyanətə qol çəkməyə tələsdilər (seçdirmə bizimdir - A.İ.)*** *Belə ağılsız siyasətin nə qədər müdhiş nəticə verdigini müfəssəl yazmayacağız. Fəqət bu fəlakətdən dəxi onlar ibrət almadılar.*

*İndi biz yenidən səsimizi ucaltmalıyız, biz kənardan daha yaxşı görüyoruz, indi erməni başçıları yeni bir xəta işləyirlər.*

*Rusiya Türkiyə ilə barışır. Rus qoşunları cəbhədən gedirlər. Ümum-Qafqasiya millətləri müharibənin qurtarmasını arzu ediyorlar. Ermənilər isə yenə müstəqilən Türkiyə ilə müharibəni davam etdirmək istiyorlar. Onlar səfərbərlik elan etmişlər. Rus qoşunu tərəfindən tərk edilmiş Türkiyə cəbhəsini müdafiəyə hazırlaşıyorlar. Bitmək üzrə olan Rusiya-Türkiyə müharibəsi əvəzinə Türkiyə-erməni müharibəsi başlanır. Vorontsovlar ilə Sazanovlar rolunu indi də İngiltərə diplomatları ifa ediyor və ermənilər yeni macəraçılıq yoluna düşüyorlar!*

*Səmimi olalım!*

*Ermənilər nəyə xatircəm ola bilərlər? İngilislərin kömək verməlləri xəyaldır. Onlar öz mənafeləri üçün ermənilərdən istifadə edəcək və özləri üçün əlverişli dəqiqə hal edincə, erməniləri öz müqəddəratlarına buraxacaqlardır. Ola bilər ki, ermənilər öz qoşunlarının köməginə ümid bağlıyorlar. Hazırda Rusiya hökuməti başında duran Lenin erməniləri az düşünür. Rus soldatları heç vaxt Ermənistan, yaxud Rusiyanın sair bir qismi üçün müharibəni təzədən başlamaq istəməyəcəklərdir.*

*Türkiyə ilə mübarizədə Qafqasiya türk, dağıstanlı və gürcülərindən də kömək gözləmək ağılsızlıqdır. Səbəbləri də çoxdur və məlumdur. Gürcü demokratiyası müharibənin davamını istəmiyor. Heç dürlü macəraçılığa getməz. Bilaxassə ki, ermənilər Gürcüstanın xüsusi əyaləti olan ən yaxşı torpaqlarını əllərinə almağa çalışır. Gürcülər həqqində əski siyasətlərini davam etdiriyor və etirasiyyati-milliyyəni alovlandırıyorlar.*

*Aşkardır ki, bu yeni müharibədə ermənilər tək qalacaqlar və ancaq öz qüvvələrinə xatircəm olmalıdırlar. Bu qüvvənin isə azlığı və müharibəyə hazır olmadığı ermənilərin özlərinə bizdən yaxşı məlumdur.*

*Vaxtdır ki, öz millətlərinin müqəddəratına daha ayıq gözlə baxaraq onu qabaqcadan itlafa məruz olan məqsədsiz fəlakətlərə salmasınlar. Vəqtdir ki, hərbcuyanə siyasətin yaxşı nəticə verməyəcəgi və hamı ilə dava etmək mümkün olmadığı dərk edilsin. Böylə siyasət erməniləri dəhşətli bir hala saldı, Ermənistanı məhv etdi. İndi isə ermənilərin istiqbalını da puç edə bilər. Böylə müdhiş bir vəziyyətdən çıxmaq üçün ancaq bir çarə var:*

*Ümumi siyasət kursunu əsasından dəyişmək, hərbcuyanəliyi sülhcuyanə siyasətə mübəddəl etmək və hər şeydən qabaq, yaxın qonşu millətlərlə əl-ələ getmək lazımdır.*

*Bu yazını oxumaq ağırdır. Fəqət mərdanəliklə acı həqiqəti dinləməlidir."*

**Hesab edirəm ki, həqiqətən də heç bir şərhə ehtiyac yoxdur...**

ABŞ, Fransa, İngiltərə və digərlərində, o cümlədən Türkiyə, İran, Livan və başqa müsəlman ölkələrində ermənilərin sayı və təsiri barədə ictimaiyyəti kifayət qədər məlumatlandıracaq ədəbiyyat mövcuddur.

Münaqişənin bu aspekti üzərində bizim belə ətraflı dayanmağımız isə səbəbsiz deyil. Bəzi şərhçilərin dediklərindən fərqli olaraq, hadisələrin həqiqəti belədir: Azərbaycanın düşməni nə «Krunk», nə EÜMH, nə Ermənistan SSR, nə də DQMV-dir, əsl düşmən bütün bun-

ları bir çətir altında birləşdirən ***ermənilikdir!*** Bəzi müəlliflər, o cümlədən elə ermənilərin özləri də beynəlxalq miqyasda yaxşı təşkilatlanmış bu etnik-siyasi qüvvəni beləcə adlandırırlar - ***ermənilik!***.

Beynəlxalq birlik bu qüvvəni siyasi amil kimi qəbul edərək, müxtəlif səbəblər üzündən, onu hər vasitə ilə dəstəkləyir. Bu termin rəsmi dövlət sərhədlərini belə tanımayan bir milli ideya – «Böyük Ermənistan» röyası ətrafında saysız-hesabsız tellərlə birləşən erməni icmalarının, erməni diasporunun təbiətini, xarakterini, ümumiyyətlə etnik-siyasi mahiyyətini çox dəqiq əks etdirən anlayışdır. Bu baxımdan, biz də "ermənilik" anlayışını çox nadir etnik-dini-siyasi fenomen mənasında istifadə edəcəyik.

Ermənilik milli ideyası dəfələrlə Azərbaycana təcavüz mənbəyi olub və potensial olaraq, gələcəkdə də Türkiyədən başlamış Qafqaza qədər daha geniş arealda yayılcaq bir təhlükə olaraq qalır. Odur ki, bu anlayışın öyrənilməsi həm də Qarabağ münaqişəsinin səbəblərinin çözülməsində prinsipial əhəmiyyət kəsb edir. O, münaqişənin gücünü daha dəqiq göstərməyə, gizli motivləri aşkarlamağa, müxtəlif beynəlxalq güclərin maraq və mənafelərini öyrənməyə yaxşı fürsət verir.

Azərbaycanın, ilk növbədə, Azərbaycan Xalq Cəbhəsinin (AXC) strateji səhvlərindən biri elə məhz onunla qarşıdurma vəziyyətində olan qüvvəni – erməniliyi lazımınca qiymətləndirməməsi olmuşdu. Xatırladım ki, Sov.İKP MK Siyasi Bürosunun üzvü, sovet partiya rəhbərləri arasında uzun müddət yüksək nüfuza malik olmuş Heydər Əliyev SSRİ Nazirlər Soveti sədrinin birinci müavini vəzifəsindən kənarlaşdırılandan sonra, Azərbaycanın mövqeyi, lobbiçilik baxımından xeyli zəifləmişdi. Daha əvvəl -1981-ci ildə isə SSRİ Qaz Sənayesi naziri S.Orucov vəfat etmişdi. Moskvada yeganə nüfuzlu sima Lenin mükafatı laureatı, yüksək instansiyalarla yaxşı əlaqələri olan, lakin siyasi cəhətdən passiv Fərman Salmanov idi. Məhz Moskvada mövqelərimizin zəifliyi səbəbindən Qarabağ münaqişəsinin şiddətli dövründə, Azərbaycan ziyalıları haqq səslərinin ümumittifaq kütləvi informasiya vasitələrində, Moskva ziyalıları arasında qəbul edilməsinə nail ola bilmədilər. İttifaq səviyyəsində dəstəklənməyən Azərbaycan SSR Ermənistan və Qarabağ separatçıları ilə qarşıdurmada yalnız öz məhdud resurslarına ümid bəsləyə bilərdi ki, bu imkanları da yalnız güclü siyasi rəhbərlik vasitəsiylə səfərbər etmək mümkün idi.

O vaxt ermənilərin SSRİ-dəki mövqelərini təsəvvür etmək üçün onların təkcə Azərbaycandakı vəziyyətlərinə baxmaq kifayətdir: 1990-cı ildə Azərbaycanda erməni millətinə mənsub 681 nəfər respublikanın ali və orta hakimiyyət eşelonlarında təmsil olunmuşdular. Həmin ermənilərin sırasında Azərbaycan KP MK aparatında, Nazirlər Sovetində yüksək vəzifə tutanlar, nazirlər və onların müavinləri, sahəvi dövlət komitələrinin sədrləri və sədr müavinləri, vilayət, şəhər və rayon partiya komitələrinin birinci katibləri və katibləri, vilayət, şəhər və rayon icraiyyə komitələrinin sədrləri və onların müavinləri, iri sənaye, tikinti, nəqliyyat, yüngül və yeyinti sənayesi müəssisələrinin direktorları, baş mühəndisləri, baş mütəxəssisləri olanlar var idi. Onların Azərbaycan Daxili İşlər Nazirliyinin, Dövlət Təhlükəsizliyi Komitəsinin və Baş Prokurorluğun mərkəzi aparatlarında idarə və şöbə rəisləri səviyyəsində, vilayət, şəhər, rayon idarələrinin struktur bölmələrində isə birinci və ikinci şəxslər səviyyəsində təmsilçilikləri var idi.

Bütün bunlar ola-ola, Qorbaçov hakimiyyəti illərində SSRİ-də ermənilərin mövqeyi təsəvvüredilməz dərəcədə yüksəldi. Şəxsi təcrübəmdən çıxış edərək, bir faktı nəzərinizə çatdırmaq istəyirəm ki, Stavropol diyarında hakim işlədiyim dövrdə məhkəmələrdə bir nəfər də olsun erməni hakim yox idi, lakin 1985-cı ildən sonra diyar üzrə erməni milliyyətindən olan hakim, prokuror, polis rəislərinin sayı geometrik surətlə artmağa başlamışdı. Yəni, Qorbaçovun hakimiyyəti dövründə ermənilərin vəzifə pillələrində daha sürətlə irəliləməsi açıq-aşkar görünürdü.

Uzun müddət SSRİ-də böyük nüfuza və güclü təsir dairəsinə malik məşhur ermənilərdən biri İsrailyan idi. O, vaxtilə SSRİ-nin fövqəladə və səlahiyyətli səfiri olmuşdu, SSRİ xarici işlər naziri A. A. Qromıkonun xüsusi etimadını qazanmışdı. İsrailyandan sonra SSRİ-nin həm xarici, həm də daxili siyasətinə təsir etmək gücü uzun müddət Şahnazarovun əlində olmuşdu. Nəinki SSRİ tarixində, hətta çar Rusiyasında da köməkçisinin hökmdara təsiri heç vaxt Şahnazarovun Qorbaçova təsiri qədər güclü olmamışdı. SSRİ-də, ilk növbədə Moskvada erməni diasporunun yuxarı təbəqəsi ilə əlaqələrin bütün telləri Şahnazarovda cəmləşir, düyünlənirdi.

Keçmiş bakılı, Azərbaycan Dövlət Universitetini və Sov.İKP MK yanında İctimai Elmlər Akademiyasını bitirmiş Georgi Xosroyeviç Şahnazarov bir müddət "Sülh və sosializm problemləri" ("Проблемы

мира и социализма”) jurnalında (Praqa) işlədikdən sonra 1964-cü ildə Sov.İKP MK-nın beynəlxalq şöbəsinə gəlib çıxmışdı. 1988-ci ildə o, Baş katibin köməkçisi olmağa razılıq vermişdir. Bu, bir qədər qəribə görünürdü, çünki həmin vəzifə nomenklatur əhəmiyyətinə və karyera imkanlarına görə, o dərəcədə də perspektivli sayılmırdı. Ancaq M. Qorbaçovun dövründə bu nomenklatur vahidin və ilk növbədə G. Şahnazarovun mövqeyində ciddi dəyişikliklər baş verdi. Az sonra Baş katib özünün o vaxta qədər heç nəyi ilə fərqlənməyən, lakin nüfuzlu köməkçisini SSRİ Prezidentinin müşaviri təyin etdi. Artıq 1990-cı ildən G. Şahnazarov SSRİ Xalq deputatı, sonra həm də Ali Sovetin Konstitusiya Qanunvericiliyi Alt Komitəsinin sədri, 1992-ci ildə isə Qorbaçov Fondunun Qlobal Problemlər Mərkəzinin direktoru oldu.

Mövzudan az da olsa kənara çıxaraq, bir məqamı diqqətinizə çatdırmaq istərdim. Azərbaycanda, o cümlədən Bakıda heç vaxt milli ayrıseçkilik olmayıb. Buna misal kimi, Azərbaycanda doğulan, sonradan dünya şöhrətli məşhurlara çevrilən müxtəli milli mənşəyə malik şəxsləri - məşhur fizik, akademik L.Landaunu, violonçelist-dirijor M. Rastropoviçi, milliyyətcə erməni olan SSRİ marşalları - İ. Baqramyan, A. Babacanyan, şahmat üzrə dünya çempionu Q.Qasparovu və digərlərinin adlarını çəkmək kifayətdir. Sonuncu haqqında qeyd edim ki, o, Bakı şahmat məktəbinin yetirməsi idi. A. Karpovla final yarışında bütün SSRİ KP MK-nin Siyasi Bürosunun üzvləri onu dəstəkləsələr də, Azərbaycan SSR rəhbərliyi məhz Qasparova bütün mənəvi və maddi köməkliyini əsirgəməmişdi. Bunun əvəzində, Qasparov hadisələr başlayanda barışdırıcı mövqedə yox, əksinə qızışdırıcı, təhrikçi rolunda çıxış etdi və Azərbaycan xalqının düşmənlərinin ön sıralarında yer aldı.

Məlumdur ki, M.Qorbaçov hələ tələbəlik dövründən G.Şahnazarovla dostluq etməyə başlamışdı. G.Şahnazarov özünün “Rəhbərlə və onlarsız” adlı memuarında bu barədə ətraflı söhbət açır. Ola bilsin ki, məhz bu dostluq səbəbindən, gələcək Baş katib erməni millətinin nümayəndələrinə daha da yaxınlaşaraq, onlara xüsusi münasibət bəsləmişdi. Maraqlıdır ki, hələ tələbəlik dövründən yaxın olan bu iki dost - Qorbaçov və Şahnazarov Sov.İKP MK-ya gəlib çıxandan sonra yaxınlıqlarını heç nə ilə büruzə vermirdilər. Hətta bəzən Qorbaçov öz köməkçisi ilə səmimi münasibətlərini maskalamağa çalışırdı - hərçənd

ki, bunu bacarmırdı. Qorbaçov tez-tez məmnun halda deyirdi: “Görürsünüz, bəxtimə necə jurnalist düşüb! (Şahnazarov nəzərdə tutulur –A.İ.). İşləməyə razılıq verəndə də şıltaqlıq etmədi. Sitaryanı köməkçim olmağa razı salmaq üçün dəfələrlə dilə tutmalı olmuşdum. Bu isə adi bir hal kimi, lakin ləyaqətlə dedi: «Sizinlə hara desəniz gedərəm». Hə, necədir?”.

Baş katibin öz köməkçisi barədə rəylərinə heyrətlənməmək mümkün deyil. Təkcə ona görə yox ki, o, partiya təşkilatının arayış və analitik qeydlərindən az fərqlənən darıxdırıcı işlərin müəllifinin qeyri-adi sürətlə irəliləməsini, bir növ, əsaslandırmaq arzusu ilə onu tərifləməkdən usanmırdı. Həm də görünür, **Qorbaçov Şahnazarovu tələbəlik illərindən tanıdığını gizlətmək üçün maskalanmaqda davam edir.** Doğrudan da, Şahnazarov əsl Qorbaçovun axtardığı adam idi, ancaq o, Sitaryandan da əl çəkmirdi. Belə ki, G.Şahnazarovun və onun adamlarının MK-da xüsusi mövqeyi barədə ilk mənbədən məlumatı olan A.Çernyayev öz xatirələrində göstərir: “M.S.Qorbaçov sərəncam verərək, özünün ştatdankənar müşavirlərini də təsdiqləmişdi. Bunlar L.İ.Abalkin, S.A.Sitaryan və V.P.Osipyan idi”.

Qorbaçov yüz milyonluq Rusiyada özünə layiq savadlı köməkçi tapa bilməmişdi. Çünki savadlı rus ziyalılarında haqq-ədalət və Vətənə məhəbbət hissi Qorbaçovdakından köklü şəkildə fərqlənirdi.

G.Şahnazarov Moskvada erməni diasporunun əsas dayaqlarından biri sayılırdı. O, hakimiyyətdəki ermənilərlə SSRİ-də mövcud olan erməni dairələrinin hamısının arasında rabitə, körpü qurmuşdu və bu, Qorbaçovun Baş katib vəzifəsinə ən münasib namizəd olması imicinin yaradılmasında çox güclü vasitə idi. Baş katib də bunu yaxşı anlayırdı. “Mişa-konvertik” ləqəbli Qorbaçov Moskvada öz yerini möhkəmlətməyə başlayanda, Şahnazarovun öz dostunun mənafeləri üçün lobbiçilik etməyə kifayət qədər adamları vardı. Ermənilərin Sov. İKP MK-nın demək olar ki, bütün şöbələrində adamları çalışırdı. Bunlar Sov. İKP MK-nın digər şöbə müdiri K.Brutens, qocaman aparat işçisi, rəhbər dairələrə yaxın olan L.Onikov və Sov. İKP MK-nın İdeoloji şöbəsinin sektor müdiri Karen Qaragözyan və başqaları idi. Heç də təsadüfi deyil ki, Şahnazarovun ölümündən sonra Qorbaçovun adını daşıyan Fondda onun köməkçisi məhz Karen Qaragözyan olmuşdur.

Şahnazarov bütövlükdə Qorbaçovlar ailəsinin sevimlisi idi. R. Qorbaçova özünün "Mən ümid edirəm" adlı kitabında G.Şahnazarovun ona 8 mart münasibətilə ünvanladığı həyəcan dolu məktubdan sitat gətirir: "Əziz Raisa Maksimovna! Əgər nigahlar həqiqətən səmada bağlansaydı, Allah Mixail Sergeyeviçin taleyinə yazılmış missiyaya uyğun olaraq, ona məhz Sizin kimi ömür-gün yoldaşı bəxş etməyə çalışardı… Səmimi hörmətlə, Sizin Şahnazarov".

R.Qorbaçovanın Baş katibə təsirindən çox danışılıb. Bu barədə ümumi mövzudan kənara çıxsam da, bir halı xatırlamaq istəyirəm. 1985-ci ildə milliyyətcə erməni olan Koşeleva və Pilipenko haqqında o dövr üçün törədilmə üslubuna və miqyasına görə çox nadir olan quldurluq işinə baxırdım. Bu cinayət işi Stavropol diyar məhkəməsinin qərardadı ilə təyin olunmuş cəzaların yüngüllüyünə görə ləğv olunub, yeni məhkəmə baxışına göndərilmişdi. Məhkəmə prosesi başlamazdan qabaq, bir dəfə məhkəmə sədrinin kabinetində gördüyüm, əvvəllər tanımadığım, Pyatiqorsk vəkillər kollegiyasının üzvü, milliyətcə erməni, Stavropol diyarında məşhur vəkil Robert Xaçaturov otağıma gəldi. Söhbət əsnasında təqsirləndirilənlərə kömək etmək lazım olduğunu bildirdi. Cavabında «yəqin, məni yaxşı tanımırsan və hansı prinsiplə işlədiyimi bilmirsən», - dedim. O isə mənim haqqımda kifayət qədər məlumatlı olduğunu və heç də mənə rüşvət təklif etmək istəmədiyini, ancaq bir təklifinin olduğunu söylədi. Dedi ki, ona kömək edəcəyim təqdirdə, R. Qorbaçovanın yaxın rəfiqəsi olan qohumu vasitəsi ilə məni onların ailəsinə daxil edə bilər. Qorbaçovlar haqqında Stavropol diyarında çoxları çox şey danışırdı, ancaq bu söhbət mənə o qədər uydurma və axmaq gəldi ki, dərhal onu otaqdan qovdum. Bir azdan məhkəmə sədri otağıma gəlib və nahaq yerə elə bir geniş əlaqəsi olan şəxslə münasibət qurmadığımdan təəssüfləndiyini söylədi.

Məhkəmədə hamilə olması səbəbindən Koşelevaya azadlıqdan məhrum etmə yox, qanunun tələblərinə uyğun olaraq, şərti cəza təyin edildi. Sonralar həmin R. Xaçaturovla əlaqəli olan şəxslərin əksəriyyətinin vəzifə pillələrində ildırım sürətilə irəliləməsini, onun özünün biznesinin çiçəklənməsini gördükdəsə, heç də həmin danışığın axmaq, uydurma olmadığına bir daha əmin oldum.

Şahnazarovun Qorbaçova təsir imkanları haqda A.Çernyayev də "Azadlıq" radiosu ilə çıxışında demişdi: "Qorbaçov təkcə beynəlxalq

məsələlər barəsində deyil, ən incə mətləblər – kadr problemləri və digər məsələlər barəsində də onunla məsləhətləşirdi. Ən mühüm məsələlərin məhdud dairədə həll edildiyi müşavirələrin heç biri Şahnazarovsuz keçmirdi". Bir sözlə, Şahnazarovun Qorbaçova təsiri hədsiz dərəcədə güclü idi.

Şahnazarovun Azərbaycana münasibətinə gəlincə, hadisələrin şahidləri deyir ki, G.Şahnazarov, Qarabağ məsələsində güzəştə getmədiyinə, Azərbaycan SSR KP MK-da DQMV-nin qanunsuz sessiyanı sərt tənqid etdiyinə görə, Moskvada SSRİ Xalq deputatları qurultayı zamanı Vəzirovun pencəyinin qolundan tutaraq qışqırırmış: "Tarix bunu Sizə bağışlamayacaq. Bu gün siz bütöv bir xalqı əzdiniz!".

Azərbaycan KP MK-nın birinci katibi A. Mütəllibovun Sov. İKP MK-nın Baş katibi M. Qorbaçova məxfi məktubundan götürülmüş "separatçı münaqişələrin həllində dünya təcrübəsi inandırıcı şəkildə göstərir ki, bu münaqişələr demokratiya zəminində həll edilmir" sətirləri məhz Şahnazarovun sayəsində geniş ictimaiyyətə məlum olur və Azərbaycana neqativ münasibət kəskinləşir.

Şahnazarovun Azərbaycana münasibətdə bu cür hərəkətlərinin sayı-hesabı yoxdur. Onun dünyagörüşüncə, demokratiya, insan haqları ancaq erməni millətçilərinin istəyinə uyğun olmalı idi.

Əslində, burada təəccüblü bir şey də yox idi. Şahnazarov hərəkətlərində tam sərbəst idi və Baş katibin sağ qolu olaraq, SSRİ-nin ali rəhbərliyinə təsir göstərmək üçün lobbi qrupu da yaratmışdı. Onun elə güclü komandası vardı ki, hətta Ukrayna kimi respublika da beləsinə sahib deyildi. Fikir verin: Şahnazarov – Baş katib M.Qorbaçovun köməkçilərindən biri; Brutens – beynəlxalq şöbənin müdir müavini; Mçedlov – Sov.İKP MK yanında Marksizm-leninizm İnstitutunun direktor müavini; Qaragözyan K.K. – Sov.İKP MK ideoloji şöbəsinin sektor müdiri; Onikov L.A. – Sov.İKP MK ideoloji şöbəsinin məsul təşkilatçısı.

İyerarxik quruluşlu bu sistemin tərkib hissəsinə bir qədər aşağı pillədə bu şəxslər daxil idi: Arzumanyan Q.Q. – SSRİ EA Rəyasət Heyətinin İctimai Elmlər Seksiyasının sektor müdiri; Kuzacyan L.S. – İctimai Elmlər Üzrə Elmi İnformasiya İnstitutunun direktor müavini; Momcyan X.N. – Sovet Sosiologiya Assosiasiyasının prezidenti; Petrosyan Y.A. – SSRİ EA Şərqşünaslıq İnstitutunun Leninqrad bölməsinin

müdiri, bölmənin müdafiə üzrə elmi şurasının sədri.

Şahnazarovun SSRİ EA-da da akademiklərdən və müxbir üzvlərdən ibarət, SSRİ-də çox geniş birbaşa və əks əlaqələrə malik olan, yaxşı tənzimlənmiş komandası vardı. Bu komandaya SSRİ EA-nın akademikləri Ambarsumyan, Osipyan, Dəmirçiyan, Baqdasaryan, Yenikolopov, Knunyants, Çaylaxyan, Sandaxçiyev, Taxtacyan, Aqanbekyan, Xaçaturov; SSRİ EA-nın müxbir üzvləri Mergelyan, Mikaelyan, Babayev, Sarkisov, Ağacanov, Babayan, Mirzəbəyov, Gödəkyan, Sarkisyan, Fanarçyan, Çoylaxyan, Sitaryan və başqaları daxil idilər. Bu qrupun işini asanlaşdıran isə o idi ki, ermənilərlə müxtəlif tellərlə bağlı olan Y. Primakov da G. Şahnazarovla bilavasitə əlaqəli şəkildə fəaliyyət göstərirdi.

Lenin və Stalin dövründən başlayaraq ölkənin siyasətinə güclü təsir göstərən yüksək vəzifəli ermənilərin sayı heç vaxt Qorbaçovun vaxtındakı qədər çox olmamışdı. Həmin illərdə "Staraya ploşşad"da işləyənlərin hamısı təsdiqləyir ki, Şahnazarov Qorbaçovun əhatəsində xüsusi statusa malik idi, Baş katibə, onun həyata keçirdiyi siyasətin formalaşmasına və icrasına daim təsir göstərir, bu təsir isə günbəgün artırdı.

A. S. Çernyayevin "SSRİ prezidentinin köməkçisinin gündəliyi" adlı kitabının "Yenidənqurma xarabalıqlarında" adlı birinci fəslində 9 oktyabr 1988-ci il tarixli bir qeyd var: "Cümə günü Qorbaçov Şahnazarovla məni yanına çağırmışdı. Şahnazarovun 64 illiyi münasibətilə onu öpdü. BMT-yə, Kubaya və Londona qarşıdakı səfərlər barədə danışdıq. Sözarası Kvitsinskini Dobrıninin əvəzinə MK-nın beynəlxalq əlaqələr şöbəsinin müdiri təyin edilməsinə razılıq aldıq. Birdən o, Qarabağ barəsində söhbət açdı. Biz əyləşmişdik. O, ayağa qalxıb bizimlə üzbəüz dayanaraq, danışmağa başladı: "Mən istəyirəm ki, hər işi adam kimi görək, məsələ qan tökülməsi dərəcəsinə çatmasın, bir-birimizlə danışmağa başlayaq… Korrupsiyaya qurşanmış adamlar var. Dəmirçyan (Ermənistan KP MK-nın birinci katibi –A.İ.) öz adamlarını başına toplayır, Bakıda öz adamlarını səfərbər edirlər, erməni ziyalıları isə, sanki, müflisləşiblər: axı onlar məsələnin həllinə gətirib çıxara biləcək heç bir təklif irəli sürə bilmirlər. Lakin mən özüm də bunun həllini bilmirəm. Əgər bilsəydim, mən heç bir göstərişlə, yaranmış vəziyyətlə hesablaşmadan öz bildiyimi edərdim, lakin mən bunları bilmirəm!".

Sonra o, Əliyevin işlərindən danışmağa başladı. Dedi ki, biz onun ayağının altını çox qazırıq, amma onun işləri, sanki, Rəşidovun işindən də təmizdir”.

Professor Çapay Sultanovun təbirincə desək, Azərbaycanın bu üç məlum düşməninin söhbətində çox böyük informasiya var. Fövqəldövlətdə bütün hakimiyyəti ələ keçirmiş, qərar qəbul etmək üçün bütün dünyadan informasiya alan bir adam öz dövlətində yaranmış problemi necə həll edəcəyini bilmir. Yalnız siyasətdən tamam bixəbər adamlar Şahnazarovun bu söhbəti öz kanalları vasitəsilə dərhal erməni tərəfinə çatdırmasına şübhə edə bilərlər. Qorbaçov, guya, problemin həlli yolunu bilmir. Onun öz maraqlarına uyğun gəlməyən halları pərdələmək bacarığı barədə əvvəllər məlumat vermişdim. Bəzən mətbuatda onun, həqiqətən, «bacarıqsız», «avam» olması barədə fikirlər yer alır. Bu, əsla belə deyil. 1985–ci ildə Qorbaçov SSRİ KP Baş katibi seçiləndən bir neçə gün sonra məhkəmənin sədri A. Kuzminovla onun otağında oturub hansısa işi müzakirə edirdik. Bu zaman qəflətən otağa Stavropol diyar məhkəməsinin sədri A.Maslennikov girdi. Mən qalxıb otaqdan çıxmaq istəyəndə, o, qalmağımı istədi. Söhbət zamanı bəlli oldu ki, Kislovodskda dostları ilə birlikdə Qorbaçovun Baş katib seçilməsini qeyd edib Stavropola qayıdarkən, yolüstü bizə baş çəkmək qərarına gəlib. Kefi kök olduğundan, çox sərbəst danışırdı. O söhbətdən ən çox yadımda qalan onun Qorbaçov haqqında bir neçə dəfə işlətdiyi «dahi», «çox uzaqgörən», «sirr saxlamağı bacaran şəxs» ifadələri idi. Bu söhbətə qədər də mən Qorbaçov haqda çox eşitmişdim, ancaq birinci dəfəydi bilirdim ki, 1978-ci ilin yanvarında, hələ Stavropol diyar PK-nin birinci katibi olan Qorbaçova SSRİ Baş prokuroru vəzifəsi təklif olunubmuş. Onun, SSRİ-nin bir əyalət başçısının, SSRİ Baş Prokuroru vəzifəsindən imtina etməsi dostlarında, o cümlədən A. Maslennikovda təəccüb yaratmışdı. Onlar Qorbaçovdan səbəbini soruşanda, o, ixtisasca hüquqşünas olsa da, bu sahədə təcrübəsinin olmamasını əsas gətirmişdi. Həmsöhbətimiz Qorbaçovu məhz hiyləgərliyinə, onun sözləriylə desəm “qoltuğunun altında daşıdığını” gizlətmək məharətinə görə dahi adlandırırdı. Həqiqətən, o dövr SSRİ Baş prokuroru 1953-cü ildən bu vəzifədə çalışan, hələ 1945-ci ildə «Nürnberq prosesi»ndə SSRİ adından dövlət ittihamını müdafiə edən 71 yaşlı, artıq xəstə olan R.A.Rudenko idi. Az

sonra o vəfat etdi və bu vəzifəyə son illər faktiki bu işi aparan A.Rekunkov təyin edildi.

Əvvəllər Qorbaçovun tez-tez korrupsiyadan danışdığını göstərmişdim. İndi görün, kim korrupsiyadan danışır? Rüşvəti zərflərdə aldığına görə, hələ Stavropolda o, “Mişa-konvertik” ləqəbi qazanmışdı. Qorbaçovun əliəyri və tamahkar şəxs olmasını onun SSRİ vaxtında «kölgə iqtisadiyyatı»nın mafioz nümayəndələri ilə, xalq arasında “sexovik” adlandırılan adamlarla sıx əlaqələr qurmasından da anlamaq olar. Onun bu əlaqələrindən bir çox mənbələr xəbər verir. Hətta Qorbaçovun yaxın dostu və silahdaşı olmuş E. Şevardnadze də öz xatirələrində Gürcüstandan cinayət məsuliyyətindən yaxa qurtarmaq üçün Stavropola qaçmış cinayətkarların həbs olunmasına maneçilik törətdiyinə görə, Qorbaçovla aralarında münaqişənin olmasından, yalnız ümumi «patronları» Andropovun işə qarışmasından sonra münasibətlərinin normallaşmasından yazıb.

Eyni hadisə Azərbaycanla bağlı da baş verib. Belə ki, Bakıda «kölgə iqtisadiyyatı»na qarşı məşhur “Promqalantereya” adlı cinayət işi qaldırıldıqdan sonra cinayətkarların əksəriyyəti Stavropol diyarına qaçıblarmış. O dövrdə yaşayanlar bilir ki, SSRİ-də «kölgə iqtisadiyyatı» bütövlükdə erməni millətindən olanların inhisarında idi. Azərbaycandan qaçan «kölgə iqtisadiyyatı»nın nümayəndələri də konvert hesabına Qorbaçovun himayəsinə sığınmışdırlar.

Stavropolda, əsasən “Qafqaz mineral suları” deyilən regionda yaşayan “sexoviklərin” məhz Qorbaçov tərəfindən himayə olunması da o dövrdə heç kim üçün sirr deyildi.

**1999-cu ilin aprel ayının əvvəllərində saat 12.00-da “Azadlıq radiosu”nun Vaşinqton ofisində mətbuat konfransı keçirirdim. Həmin günü saat 10.00-da Polşa Prezidenti Aleksandr Kvasnevski mətbuat konfransı keçirdiyindən zal dolu idi. Mətbuat konfransından sonra qeyri rəsmi mənə çoxlu sual verildi. Bir nəfər isə Stavropolda işlədiyimi bildiyindən Qorbaçovun sırf şəxsi keyfiyyətləri ilə bağlı suallar verirdi. Suallar isə ancaq onun natəmiz olduğunu aydınlaşdırmaq məqsədi güdürdü. Məsələn: “Qorbaçovun kölgə iqtisadiyyatının nümayəndələri ilə münasibəti necə idi?”. Göründüyü kimi uzaq ABŞ-da belə onun əməllərindən xəbərdar idilər.**

Fikrimcə, insanların, ələlxüsus, dövlətlərə başçılıq edənlərin dəyəri daha çox onların Vətəninə, ailəsinə, ziyalılara və onlara yaxşılıq

etmiş şəxslərə olan münasibəti ilə ölçülməlidir. Göstərdiklərimin hamısında Qorbaçov «şikəst adam» təsiri bağışlayır. Qorbaçovun Vətəni olan SSRİ yer üzündən silindi. Həyatında ən böyük nemət saydığı həyat yoldaşı R.Qorbaçova can verən zaman, kədərdən boğulmalı olan Qorbaçov, xislətinə uyğun olaraq, bütün dünya telekanallarına müsahibə verərək, bu hadisəni də şouya çevirməyi bacardı. Onun dövründə SSRİ ziyalıları dilənçi kökünə salındı, əvəzində isə dələduzlar az müddətdə milyonerlərə çevrildilər. Onu həyatı boyu qoruyan, Brejnev durğunluğundan qurtarmağa hamıdan çox can atan, Siyasi Büro üzvləri arasında ən təmizi sayılan Andropov rəhmətə getdikdən sonra, onun vətənində - mənim o dövr hakim işlədiyim Andropov rayonunun Naqutskiy stansiyasında Andropovun abidə açılışına belə, gəlmədi.

İndi isə Qorbaçovun ermənilərlə yaxınlığının bəzi köklərini, çox səthi də olsa, araşdıraq. Haradan qaynaqlanırdı onda bu erməni “sevdası”?!

Bunun üçün ilk növbədə Qorbaçovun hakimiyyətə gəldiyi şəraiti, səbəbləri, şərtlərin bəzi məqamlarını nəzərdən keçirmək lazımdır.

Vaxtilə Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsində İdeoloji şöbənin müdiri vəzifəsində işləmiş R.Ağayev 1980-ci ildə Sov. İKP MK yanında İctimai Elmlər Akademiyasının müdavimlərinin o vaxt Sov. İKP MK katibi olan M.S.Qorbaçovla görüşdən sonra onların necə məyus olduğunu xatırlayır: “Akademiyada Sov.İKP MK Siyasi Bürosunun üzvləri və MK katibləri ilə müntəzəm görüşlər keçirilirdi. Bu görüşlər daha mötəbər, çox vaxt eksklüziv xarakterli informasiya əldə etmək üsulu sayılırdı. M.S.Qorbaçovun İctimai Elmlər Akademiyasına gəlişi ərəfəsində belə bir şayiə yayılmışdı ki, guya, Kulakovun varisi Andropovun adamıdır, Andropovun isə adamlardan, kadrlardan yaxşı başı çıxır. O, rəhbər vəzifələrə gənc, perspektivli xadimləri cəlb edir. Kənd təsərrüfatı üzrə yeni katib o vaxta qədər bizə, bir növ, pıçıltı ilə verilmiş informasiyadan yalnız onu təsdiqlədi ki, Siyasi Büro üzrə həmkarlarından onu fərqləndirən əsas cəhət yaşının az olmasıdır. Onun çıxışının mövzusu maraqlı idi – SSRİ dərin sistem böhranı mərhələsinə daxil olmaqdadır. Təbii ki, həmin vəziyyətdə onun məruzəsinə, bir növ, inqilabi yanaşma gözləmək sadəlövhlük olardı, amma açığını deyim ki, Andropovun adamından çox şey gözləyirdik. Onun çıxışında heç bir maraqlı fikir, heç bir təzə baxış hiss olunmadı. Bu çıxışda nə analitik

mühakimə cəhdi, nə də stilistik yenilik var idi. Bir sözlə, heç nə! Məyus olmuş müdavimlər gələcək Baş katibdən Siyasi Büronun tərkibində onun işinin hansı sahəyə aid olduğunu soruşdular. Qorbaçov özünün gündəlik fəaliyyətinin məzmununu açıqlamaq istəmədən, belə cavab verdi: "Mənə kənd təsərrüfatı məsələləri və bəzi beynəlxalq problemlər tapşırılmışdı". Müdavimlərdən birisi kədərli halda zarafat etdi: «Bu adam Brejnevin yaşına çatanda onun nəyə nail olduğunu görmək çox maraqlı olardı»".

Müqayisə qismən yararlıdır. Brejnev öz şəxsiyyətini, Qorbaçov qədər bilə-bilə heç vaxt alçaltmazdı. Qorbaçovun bütün növ, hətta çoxlarının şəxsiyyətinə sığışdırıb etməkdən çəkindiyi reklam işlrəriylə məşğul olması heç kimə sirr deyil. Ancaq Ç.Sultanovun "Сквозь призму шахмат" kitabındakı araşdırmasından görünür ki, Qorbaçovun reklam gəlirləri tanınmış tennisçi Şarapovadan onlarla dəfə az, Ksyuşa (Kseniya - A.İ.) Sobçak səviyyəsində olub.

Qorbaçov Baş katib olmaq üçün o qədər də mükəmməl bir namizəd deyildi. Lakin "mükəmməl namizəd deyildi" deyərkən, bu fikrin aid olduğu subyektləri də dəqiqləşdirmək lazımdır. Qorbaçov kimlər üçün «mükəmməl idi» və kimlər üçün «mükəmməl deyildi». Tarix də göstərdi ki, o, SSRİ xalqlarının hər hansı biri üçün nəinki mükəmməl lider, heç ona yaxın düşəcək adi bir başçı da olmadı. Tarix onu göstərdi ki, Qorbaçov erməni millətçiləri üçün sadəcə mükəmməl bir "kukla" idi.

Bu fikri genişləndirərək, Qorbaçovun hakimiyyətə gəlməsi məsələsinə daha geniş prizmadan yanaşmağı vacib hesab edirəm.

Əvvəldə adını çəkdiyim, vaxtilə SSRİ-nin fövqəladə və səlahiyyətli səfiri olmuş, SSRİ xarici işlər naziri A.A.Qromıkonun xüsusi etimadını qazanmış V.L.İsraelyan 90-cı illərdən sonra ABŞ-a immiqrasiya edir. ABŞ-a sağ-salamat gedib çıxandan sonra İsraelyan deyir: "M.S.Qorbaçov ilə C.Buş arasında rəsmi görüşlər barədə hamı bilir. Lakin onların ilk görüşünün hələ 1984-cü ilin baharına təyin edilməsini az adam bilir... O vaxt mən tərksilah məsələlərinə dair Cenevrə konfransında Sovet İttifaqının nümayəndəsi idim. Konfrans üzrə mənim amerikalı həmkarım səfir Lyuis Filds vitse-prezident Buşun yaxın adamı kimi tanınmışdı. Yeri gələndə, o özü də bu məqamı vurğulayırdı. 1984-cü ilin martında Filds məsləhətləşmək üçün Vaşinq-

tona getmişdi. Oradan qayıdandan sonra görüşməyimizi xahiş etdi. Mən onu bizim nümayəndə heyətinin iqamətgahına dəvət etdim, o isə "neytral yerdə", şəhərətrafı restoranların birində görüşməyimizi təklif etdi. Nahar vaxtı amerikalı müsahibim mənə elə bir xüsusi əhəmiyyətə malik məlumat vermədi. Bircə onu dedi ki, aprel ayında vitse-prezident Buş Cenevrəyə gələcək, Amerika layihəsini şəxsən özü təqdim edəcək. Filds bu layihənin məzmunu barədə artıq mətbuatda məlum olan ən ümumi sözləri dedi. Onda mən heyrətləndim: görəsən, bizim bu təkbətək görüşümüz amerikalıya niyə lazım imiş? Mən Fildslə sağollaşmağa hazırlaşanda o, nahardan sonra bir qədər gəzişməyimizi təklif etdi. Filds sözə başladı: «Vaşinqtonda Kreml rəhbərliyi ilə ciddi işgüzar əlaqə yaratmaq istəyirlər. Vitse-prezident Buş da Cenevrəyə səfəri zamanı yeni Sovet liderlərindən biri ilə görüşməyə hazırdır. Bu görüş tam məxfi xarakter daşımalıdır». Mən Fildsdən soruşdum ki, amerikalılar Sovet xadimlərindən konkret kimisə nəzərdə tuturmu? Filds birmənalı şəkildə cavab verdi ki, o, Sovet İttifaqının ən çox ehtimal edilən gələcək lideri kimi M.S.Qorbaçovla görüşmək istərdi".

Qorbaçovun hakimiyyətə niyə gətirildiyini, hansı funksiyanı yerinə yetirdiyini və ümumiyyətlə, ermənilərin və Qərbin əlində necə bir "kukla" olduğunu aydın görmək üçün nəzərinizə başqa bir faktı da çatdırmaq istəyirəm.

Qorbaçov-Buş "cütlüyünün" ən sirli danışıqlarından biri Malta adasında baş tutmuşdu. Məlumdur ki, hələ qədimdən məşhur "Malta ordeni" Ümumdünya Mason Mərkəzlərindən biri kimi fəaliyyət göstərib. Görüşlər gəmilərdə, necə deyərlər, dəniz dalğalarının səsi altında keçirdi. Buşla Qorbaçovun görüşü də bu qəbildən idi. Lakin bu görüş Buşla Qorbaçov arasında baş tutan "konfedensial danışıq" statusundan çıxmışdı. Çünki Qorbaçov nümayəndəliyinin tərkibində ermənilərin Şahnazarov- Aqanbekyan-Sitaryandan ibarət bir "mini-nümayəndəliyi" də vardı. Bu danışıqlarda söhbətin nədən getdiyini bilmədiyimizdən, qəti bir söz demək çətindir, lakin xronoloji analiz bütün daşları yerinə otuzdurur - məhz Maltadan sonra Qorbaçovun Azərbaycana münasibəti sərtləşdi və "mini-nümayəndəliyin" ora niyə getdiyinin səbəbləri də aydınlaşır. Bu görüşdən dərhal sonra Aqanbekyanın Parisdəki çıxışı da təəccüblü görünmür.

Söhbət açılan mövzunun həddindən artıq genişliyinin, çoxlu vaxt

tələb etdiyinin və bu barədə bilgilərimin çox səthi olduğunun fərqindəyəm. Ancaq bu gün Qarabağla bağlı gedən proseslərdə məhz bu məqamların xüsusi araşdırılmasına ehtiyac olduğundan, həvəskar səviyyəsində də olsa, fikrimlə sizləri tanış etməyi vacib saydım. Hesab edirəm ki, bu istiqamətdəki gələcək araşdırmalar dünyanın superdövləti olan ABŞ-a "meydan oxumaq" yox, Azərbaycanın mənafeyinə qulluq etməsi məqsədiylə aparılmalıdı.

İndi isə xronloji ardıcıllığı pozmadan, Qorbaçovunn hakimiyyətdən necə getməsi tarixçəsinə nəzər salaq.

1991-ci ilin 25 dekabrında saat 19-da Qorbaçov televiziya tamaşaçılarının gözü qarşısında Ali Baş Komandan səlahiyyətlərini yerə qoyması haqqında UP-3162 №-li Fərman imzaladı. Bu, "Dünya şahmat taxtasında" Qorbaçovun son siyasi gedişi idi.

Məlum olduğu kimi, bu və ya digər ölkənin qələbəsi barədə xəbərləri həmin ölkənin müvafiq təşkilatları verir. «Soyuq müharibə»də ABŞ-ın SSRİ üzərində qələbəsi haqqında xəbəri ABŞ-a çatdıran isə məğlub ölkənin rəhbəri Qorbaçov oldu!

Brent Skaukroft yazır: "Deyəsən, Qorbaçovun Milad Bayramı münasibətilə Corc və Barbaraya zəng vurub onları təbrik etməsi ABŞ Prezidentinin ən çox yadında qalan hadisə olmuşdur. Bu zəng ondan xəbər verirdi ki, SSRİ Prezidentinin masası üstündə onun özünün istefa verməsi haqqında fərman var və keçmiş SSRİ-də heç bir kataklizm olmadan, Qorbaçov hakimiyyəti və "nüvə çemodanını" ləyaqətlə təhvil verir və Buş (onunla bərabər Amerika da) Milad Bayramını rahatca qeyd edə bilər."

Təəssüf ki, fransızlar demişkən, «bütün təzə şeylər əslində yalnız yaxşıca unudulmuş köhnələrdir». İndi də Vaşinqtonda erməni millətçilərinin «soyqırım» barədə hay-həşirinə diqqətlə yanaşır, Moskvada isə ən yüksək səviyyədə onları özlərinin «ən sədaqətli müttəfiqi» adlandırırlar. Özü də bütün bunlar "Soyuq müharibə"nin növbəti fazasında, Rusiyanın dağıdılması ideyasının real olduğu bir vaxtda baş verir.

Ermənilik ideyası əvvəllər də dəfələrlə Türkiyədə və Azərbaycanda ekspansiya mənbəyi olub. Bu gün Gürcüstanı parçalamaq planlarında həmin ideyadan istifadə edilir və şübhə etməyə bilərsiniz ki, yaxın gələcəkdə böyük dövlətlərin Yaxın Şərq geosiyasi layihəsinin

həyata keçirilməsində, həmçinin «Böyük Qafqaz» yaradılması planlarında, Rusiyanın dərinliklərinə doğru irəlilədikcə ermənilik ideyası haqqında bir daha eşidəcəyik.

Mənim üçün Qorbaçovun hakimiyyətə gəlmə və hakimiyyətdən getmə səbəbləri, təxminən, bu cürdür: onu hakimiyyətə ABŞ ata Buş vasitəsi ilə gətirdi – çoxdan arzuladıqları SSRİ-ni dağıtmaq üçün, Buşa isə erməni lobbisi yardım etdi – Qarabağ problemini birdəfəlik həll etmək üçün! Buş istədiyini aldıqdan sonra isə Qorbaçov istefaya getdi. Erməni lobbisi isə növbəti dəfə erməni xalqını qonşuları ilə düşmən edib çıxılmaz vəziyyətə saldılar!

Qorabçov keçmiş Sovet İttifaqında olan əksər xalqlara zərər verdi, ancaq düşünürəm ki, ən çox əziyyət çəkən azərbaycanlılar oldu: erməni ekstremistlərinin Xocalıda törətdikləri Azərbaycan xalqının soyqırımı; 20 yanvar 1990-cı ildə Sovet Ordusunun dinc əhalini tanklar altında əzməsi və güllələməsi faciəsi; Ermənistanın Azərbaycan torpaqlarının 20%-ni işğal etməsi və bir milyon insanın öz ölkəsində qaçqına çevrilməsi - bütövlükdə Qorbaçov yenidənqurmasının nəticələri idi! Çox güman ki, Sovet respublikaları arasında ən çox əziyyət çəkən ona görə məhz Azərbaycan oldu ki, o, SSRİ-nin ən "düzgün və nəzakətli, sözəbaxan" respublikalarından idi - həmişə aldığından çox vermiş və SSRİ xalqlarının hamısı ilə səmimi dost olmuşdur.

Bir daha təkrar edirəm ki, bütün bu proseslər boyu ABŞ-dakı, Moskvadakı nüfuzlu lobbi qurumları, istər Yerevandakı və Dağlıq Qarabağdakı gizli və leqal erməni siyasi təşkilatları heç vaxt bir-birindən təcrid olunmuş, müstəqil şəkildə fəaliyyət göstərməmişlər. Onlar fəaliyyət göstərdikləri ölkələrin hamısında, ilk növbədə də mərkəz ABŞ olmaqla, bütün dövlətlərdə əlaqəli, rabitəli və sistemli işləyiblər, həmişə arxalarında güclü himayə və dəstək olub. Bu proses bu gün də davam edir!

Hesab edirəm ki, SSRİ-nin dağılmasında və Qarabağ proseslərində erməniliyn rolu barədə söylədiklərim cüzi bir hissə – dəryada damladır və daha peşəkar təhlilə ehtiyac duyur. Ona görə də bu məsələyə yekun vuraraq, sonda bir daha o fikrə qayıdıram ki, SSRİ-nin süqutu prosesi məhz Sumqayıtdan başladı.

# MÜNDƏRİCAT

